B İ U

ZAQATALA ŞÖBƏSİ NƏŞRİ №: 01

# TƏFSİR ÜSULU və TARİXİ

DR. MEHMAN İSMAYILOV



**AZƏRBAYCAN RESPUBLİKASI**

**BAKI İSLAM UNİVERSİTETİ**

**Kitabın adı:**

**« TƏFSİR ÜSULU VƏ TARİXİ »**

**Müəllif:**

***Dr. Mehman İsmayılov***

**Dizayn:**

***Əflatun Məmmədov***

**ISBN:**

***978-9952-8102-7-1***

Bu Kitab Bakı İslam Universiteti Zaqatala korpusunda hazırlanmış və elmi şuranın 10 fevral 2011-ci il tarixli iclasının 3 saylı qərarına əsasən nəşr edilmişdir.

**Dərs kitabları №: 1**

Ünvan: **AZ6200, Zaqatala Şəhəri,**
**Heydər Əliyev prospekti №: 88**

Tel: **(+994 174) 5 32 46**

Faks: **(+994 174) 5 21 83**

e-mail: **zakatalailahiyat@gmail.com**

## ÖN SÖZ

İlahi kitabların sonuncusu olan və bütün əsrlərə xitab edən Qurani-kərim bəşəriyyəti aydınlatmaq üçün göndərilən nurdur. Bu misilsiz kitab insanların inadını qırmaq, əvvəlcədən formalaşan baxışlarını dəyişmək, onlara "görünənin arxasındakını göstərmək" üçün ən mənalı, ən gözəl ecazkarlıq nümunələri ortaya qoyur.

Nüzulundan bəri Quran bir çox elmlərin ilham qaynağı olmuşdur. Onun sayəsində böyük İslam mədəniyyəti ortaya çıxmışdır. VII əsrdən bəri onu anlamaq və anlatmaq üçün milyonlarla, hətta milyardlarla əsər yazılmıdır. Hər kəs bu böyük dəryadan öz gücü nisbətində bir damla almağa çalışmışdır. Lakin heç kəsə bu dəryanın dibinə çatmaq nəsib olmamışdır.

Bu kitab da, Azərbaycan oxuyucusuna, xüsusilədə da ilahiyyat elmləri ilə məşğul olanlara Quran dəryasından bir damla almağa yardım etməyi qarşısında məqsəd qoymuşdur.

Kitab giriş və üç fəsildən ibarətdir. Giriş qismində Quranın tarix səhnəsinə çıxışı, Quran nüzul olmadan əvvəlki Ərəbistan yarımadası və Məkkədəki dini, siyasi, iqtisadi və sosial vəziyyət barədə məlumat verilmişdir. Burada eyni zamanda təfsir, təfsir üsulu terminləri və təfsirə mənaca yaxın olan digər kəlmələr ələ alınmışdır.

"Quran və Vəhy" adlanan birinci fəsildə, vəhy və vəhyin mahiyyəti, Qurani-kərim leksik və terminoloji mənası, Quranın fəsilləri, Quranın əsas mövzularından bəhs olunur. Quranın kitab-

laşması, qiraət və yeddi hərf məsələləri, Quranın tərcüməsi mövzuları da bu fəsildə incələnmişdir.

“Quran Elmləri” adlanan ikinci fəsildə isə əsbabün-nüzul, nəsx, mütəşabeh ayələr,hürufu-müqəttəə, qəribul-Quran, Qurandakı müşkil, mücməl və mübhəm ayələr, Quran qissələri, əqsamul-Quran, əmsalul-Quran və s. kimi Quran elmlərindən söhbət açılmışdır.

“Təfsir Tarixi” adlanan üçüncü fəsildə isə təfsirin meydana çıxması və tədvinindən, Rəsulullahın, səhabilərin və tabeunun təfsir metodlarıdan, təfsirin mənbələri və növlərindən, müxtəlif təfsir cərəyanlarından bəhs olunmuş, eyni zamanda Quranın anlaşılması və təfsiri üçün zəruri olan mühüm məsələlərə toxunulmuşdur.

Bu kitab hazırlanarkən aşağıdakı kitablardan istifadə edilmişdir:

Professor Muhsin Demirci: **“Tefsir usulü ve tarihi”**,

Professor İsmail Cerrahoğlu: **“Tefsir usulü”** və **“Tefsir tarihi”**,

Professor Allahşükür Paşazadə: **“Quranın təfsiri və tərc. tarixi”**,

Professor Halis Albayrak: **“Tefsir Usulü”**,

Professor Mehmet Paçacı: **“Kurana Giriş”.**

Bu kitablardan əlavə i.e.n. Mehman İsmayılovun **“XX Yüzyılda Azerbaycanda yapılan Kuran ve tefsir çalışmaları”** adlı magistratura işindən də istifadə edilmişdir.

**Mehman İsmayılov**
İlahiyyat elmləri üzrə fəlsəfə doktoru
Zaqatala-2011

# I. QURANIN TARİX SƏHNƏSİNƏ ÇIXIŞI

Qurani-kərim ilk dəfə 610-cu ildə, Ramazan ayının iyirmi yeddinci gecəsində, Ərəbistan yarımadasında yerləşən Məkkə şəhərində vəhy edilməyə başlandı.[1] Məkkədə yaşayan və Allah tərəfindən peyğəmbər seçilən Hz. Mühəmməd, ilk vəhyi qırx yaşında, Məkkə yaxınlığındakı Hira mağarasında olarkən aldı. O, qırx yaşına yaxınlaşdıqda özündə heç vaxt hiss etmədiyi dəyişikliklər hiss etməyə başladı. Gecələr gördüyü röyalar gündüzlər həqiqətə çevrilirdi. Hz. Mühəmmədin bu vaxtlar yalnız qalmaqdan və təfəkkürə dalmaqdan xoşu gəlməyə başladı. Hira mağarasına gedir, yemək və suyu bitənə qədər orada qalırdı. Əvvəllər hiss etmədiyi bu duyğuları anlamağa çalışır və Allaha ibadət edirdi. Vəhy gəlmədən əvvəlki bu dövr təxminən dörd-beş il çəkdi. Hz. Peyğəmbər, bu illər ərzində iyirmi ildən çox çəkəcək uzun bir vəhy həyatına hazırlanırdı.

## A. Quran nazil olmadan əvvəl Ərəbistan yarımadası

Ərəblər tarixən Ərəbistan yarımadasında yaşayan xalqdır. Bu yarımada çox strateji bir yerdə yerləşdiyi üçün öz əhəmiyyətini hər zaman qorumuşdur. Bu yarımada qərbdə Qırmızı dəniz və Afrika qitəsi ilə, şərqdə Bəsrə körfəzi və İranla, cənubda isə Hind okenaı ilə həmsərhəddir. Yarımadanın şimali-qərbində Suriya ilə Anadolu, şimali-şərqində isə İraq və İran yerləşir.

Ərəblərin soyu cənub ərəblərinin ulu babası Qəhtanla şimal ərəblərinin ulu babası olan Adnana dayanır. Əsl ərəblərin Qəhtan

1 Bəqərə, 2/185; Qədr, 97/1

soyundan gəldiyi, digərlərinin isə sonradan ərəbləşdikləri qəbul olunur. Şimalda yaşayan Övs, Xəzrəc və Qəssan kimi bir çox ərəb qəbilələri əslən cənublu olub sonradan şimala köç etmişlər. Məkkə və onun ətrafında yaşayan Rəsulullahın qəbiləsi Qüreyş isə şimaldakı Adnan soyundan gəlirdi. Ərəb dili də kökü akkad dilinə gedib çıxan sami dil qrupuna aiddir. İbrani, süryani, həbəş, finikiya və Cənubi Ərəbistan dilləri də bu dil qrupuna mənsub dillərdir.

Quraq iqlimə sahib olan Ərəbistan yarımadasının orta hissəsi səhralıqdır. Ancaq yarımadanın şimal və cənub bölgələri əkinçiliyə əlverişli iqlimə sahibdir. Xüsusilə Yəməndə ta qədimdən ədviyyat bitkilərinin becərildiyi və onların ticarəti olduğu, bundan başqa e.ə. 2000-ci ildən Marib vahəsinin süni suvarma sistemi ilə suvarıldığı və ildə iki dəfə taxıl götürüldüyü tarixə məlumdur. Cənubi Ərəbistan, əkinçiliklə yanaşı Hindistan və Afrikadan gələn malların ticarətindən də böyük gəlir əldə edirdi.

Məhz bu xüsusiyyətlərinə görə Yəmən, Rəsuli-Əkrəmin doğulmasından əvvəlki əsrlərdə iranlıların və romalıların ələ keçirmək üçün mübarizə apardıqları, lakin tez-tez əldən-ələ keçən bir ərazi idi. Romanın Qırmızı dənizin o tərəfindəki xristian Həbəşistan uğrunda apardığı bu mübarizə, Rəsulullahın dünyaya gəlməsindən bir müddət əvvəl Hicaza da sıçramışdı. Rəsulullahın anadan olduğu və İslam tarixində "Fil ili" deyə bilinən 571-ci ildə əslən Roma tacirinin köləsi olan Yəmən hökmdarı Əbrəhə (Abramus) ordusu ilə Hicaza səfər etmişdi. Əbərəhədən əvvəl xristianlar burada (Yəməndə) İranın müttəfiqi olan yəhudi sərkərdə Zu Nuvasın hakimiyyəti altında yaşayırdılar. 525-ci ildə həbəşlər Zu Nuvası öldürüb hakimiyyəti ələ keçirdilər və onların hakimiyyəti 570-ci ildə Əbrəhənin ölümünə qədər davam etdi. Əbrəhədən sonra İslam fəthlərinə qədər Yəmən İranın bir vilayəti olaraq qaldı.

Şimali Ərəbistandakı ərəblər də inkişaf etmiş cəmiyyət idi. Roma mənbələrində I əsrdə şimalda dövlət quran Nəbatilərdən bəhs olunur. Bu dövlətin paytaxtı qalıntıları günümüzə qədər gəlib çıxan Petra şəhəri idi. E. ə. V əsrdə şimali-qərbdə yaşayan ərəblər də, farslara qarşı Romanın müttəfiqi olmuş və xristianlığı qəbul etmişdilər. Müsəlmanların 636-cı ildə Yərmuk zəfərindən sonra Romanın bu torpaqlardakı hakimiyyətinə son qoyuldu.

Şimal ərəblərinin arasında farsların da müttəfiqləri var idi. Bunlar bugün Nəcəf adlanan Hirə şəhərini öz paytaxları elan etmişdilər. Hirə, ərəb yazısının inkişafında böyük rol oynamışdır. 633-cü ildə "İslamın qılıncı" ləqəbini daşıyan Xalid b. Vəlidin ordusu burda fars hakimiyyətinə son qoymuşdur.

**B. Quranın nüzulundan əvvəl Məkkə və ətrafı**

Çöl iqliminin hakim olduğu Məkkə və ətrafında həyat şərtləri çox çətin idi. İctimai vəziyyət bu şərtlərə görə formalaşmışdı. Roma tarixçisi Strabon ərəblər haqqında bunları söyləyir: "Onların bir hissəsi köçəri həyat tərzi sürərkən, aralarında kiçik qəsəbələr salan əkinçilər də var idi. Bu insanla dəvələrinin südü və əti ilə qidalanır, onlarla səyahətə çıxır və savaşırdılar." Bu şərtlər ərəb ailəsində patriarxizmi ön plana çıxarmışdı. Bu, Qurani-kərim də dilə gətirilmişdir (bax. Müddəssir, 74/13; Qələm, 68/149). Həm də belə bir vəziyyətdə rəqabət apara bilmək üçün ailə və soy əlaqələri çox güclənmişdi. Bəzən güclü qəbilələr zəif qəbilələri öz himayəsinə alır, ittifaqlar qurur və digər qəbilələrlə müharibələr aparıdılar.

İctimai quruluşda ən üst təbəqəni yerli ərəblər tuturdu. O dövrdə qəssablıq, bərbərlik, şərabçılıq və digər sahələr inkişaf etmişdi.

### 1. Məkkə, Qüreyş və Peyğəmbərimizin ailəsi

Peyğəmbərimizin mənsub olduğu Qüreyş qəbiləsini Məkkədə və hətta o bölgədə məşhurlaşdıran şəxs, Rəsulullahın beşinci nəslindən babası olan Qusay B. Kiləb olmuşdur. Qusay Məkkəni din və ticarət mərkəzi halına gətirmişdir. O, həcc ziyarətinin müqəddəsliyini daha da artırmaq üçün fərqli yerlərdə olan bütlərin hamısını Kəbədə topladı. Bundan başqa Qüreyşə aid məsələləri müzakirə etmək üçün ağsaqqallardan ibarət "Darun-Nədvə" məclisini qurdu. Müharibənin mübah və haram olduğu ayların elanı, ticarət karvanlarının göndərilməsi kimi mühüm qərarlar burada alınır, eyni zamanda nikah, sünnət və s. mərasimlər də burada keçirilirdi. Karvanlar buradan yola çıxar və təkrar bura qayıdardı. Haram ayları (rəcəb, zülqaidə zülhiccə və məhərrəm) xüsusi əhəmiyyət daşıyırdı. Bu aylarda müharibələr dayanır və bunun nəticəsində də ticarət həyatı canlanırdı. Məhz bu aylarda həcc ziyarətləri olur, Ukaz yarmarkaları qurulur, hər kəs ticarət və sənətkarlıqla məşğul olurdu. Şairlər və xətiblər öz ədəbi hünərlərini göstərirdilər. Kəbəyə və həcc vaxtında hacılara Qusayın oğlanları xidmət göstərirdilər.

Daha sonrakı dövrlərdə Qusayın nəvəsi Haşim Suriyaya gedərək Qüreyş karvanlarının təhlükəsizliyini təmin etmək üçün Bizansla müqavilə bağladı. Haşimin yolunu izləyən qardaşları Abduşəms, Müttəlib və Nofəl də Həbəşistanda Nəcaşi ilə, Yəməndə Himyər kralı, İranda da farslarla müqavilələr bağladılar. Beləliklə Qüreyş həm yay, həm də qış aylarında sərbəst şəkildə bu bölgələrə karvan göndərməyə başladı. Yayda karvanlar Suriya və Fələstinə, qışda isə Yəmənə, bəzən də Qırmızı dənizi keçərək Həbəşistana göndərilirdi. Haşimin bu səyləri nəticəsində Məkkə böyük gəlir əldə etdi və Qüreyş qəbiləsi zəngin bir qəbiləyə çevrildi. VII əsrdə Qüryeşin içərisindən bir çox zəngin tacir ortaya çıxmışdı və onlar Hind okeanı və Şərqi Afrika ilə Aralıq dənizi arasındakı ticarəti

öz əllərində saxlayırdılar. Məkkənin sosial quruluşu da ticarətin əhəmiyyəti və Qüreyşin üstünlüyü çərçivəsində formalaşmışdı.

Haşim, Peyğəmbərimizin babası olan Abdulmüttəlibin atası idi. Hz. Mühəmmədin atası Abdullah isə Abdulmüttəlibin onuncu oğludur. Abdullah Bəni Zührə hakimi Vəhbin qızı Əminə ilə evlənmişdi. Əminə hamilə ikən ticarət məqsədilə Şama gedən Abdullah, yolda Yəsribə baş çəkir. Burada xəstələnrək vəfat edir və Hz. Mühəmməd daha dünyaya göz açmadan yetim qalır. Rəsulullah, Əbrəhənin ordusu Məkkəyə hücum etdiyi ildə, yəni 571-ci ildə anadan olmuşdur. Altı yaşında Hz. Peyğəmbər anası ilə birlikdə atasının məzarını və qohumlarını ziyarət etmək üçün Mədinəyə gedir. Lakin ordan dönərkən anası vəfat edir. Anasını itirən Hz. Mühəmməd bundan sonra səkkiz yaşına qədər babasının yanında qalır. Babası vəfat etdikdə isə əmisi Əbu Talib onu öz himayəsinə alır. Mənbələr on yaşında ikən Hz. Mühəmmədin əmisi ilə birlikdə Şam yolu üzərində olan Busraya səyahət etdiyini xəbər verir. Hz. Mühəmməd burada Bahirə adlı xristian rahiblə qarşılaşır və onların arasında qısa dialoq olur.

Hz. Mühəmməd iyirmi yaşına çatdıqda ticarət məsələlərindəki rəqabət nəticəsində baş verən və haram aylarda olduğu üçün "Ficar müharibələri" adlandırılan müharibələrdə iştirak edir. Bu müharibələr Qüreyş və onun müttəfiqlərinin qalibiyyəti ilə başa çatır. O il, Hz. Mühəmməd, haqsızlığa uğrayanların haqqını qorumaq üçün təşkil olunan "Hilful-füzul" məclisinə seçilir. İyirmi beş yaşında Hz. Xədicə ilə evlənir. Ondan dördü qız, altı uşağı dünyaya gəlir. Bunlardan Fatimə xaric digərləri ondan tez dünyadan köçmüşlər. Otuz beş yaşında o, sel nəticəsində dağılan Kəbənin yenidən inşası zamanı Həcərül-əsvədin yerinə qoyulması məsələsində qəbilələr arasında ortaya çıxan problemi həll edir. Bu ona Məkkədə olan ehtiramı daha da artırır. Hz. Mühəmməd vəhy aldığı qırx yaşına qədər

hər Ramazan ayını Hira mağarasında keçirmişdir. Məhz ilk vəhyi də bu mağarada almışdır.

## 2. Ərəblərin dini etiqadı

Hz. İbrahimin soyundan gələn ərəblər, Hz. İbrahimdən sonra onun gətirdiyi tövhid dinindən uzaqlaşmışdılar. Ancaq müxtəlif ərəb cəmiyyətlərinə bütpərəstlikdən və batil etiqadlardan qurtulmaq üçün Allah tərəfindən elçilərin göndərildiyini Qurandan öyrənirik. Hz. Hud Quranda bəhs olunan beş ərəb peyğəmbərin ilkidir. Hz. Hud, Hz. Nuhdan sonra yaşayan Ad qövmünə[2], Hz. Saleh isə bugün Mədayini-Saleh adlanan, Şam və Hicaz arasında yaşamış olan Səmud qövmünə[3] göndərilmişdir. E. ə. səkkizinci əsrə aid Assuriya kitabələrində bu qövmün adı keçir. Bundan başqa Təbüklə Qırmızı dəniz arasında, Əqabə körfəzinə qədər uzanan Mədyən adlanan bölgədə yaşayan Eykə xalqına da Hz. Şüeyib göndərilmişdir. Hz. Musa da Mədyəndə bir müddət qalmışdır[4]. Bu bölgə, Yəməndən Fələstinə, Misirə və Aralıq dənizi sahillərinə gedən ticarət yolunun üstündə idi. Ayələrdə Hz. Şüeybin xüsusilə ölçü və çəki məsələsində cəmiyyəti çəkindirdiyi bildirilir.[5]

Rəsulullahın gəlişi ərəfəsində ərəblər arasında bütpərəstlik çox geniş yayılmışdı. Hər qəbilənin öz bütü vardı. İslamdan əvvəlki Hicaz bölgəsi ərəbləri Lat, Mənat və Uzza adlı bütlərə sitayiş edirdilər.[6] Bu bütlərin olduğu məkanlar Övs və Xəzrəc qəbilələri tərəfindən ziyarət olunurdu. Səqifoğulları da Lat adlı bütə qulluq edir və onun yerləşdiyi məbədin işlərini görürdülər. Bu büt Şimali Ərəbistanda da savaş tanrısı kimi tanınırdı. Lat kəlməsinin sami

2 bax: Əraf, 7/72, Hud, 11/53, Şüəra, 26/124
3 bax. Əraf, 7/73, Şüəra, 26/141, Fəcr, 89/9
4 Taha, 20/40
5 Əraf, 7/75, Hud, 11/84, Hicr, 15/78
6 bax. Nəcm, 53/19-22

xalqlarının Tanrı üçün işlətdiyi "İl" və "Əl" kəlmələrindən törədiyi ehtimal olunur. Lat məbədi eyni zamanda Məkkə ilə Taif arasındakı siyasi rəqabətin bir hissəsi idi. Məkkənin qoruyucu ilahəsi olan Uzza isə bu üç bütün ən əhəmiyyətlisi hesab olunurdu. Qüreyşin hörmət göstərdiyi Hübəl Suriyada idi və Qüreyş onu daha sonra Kəbəyə gətirmişdi. Hübəl insan şəklində daşdan hazırlanmış və sağ əli qırılan bir heykəl idi. Qüreyşlilər onu savaş və yağmur ilahı qəbul edirdilər. Əbu Süfyanın Uhud döyüşündə bu bütə dua etdiyi mənbələrdə qeyd olunur. Hübəlin yanında fala baxılır, oğlan uşaqları sünnət edilir və nikah qıyılırdı.

Bu bütlərin xaricində Qüreyşin İsaf və Nailə adlı iki bütü daha var idi. Bunlardan birisi Səfa, digəri isə mərvə təpəsində yerləşirdi və bu bütlər bolluğu təmsil edirdilər. İsaf kişi, Nailə isə qadın şəklində idi.

Quranda Vəd, Suva, Yağus, Yəuq və Nəsr adlı bütlərdən də bəhs olunur.[7] İbn Kəlbi Yağus, Yəuq və Nəsrin Yəməndə ibadət olunan bütlər olduğunu bildirir. O, eyni zamanda əsasən çobanlıqla məşğul olan Hüzeyl qəbiləsinin də, sürüləri qoruduğuna inandıqları Suvaya ibadət etdiyini qeyd etmişdir.[8]

### 3. Ərəbistan yarımadasındakı digər etiqadlar

Yəhudilik Mərkəzi Ərəbistana kənardan daxil olmuş bir dindir. Yəhudilərin bura ilk dəfə Qüdsdəki məbədin romalılar tərəfindən dağıdıldığı e.ə. 70-ci ildə gəldikləri ehtimal olunur. Buradan qaçan yəhudilər öz bilgi və bacarıqları ilə Hicazdakı ərəblərə təsir etmişlər. Yəhudilik ərəblər arasında yayılmasa da, Yəsribdəki Övs və Xəzrəc qəbilələri arasında bu dinə sitayiş edənlər vardı.[9] Məkkədə də

7 Nuh, 71/23-24
8 İbn Kəlbi, *Bütlər kitabı*, s. 50, 51.
9 İbn Hişam, *əs-Siratun-Nəbəviyyə*, I/82

qəbilə münasibətlərini möhkəmləndirmək məqsədilə qüreyşlilərin yəhudi qızları ilə evləndikləri tarixə məlumdur.

Xristianlıq isə, məzəhəb çəkişmələri nəticəsində Ərəbistana gəlib çıxmışdır. 431-ci ildəki Efes qurultayında aforoz olunanlar İraqa qaçmış, bunların bir hissəsi Suriya ilə Hicaz arasındakı çöllərə yerləşmidi. Ancaq Yəsribdə yəhudilər də yaşadığı üçün buraya gəlib çatmamışdılar.

Romanın Şimali Ərəbistandakı müttəfiqləri Salehilər və Qəssanilər xristianlığı qəbul etmişdilər. Məsələn, Salehi məliki Davud bir monastr tikdirmişdi. Xristianlıq eyni zamanda İranın ərəb müttəfiqlərindən olan Lahmilər arasında da yayılmışdı. İkinci Lahmi kralı İmrul-Qeys xristianlığı qəbul etmişdi. Son Lahmi kralı Numanın da xristian olduğu söylənilir. Lahmilərin paytaxtı Hirədə kilsə və monastrlar var idi. Bu şəhər həm də Bizans xristianlığının təqibindən qaçanlar üçün sığınacaq yeri olmuşdu. Xristianlıq Yəmənə isə IV əsrdə gəlmişdi və burada xristianlar əsasən Nəcranda yaşayırdılar.

Sabiilikdə İslamdan əvvəl bu ərazidə mövcud olan dinlərdən idi. Quranda da bu din mənsublarından bəhs olunmuşdur.[10] Ancaq Quranda onların etiqadlarından və ibadıət şəkillərindən bəhs olumur. Sabiilər haqqındakı araşdırmalar, onların həm müqəddəs kitaba, həm də fərqli etiqada sahib olduqlarını göstərir. Onlar İslam gəldiyi zaman Bəsrə körfəzinin şimalında yaşayırdılar. Sabiiliyə əsasən Yəhudiliyin təsirləri olmuşdur. Bu dində vaftizə bənzər ayinlərin olduğu da bildirilir.[11]

---

10 bax: Bəqərə, 2/62; Maidə, 5/69; Həcc, 22/17

11 Geniş məlumat üçün bax. Şinasi Gündüz, *Son Gnostikler*, Ankara, 1995.

## 4. Quran və əvvəlki ilahi kitablar

Qurani-kərim Tövrat, Zəbur və İncildən sonra gəlmişdir. Buna görə də Quran bu kiatbları da əhatə edir. Belə ki, Quran, keçmişdə Allah tərəfindən bir çox peyğəmbər göndərildiyini, onlara kitab və ya səhifələr verildiyini bildirir. Quranda Hz. İbrahimin səhifələrindən, Hz. Musaya verilən Tövratdan, Hz. Davudun Zəburundan və Hz. İsanın İncilindən bəhs olunur.[12] Quran, xüsusilə Tövrat və İncil haqqında geniş məlumat verir, bu kitablarda keçən mövzu və qissələrə yer ayırır. Kainatın və insanın yaradılışı; Cənnətdən çıxarılış; Nuh Tufanı; Hz. İbrahim, İshaq və Yaqub; İsrailoğullarının tarixi; Hz. Yusif; Hz. Musa və Fironla mübarizəsi, Misirdən çıxış, İsrailoğullarının çöldəki həyatı; Talut (Saul), Davud və Süleyman; Zəkəriyyə və oğlu Yəhya; Məryəm, oğlu İsa ilə həvariləri və s. mövzular Kitabi-Müqəddəslə Quranın ortaq mövzularıdır. Bundan başqa Quran bu ilahi kitablarda keçən beynəlmiləl prinsipləri təkrarlamış, bu kitabların nə qədər mühafizə olunub-olunmadığını ortaya qoymuşdur.[13]

Quranla əvvəlki müqəddəs kitablar arasında bəzi fərqliliklər də vardır. Məsələn, Quranla bu ilahi kitabların kitab şəklinə salınması bir-birindən fərqlidir. Yəhudi etiqadına görə Hz. Musa özünə gələn vəhyləri yazaraq kitab halına gətirmiş[14] və özündən sonrakılara təslim etmişdir. Ancaq bugün bir çox elm adamı qəbul edir ki, Tövrat zaman keçdikcə kitab formasına düşmüşdür. Tövratın ortaya çıxışı, Hz. Musadan sonrakı vəziyyəti, günümüzə qədər gəlişi, mövcut Tövratın nə zaman və kimlər tərəfindən yazıldığı kimi mövzular mübahisəlidir. Hz. Musanın yaşadığı e.ə. XIII əsrdən Babil əsarətinin başladığı e.ə. VI əsrə qədər Tövratın bir neçə dəfə yox

12 bax. Nisa, 4/136

13 bax. Bəqərə. 2/89, 136; Ali-İmran, 3/3, 84; Maidə, 5/48; Ənam, 6/92; Hədid, 57/26-27

14 Çıxış, 17/14; 24/3; 34/27; Saylar, 33/2; Təsniyə, 31/9, 24-26.

olduğu, düşmənlərin əlinə keçdiyi, müxtəlif dəyişikliklərə uğradığı[15] bildirilir. Tövrat Hz. Musadan on üç əsr sonra, yəni I əsrdə bugünkü şəklinə salınmışdır. Günümüzdə mövcud olan ən qədim və tam ibranicə əlyazma nüsxələr IX əsrə, Tövratın yunanca tərcümələri isə IV əsrə aiddir.

Eyni şey bugünkü İncillər üçün də keçərlidir. Xristianlığa görə Hz. İsa ilahi kəlamdır. Yəni o özü vəhyi təmsil edir. İncil kitabları isə Allahın kəlamı deyil, Hz. İsadan sonra qələmə alınan mətnlərdir. Bugünkü İncillərin Hz. İsa tərəfindən yazılmadığını xristianlar özləri də qəbul edirlər. İncillər Hz. İsadan ən az otuz il sonra yazılmağa başlanmış və I əsrin sonunda yazılıb tamamlanmışdır.[16]

Qurani-Kərimlə Kitabi-Müqəddəs arasında möhtəva və üslub baxımından da fərqlər vardır. Kitabi-Müqəddəs müxtəlif müəlliflər tərəfindən və fərqli dövrlərdə yazılmışdır. Onda tarixi hadisələrlə yanaşı, dini hökmlərə, fəlsəfi dialoqlara, hikmətli sözlərə və dualara da yer verilmişdir. Kitabi-Müqəddəsdə hadisələr, zaman və məkan yönü ilə də ələ alınmışdır. Əski-Əhid İsrailoğullarının tarixindən çox geniş şəkildə bəhs etmişdir. Yeni Əhiddə isə əsasən Hz. İsanın həyatı ələ alınmışdır.

Quranda isə həm Əski Əhiddən, həm də Yeni Əhiddən fərqli olaraq, daim Allah danışır, xitab olunanlar isə Hz. Peyğəmbər, müxtəlif etiqad mənsubları və ümumilikdə insandır.

## II. TƏFSİR ÜSULU HAQQINDA ÜMUMİ MƏLUMAT

Təfsir üsulu "təfsir" və "üsul" kəlmələrindən meydana gələn bir termindir. Buna görə də təfsir üsulunun tərifini vermədən əvvəl

---

15 Yeremeya, 8/8.

16 Bu mövzu barədə bax. Ömər Faruk Harman, "Kuran", *DİA*, XXVI/412.

bu ifadənin daha yaxşı anlaşılması üçün onu meydana gətirən yuxarıdakı iki məfhumu qısa olaraq ələ almaq lazımdır:

**A. Təfsir**

**1. Leksik mənası**

Mənbələrə nəzər saldıqda təfsir kəlməsinin iki fərqli kökdən meydana gəldiyini görürük:

a.Təfsir kəlməsi, lüğətdə "bəyan etmək, kəşf etmək, üstü örtülü bir şeyi açmaq" kimi mənalara gələn "*fəsr*" kökündən törəmişdir.

b.Təfsir kəlməsi, təqlib vəzni ilə "*səfr*" kökündən əmələ gələn təfil babında bir məsdərdir. "*Səfr*" kəlməsi müxtəlif mənalara gəlməklə bərabər "örtülü bir şeyi açmaq, aydınlatmaq və açmaq" anlamlarını da daşıyır.

Hər nə qədər bu iki kəlmə mənaca bir-birinə yaxın olsalar da, yenə də bunlar arasında fərq vardır. Belə ki, Əmin əl-Xuliyə görə "*fəsr*" və "*səfr*" kəlmələrinin ikisində də kəşf etmək, ortaya çıxarmaq mənaları vardır. Amma "*səfr*" kəlməsində maddi, zahiri bir kəşf, "*fəsr*" sözündə isə mənəvi bir kəşf vardır. Məna ilə əlaqədar olduğu üçün Xuli "*təfsir* "kəlməsinin "*fəsr* " sözündən törədiyini iddia edir.

**2. Terminoloji mənası**

Ümumi olaraq təfsir, "*müşkil olan ləfızlərdən murad edilən mənanın kəşf edilməsi*", xüsusi olaraq isə, "*insan gücü və ərəb dilinin verdiyi imkan nisbətində Allah-təalanın Quranda qəsd etdiyi mənaları ortaya qoymaqdır*". Daha açıq ifadə etsək "*Qurani- kərimdəki ayələrdən murad edilən mənanın (Allahın məqsədinin) nə olduğunu təfsir üsulu metodlarından hər hansı biri ilə təsbit edib ortaya qoyulmasına*" təfsir deyilir.

**B. Üsul**

Üsul "*əsl*" kəlməsinin cəmidir. Lüğətdə "*təməl, əsas, kök*" mənalarına gəlir. Bundan başqa "dəlil" və "qayda" mənalarını da daşıyır. Termin kim üsulu belə tərif edə bilərik: "*Hər hansı bir elmlə bağlı olan məlumatların sistemli şəkildə yerləşdirilməsində istifadə olunan müəyyən qayda və metodlardır*".

**C. Təfsir üsulu**

Təfsir üsulu da, Quranın anlaşılması və şərh olunmasında bəzi prinsiplər və metodlar ortaya qoyur və bunlardan istifadə etmə yollarını göstərir.

**1. Təfsir üsulunun qayəsi**

Təfsir üsulunun əsas qayəsi Quranın anlaşılmasına kömək etməkdir. Buna görə də bu elm Quran təfsirində ehtiyac duyulan qayda və qanunlar üzərində durur. Bu qayda və qanunlar Quranı anlamaqda plan vəzifəsini görürlər. Hər hansı bir işi plansız görmək mümkün olmadığı kimi, müəyyən qayda və qanunlar təsbit etmədən bir elmi tətbiq etmək də mümkün deyildir. Məsələn fiqh elminin əhatəsinə girən məsələlərin təsbitində fiqh üsulu elminə ehtiyac vardır. Çünki bu elmin qaydalarını bilməyən insanlar hökm çıxararkən doğru nəticələri əldə edə bilməzlər. Qurani-kərimin də doğru şəkildə təfsir edilməsi üçün məhz təfsir üsuluna ehtiyac vardır.

**2. Təfsir üsulunun meydana çıxması**

Təfsir üsulu elminin tam olaraq nə vaxt ortaya çıxdığını təsbit etmək çox çətindir. Hicri II əsrdən etibarən yazılmağa başlanan Quran elmləri ilk dövrlərdə əsbab-ı nüzul, nasix-mənsux, qəribul-Quran və s. kimi başlıqlar altında qələmə alınırdı. Beləliklə erkən dövrlərdən etibaren təfsir üsulu sahəsində əsərlər ortaya çıxdı. Za-

man keçdikcə təkamül edən bu elm, daha sonra müstəqil bir elm kimi formalaşdı.

**3. Təfsir üslünün mənbələri**

İslam elmlərinin dili ərəbcə olduğu üçün təfsir sahəsində yazılan əsərlərin bir çoxu da məhz bu dildə yazılmışdır. Ancaq türk, fars və müxtəlif Avropa dillərində də bu sahə ilə əlaqədar əsərlər qələmə alınmışdır. Aşağıda bunlardan bəzilərinə yer verilmişdir:

**a. Müstəqil əsərlər**

1. Haris əl-Mühasibi (vəfatı-243/857), *əl-Əql və fəhmul-Quran*.

Bu əsər Quran elmləri sahəsində yazılan ilk əsərdir. Əsərdə Quranın fəzilətləri, üslubu, möhkəm-mütəşabeh, nəsx və xəlqul-Quran kimi bəhs mövzulardan olunur.

2. əl-Hufi (vəfatı 430/1038), *əl-Burhan fi ulumil-Quran*.

“*Ulumul-Quran*” ifadəsinin işləndiyi ilk əsər hesab olunur. Otuz cilddən ibarət olsa da günümüzə bunlardan sadəcə on beş cildi gəlib çatmışdır.

3. İbnul-Cəvzi (vəfatı-597/1200), *Fününul-əfnan*.

4. ət-Tufi (vəfatı-716/1316), *əl-İksir fi ilmit-təfsir*.

5. İbn Teymiyyə (vəfatı-728/1327), *Müqəddimə fi üsulit-təfsir.*

6. əz-Zərkəşi (vəfatı-794/1392), *əl-Burhan fi ulumit-Quran*.

7. əs-Süyuti (vəfatı-911/1505), *əl-İtqan fi ulumil-Quran*.

8. əd-Dihləvi (vəfatı-1176/1764), *əl-Fövzül-kəbir fi üsulit-təfsir*.

9. əz-Zərqani (vəfatı-1367/1948), *Mənəhilul-irfan fi ulumil-Quran*.

10. əz-Zəhəbi (vəfatı-1399/1978), *ət-Təfsir vəl-müfəssirun*.

11. Sübhi Salih (vəfatı-1399/1978), *Məbahis fi ulumil-Quran*.

12. Mənnaul-Qəttan, *Məbahis fi ulumil-Quran*.

**b. Müqəddimələrində təfsir üsuluna yer verən müəlliflər**

Bəzi müfəssirlər qələmə aldıqları təfsirlərin müqəddimələrində təfsir üsulu ilə əlaqəli mövzulardan bəhs etmişlər. Onların verdikləri məlumatlar təfsir sahəsi ilə məşğul olan tədqiqatçılar üçün çox qiymətli hesab olunur. Bu müfəssirlər və onların təfsirləri bunlardır:

1. ət-Təbəri (vəfatı-310/922), *Camiul-bəyan an təvilil-Quran*. Bu təfsirin müqəddiməsində Qurandakı qərib kəlmələrə, yeddi hərf və surə adları kimi mövzulara yer verilmişdir.

2. Rağib əl-İsfəhani (vəfatı-502/1108), *Müqəddimətüt-təfsir*. Əsərdə Bəqərə surəsinin 220-ci ayəsi şərh edilmişdir. Ancaq əsərin əvvəlində təfsir üsulu ilə bağlı mühüm məsələlərə toxunulmuşdur.

3. İbn Atiyyə əl-Əndəlusi (vəfatı-543/1148), *Müqəddimə*. Bu müqəddimə müfəssirin "*əl-Muharrarül-vaciz fi təfsiril-Quranil-əziz*" adlı təfsirinin əvvəlində yerləşir.

4. əl-Qurtubi (vəfatı-671/1272), *əl-Cami li əhkamil-Quran*. Müfəssir bu əsərində bir çox təfsir üsulu mövzularıdan bəhs etmişdir.

5. İbn Kəsir (vəfatı-774/1372), *Təfsiru-Quranil-əzim*. Müfəssir təfsirinin sonuna əlavə etdiyi zeyldə[17] bir çox təfsir üsulu mövzularına yer vermişdir.

6. əl-Qasimi (vəfatı-1332/1914), *Məhasinut-təvil*. Bu əsərin birinci cildində təfsir üsulu mövzuları geniş bir şəkildə işlənmişdir.

17 Əlavə

**c. Avropa dillərində yazılan mənbələr**

1. İqnaz Qoldziher, *De Richuntgen der İslamichen Koranauslegung* (*İslam təfsir məktəbləri*).

Əbdülhəlim ən-Nəccar bu əsəri "*Təfsirul-məzəhibil-islami*" adı ilə ərəb dilinə tərcümə etmişdir. Bundan başqa bu əsər Mustafa İslamoğlu tərəfindən "*İslam tefsir ekoller*i" adı altında türk dilnə çevirilmişdir.

2. Rudi Paret, *Kuran Üzerine Makaleler*. Ömər Özsoy tərəfindən türk dilinə tərcümə edilən bu əsər Paretin müxtəlif vaxtlarda qələmə aldığı on doquz məqaləsini əhatə edir.

3. T. Nöldeke - F. Şivli, *Kuran Tarihi*. Bu əsər Muammer Sencer tərəfindən türk dilinə tərcümə edilmiş və 1970-ci ildə İstanbulda nəşr olunmuşdur. Nöldeke eyni zamanda "*Gecschichte de Qorans (Quran tarixi)*" adlı üç cildlik bir əsər də yazmışdır ki, bu əsər 1919-cu ildə Almaniyanın Leypsiq şəhərndə nəşr olunmuşdur.

4. H. Hörşfeld, *New Researches into the Composition and Exegesis of the Qoran* (*Quranın tərtib və təfsirində yeni araştırmalar*), 1902.

5. Artur Cefri, *The Foreign Vokabulary of the Quran* (*Quranda qərib kəlmələr*), Baroda, 1938.

**D. Məna baxımından təfsir məfhumu ilə yaxın olan kəlmələr**

**1. Təvil**

Lüğəvi yöndən "təvil" kəlməsi; "*əslə qayıtmaq*" mənasına gələn "*əvl*" sözündən götürülüb "*əslinə qaytarmaq*" və "*hər hansı bir şeyi çatacağı yerə çatdırmaq*" deməkdir. Bundan başqa bu kəlmənin "*təqdir və təfsir etmək*" anlamları da vardır. "*Təvil*" sözü Quranda fərqli mənalarda işlədilmişdir. Bunların bir qismini aşağıdakı kimi sadalamaq olar:

a. Təfsir: *"Onun təvilini / təfsirini sadəcə Allah bilir..."*[18]

b. Səbəb: *"Səbr etməyə gücünün çatmadığı şeylərin təvilini / səbəbini sənə bildirəcəyəm."*[19]

c. Nəticə: *"Bu , xeyrlidir və nəticə etibarı ilə daha yaxşıdır."*[20]

d. Yuxuyozma: *"Və Yusif dedi:"Ata! Bu mənim əvvəlki yuxumun təvilidir /yozumudur."*[21]

Termin olaraq da təvil, *"məşru bir səbəb və ya dəlili əsas alaraq ayəni zahiri mənada deyil, özündən əvvəl və sonra gələn ayələrə, kitaba və sünnəyə uyğun olan mənalardan birinə qaytarmaq "* deməkdir.

**a. Təvilin şərtləri**

İslam alimlərinin əksəriyyətinə görə ayənin zahiri mənası başa düşülürsə təvilə heç bir ehtiyac yoxdur. Ancaq müşkil və mütaşabeh ayələrin izahında təvildən qaçmaq mümkün deyildir. Bir ayəni təvil edərkən aşağıda verilən xüsusiyyətlərə diqqət etmək lazımdır:

1. Təvil edilən kəlmənin mənası, məcaz yolu ilə də olsa o kəlmənin özünə dəlalət edən mənalardan biri olmalıdır.

2. Təvil olunan kəlmə və ya ifadə təvil edilərkən şəri bir dəlilə əsaslanmalıdır.

3. Təvilin şətlərindən biri də təvil edilən kəlmənin mənasının açıq bir nəssə zidd olmamasıdır.

Bu şərtləri diqqətə almadan edilən təvillər doğru deyildir.

**b. Təvil ilə təfsir arasındakı fərqlər**

Bunlar arasındakı fərqləri aşağıdakı kimi sadalaya bilərik:

18 Ali-İmran 3/7.
19 Kəhf 18/78.
20 Nisə 4/59.
21 Yusuf 12/100.

1. Təvil mütləq deyildir. Təfsir isə mütləqdir. Çünki təfsir Hz. Peyğəmbərdən və vəhyə şahid olan səhabələrdən gələn rəvayətləri əsas alır. Halbuki təvil ictihadı əsas alır.

2. Təfsir təvildən daha ümimidir. Təfsir ləfzlərdə (sözlərdə), təvil isə mənalarda olur. Təvil ilahiyyat mövzularında yazılmış əsərlərdə, təfsir isə həm ilahiyyat mövzularında, həm də digər mövzularda yazılmış əsərlərdə olur.

3. Təvil batini mənanı, təfsir isə zahiri mənanı açıqlayır.

4. Təvil dirayətə, təfsir isə rəvayətə söykənir.

5. Təfsirdə doğruluq olduğu üçün təfsir daima etibarlı qəbul olunur. Təvilin isə etibarlısı olduğu kimi, qəbul olunmayanı da vardır. Başqa cür ifadə etsək, təfsirdə qətilik, təvildə isə ehtimal vardır.

**2. Tərcümə**

"*Tərcəmə*" və ya "*rəcəmə*" köklərindən əmələ gəldiyi iddia edilən "*tərcümə*" sözü lüğətdə "*bir kəlamı başqa bir dildə ifadə etmək*", "*bir sözü başqa bir dildə təfsir və bəyan etmək*", "*bir kəlməni başqa bir dildə mənalandırmaq*" və s. kimi anlamlara gəlir.

Tərcümə kəlməsnin yuxarıdakı mənalardan başqa mənaları da vardır ki, onlar aşağıdakılardır:

a. Tərcümə "*bab* " başlığı , yəni bir kitabdakı fəsil adı mənasına gəlir.

b. Bu kəlmənin digər mənası da " *tərcümeyi-hal*" deməkdir.

c. Bir sözü bu sözdən xəbəri olmayan bir kəsə çatdırmaq da tərcümə mənasına gəlir.

d. Bir sözü işlədildiyi dildə təfsir etməyə də tərcümə deyilir. Buna görə İbn Abbasa "*tərcümanul-Quran*" adı verilmişdir.

e. Bir sözü bir dildən başqa bir dilə çevirib təfsir etməyə də tərcümə deyilir.

Termin kimi isə tərcümə, “*hər hansı bir dildəki söz və ya kəlamın, eynilə başqa bir dildəki bənzəri ilə ifadə edilməsidir*”.

Tərcümə məfhumu, hərfi və ya ləfzi, mənəvi və ya təfsiri tərcümə deyə iki qismə ayrılır:

a. Hərfi (ləfzi) tərcümə: Nəzmində və tərtibində əslinə bənzəməsinə diqqət olunan tərcüməyə “*hərfi* (*ləfzi*) *tərcümə*” deyilir. Bu tərcümə növündə tərcümə olunacaq kəlmələr bir-bir ələ alınır, onların yerinə qoyulacaq sözlər hər bir yönü ilə diqqətlə incələnir. Fərqli dillər arasında bu tərcümə metodundan istifadə etmək çox çətindir. Buna görə də Quranı hərfi tərümə etmək mümkün deyildir.

b. Təfsiri (mənəvi) tərcümə: Nəzmə və tərtibə bağlı qalmadan hər hansı bir sözün bəzi şərh və izahlarla başqa bir dilə nəql edilməsinə “*təfsiri tərcümə*“ deyilir. Günümüzdə daha çox tərcümənin bu növündən istifadə olunur.

**3. Məal**

Bu kəlmə də təvil sözü kimi “*əvl*” kökündən törəmişdir. Lüğətdə “*bir şeyin özü, xülasəsi və nəticəsi*” mənasına gəldiyi kimi “*naqis olmaq*” mənasına da gəlir.

Termin olaraq məal, “*bir sözün mənasını hər cəhəti ilə deyil, bir az naqis olaraq ifadə etmək*” deməkdir.

Bildiyimiz kimi Quran həm ləfz (söz), həm də məna etibarilə Allah kəlamıdır. Onu mükəmməl olaraq tərcümə etmək mümkün deyildir. Hər nə qədər onun təfsiri tərcüməsi mümkün olsa da, insan Quranın bütün məna və məqsədlərini kamil bir şəkildə ortaya qoya bilməz. Buna görə də alimlər Quran tərcümələrinə “*tərcümə*” deməkdən çəkinmiş və onun yerinə “*məal*” kəlməsini işlətmişlər.

## I. ÜMUMİ OLARAQ VƏHY

Qurani-kərimə görə Allah insanı digər varlıqlardan fərqli yaratmışdır. Onu müəyyən dərəcədə hürr yaratmış və etdiyi əməllərdən məsul tutmuşdur. İnsan Allahın ona verdiyi idrak gücü ilə pisi yaxşıdan, gözəli çirkindən, doğrunu yanlışdan ayıra biləcək qabiliyyətdədir. Ancaq insan, ətraf mühitin, nəfsinin istəklərinin və şeytanın təsiri ilə hər zaman Yaradanını tanımaya və əxlaqlı olmaya bilər. Allah yaratdığı insanın bu zəif nöqtələrini bildiyi üçün ona nümunəvi insanları rəhbər olaraq göndərməyi murad etmiş və onunla sözlü münasibət (vəhy) qurmuşdur. Bu, Allahın insanlara bəxş etdiyi sonsuz şəfqət və mərhəmətinin təzahürüdür. Allahın sözlü münasibəti (vəhy) ilk peyğəmbərdən başlayaraq son elçi Hz. Məhəmmədə qədər davam etmişdir.

Vəhy deyildikdə Quran və ya digər səmavi kitablar başa düşülməklə yanaşı, vəhyin mahiyyət baxımından bir-birindən fərqli növləri də vardır. Buna görə də Quran vəhyinə keçmədən əvvəl vəhy mövzusunda ümumi məlumat vermək faydalı olar.

### A. Vəhyin Tərifi

#### 1. Leksik mənası

*"Vəha"* felinin məsdəri olan vəhy sözü *"gizli və sürətli bir şəkildə bildirmək"*, *"ilham etmək"*[22], *"işarə etmək"*[23], *"fısıldamaq"*[24], *"əmr etmək"*[25],

22 Maidə 5/111, Nəhl 16/168.
23 Məryəm 19/11.
24 Ənam 6/112.
25 Fussilət 41/12, Zilzal 99/4-5.

“ *təlqin etmək* “[26], “*yazmaq*” və “*vəsvəsə vermək*”[27] mənalarını daşıyır. Məfhum olaraq vəhy, “*Uca Allahın, ümumi olaraq varlqıqlara hərəkət tərzlərini bildirməsi, xüsusi olaraq da insanlara çatdırmaq istədiyi ilahi əmr, qadağa və xəbərlərin hamısını vasitəli və ya vasitəsiz bir tərzdə, gizli və sürətli bir şəkildə peyğəmbərlərinə göndərməs*i” kimi tərif edilə bilər.

**2. Terminoloji mənası**

“*Allah-təalanın peyğəmbərlər vasitəsilə insanlara mesajlarını çatdırmasına*” vəhy deyilir. Vəhy məfhumunun Quranda işlədilməsinə nəzər saldıqda görürük ki, bu termin “bəzi şeylərin bir varlıqdan başqa bir varlığa çatdırılması” mənasına da gəlir. Bu mənada Qurani-Kərim şeytanların[28] və insanların (Hz. Zəkəriyənin)[29] vəhy etməsindən söz açır. Ancaq vəhyin bu növü hər nə qədər “*vaha*” felindən törəsə də, o ilahi vəhy deyildir.

Vəhy kəlməsinin mənşəyi barədə dilçilər müxtəlif fikirlər söyləmişlər. Bəzilərinə görə bu kəlmə ərəb mənşəli, bəzilərinə görə isə süryani mənşəlidir. Ancaq əksər alimlər vəhy kəlməsinin ərəb mənşəli olduğu qənaətindədirlər. Vəhy sözü Quranda səksənə yaxın ayədə keçir ki, bunların yetmişindən çoxunda feil şəklində işlənmişdir.

**B. Vəhyin mahiyyəti**

İslama görə vəhy Allah təalanın peyğəmbərlər vasitəsilə insanlara mesajlarını çatdırması deməkdir. Vəhy məfhumunun Quranda işlədilməsinə nəzər saldıqda bu məfhumun fərqli anlamlara gəldiyini görürük. Bunları ilahi və qeyri-ilahi vəhy olaraq iki yerə ayırmaq olar. Yuxarıda da qeyd etdiyimiz kimi Qurani-kərim şey-

26 Ənam 6/121.
27 Ənam 6/112, 121.
28 Ənam 6/112, 121.
29 Məryəm 19/11.

tanların[30] və insanların (Hz. Zəkəriyənin)[31] vəhy etməsindən söz açır. Ancaq vəhyin bu növü hər nə qədər "*vaha*" felindən törəsə də, o ilahi vəhy deyildir. Vəhy məfhumu ilə ifadə edilən bu cür vəhylərə qeyri-ilahi vəhy deyilir.

Qurani-Kərim vəhy kitabları kimi Hz. İbrahimin səhifələrindən, Hz. Musaya nazil olan Tövratdan, Hz. Davuda nazil olan Zəburdan və Hz. İsaya endirilən İncildən bəhs edir. Bundan başqa Quranda "*Züburul Əvvəlin* (*Əvvəlkilərin Kitabları*)[32] ifadəsi də keçir.

Vəhy, Allah, mələk, peyğəmbər və insan arasındakı əlaqədir. Vəhyin başlanğıc nöqtəsində Allah, bitiş nöqtəsində isə peyğəmbərlər vardır. Onlar arasındakı əlaqənin təmin olunmasında isə mələk rol oynayır. Ancaq burada son nöqtə peyğəmbərlə qurtarmır. Çünki vəhy peyğəmbərlər vasitəsi ilə insanları dünyada və axirətdə xoşbəxt etmək üçün göndərilmişdir. İlk mərhələdə mələk (Cəbrayıl) vəhyi Allahdan alır, ikinci mərhələdə isə onu peyğəmbərlərə çatdırır.

Bu mövzuda üzərində durulması zəruri olan məsələlərdən biri də mələklə peyğəmbər arasındakı əlaqənin necə qurulması məsələsidir. İslam alimləri bu məsələni əsasən iki istiqamətdə izah etmişlər. Onlara görə eyni anlaşma sisteminin olması üçün hər iki tərəfin də başa düşəcəyi ortaq bir dilin işlədilməsi lazımdır. Vəhy tarixinə nəzər saldıqda görürük ki, hər peyğəmərə vəhy öz dilində göndərilmişdir. Bundan başqa vəhy əsnasında danışan və dinləyən eyni kateqoriyaya mənsub olmalıdırlar ki, bunun da iki yolu vardır. Ya dinləyən danışanın təsiri ilə onun səviyyəsinə qalxar, ya da danışan dinləyənin səviyyəsinə enər. Hz. Mühəmməd (s.ə.s.) hər iki şəkildə də vəhy almışdır.

30 Ənam 6/112, 121.
31 Məryəm 19/11.
32 Şüəra 26/196.

Böyük İslam sosioloqu İbn Xaldun bu məsələ ilə əlaqədar olaraq belə deyir: "Vəhyin nuru ortaya çıxdıqda peyğəmbərlər ətrafındakı şeylərdən tamamilə sıyrılaraq mənəviyyata yönəlirlər və onlara baxdıqda sanki onların yatdığı və ya bayıldığı fikri hasil olur. Halbuki belə deyildir. Onlar bu şəkildə görünsələr də, əslində ruhları uca ruhlar və mələklərlə ruhani münasibət qurduqları üçün bəşəri sifətdən tamamilə ayrılırlar. Bu anda peyğəmbərlər fısıltı ilə söylənilən sözləri eşidir və anlayırlar".[33]

Bəzi hədislər də, Rəsulullahın (s.ə.s.) vəhy gəldiyi zaman çəkdiyi iztirabları, fiziki ağrıları, sarsıntıları xəbər verir. Bu rəvayətlərin birində Hz. Aişə belə deyir: "Mən onu soyuq bir gündə vəhy alarkən gördüm, alnından tər damlaları axırdı".[34] Digər bəzi hədislərdə isə mələk vəhy gətirərkən Rəsulullahın (s.ə.s.) rənginin saraldığı, bəzən titrədiyi, bayılıb yerə yıxıldığı, bəzən də iniltili səslər çıxardığı bildirilir.[35]

Vəhydə üzərində durulması lazım olan əsas məsələlərdən biri də vəhyin çox gizli və son dərəcə sürətli şəkildə gəlməsidir. Bildiyimiz kimi vəhy Peyğəmbərimizə (s.ə.s.) sadəcə tək olduğu vaxtlarda deyil, eyni zamanda səhabələri ilə birlikdə ikən də gəlirdi. Lakin ona vəhy gələrəkən yanındakılar nə mələyi mələk şəklində görürdülər, nə də onun səsini eşidirdilər. Bundan başqa vəhy son dərəcə sürətli şəkildə gəlirdi ki, peyğəmbərlərin xaricində heç bir insan bu qədər sürətli danışığı dinləyə bilmə qabiliyyətində deyildir.

33 İbn Xəldun, Müqəddimə, I/217
34 Buxari, Bədul-vəhy, 2
35 Buxari, Fəzailil-Quran, 2, Müslüm, Fəzail, 88, Əhməd b. Hənbəl, Müsnəd, I. 34, 464

## C. Vəhyin gəliş şəkilləri

Qurani-kərim Allahın insanlarla üç şəkildə əlaqə qurduğunu bildirir:

وَمَا كَانَ لِبَشَرٍ أَن يُكَلِّمَهُ اللَّهُ إِلَّا وَحْيًا أَوْ مِن وَرَاء حِجَابٍ أَوْ يُرْسِلَ رَسُولًا
فَيُوحِيَ بِإِذْنِهِ مَا يَشَاء إِنَّهُ عَلِيٌّ حَكِيمٌ

*"Allah insanla yalnız vəhy ilə və ya pərdə arxasından danışar, yaxud da Öz izni ilə istədiyini vəhy etmək üçün bir elçi göndərər. Axı O, ucadır, hökm və hikmət sahibidir."*[36] Ümumiyyətlə İslam alimləri vəhyi iki yerə ayırırlar: vasitəli vəhy və vasitəsiz vəhy.

### 1. Vasitəli vəhy

Vasitəli vəhy Allahın istədiyi şeyi vasitəçi mələk vasitəsi ilə peyğəmbərlərinə bildirməsidir. Bu da üç şəkildə olur:

**a. Cəbrayılın Hz. Peyğəmbərin qəlbinə vəhy etməsi**: Quran vəhy mələyinin Hz. Peyğəmbərə bu şəkildə iki dəfə vəhy gətirdiyini xəbər verir. Birincisi Hira mağarasında enən vəhydir ki, Allahın Rəsulu (s.ə.s.) gördüyü bu mənzərə qarşısında özündən keçmişdir.

وَلَقَدْ رَآهُ بِالْأُفُقِ الْمُبِينِ

*"And olsun ki, o (peyğəmbər), onu (Cəbrayılı) aydın üfüqdə görmüşdür"*[37] ayəsi vəhyin bu növünə işarə edir.

**b. Mələyin insan cildinə girərək vəhy gətirməsi**: Rəsulullah (s.ə.s.) belə buyurur: " ...Bəzən də mələk mənə insan şəklinə girərək gəlir, mənimlə danışır. Mən də onun söylədiyini ağlımda tuturam"[38]. Cəbrayılın bəzən "*Dihyə əl-Kəlbi*", bəzən də başqa bir insan şəklinə girərək gəldiyi rəvayət olunmuşdur.

36 Şura 42/51
37 Təkvir 81/23
38 Buxari, Bədiul Vəhy, 2.

**c. Səs vasitəsi ilə gələn vəhy**: Hz. Aişə Rəsulullahdan (s.ə.s) belə rəvayət edir: "Bəzən vəhy mənə zəng səsinə bənzəyən bir səslə gəlir. Vəhyin bu gəliş şəkli mənim üçün ən ağır olanıdır..."[39].

**2. Vasitəsiz vəhy**

Vəhy sahibi olan Allah ilə vəhyi qəbul edən şəxs arasında mələk və ya hər hansı bir başqa vasitə olmadan ortaya çıxan vəhyə vasitəsiz vəhy deyilir. Vasitəsiz vəhyə gəldikdə vəhyin bu növü də üç yerə ayrılır:

**a. Sadiq röyalar**: Hz. Aişədən belə rəvayət olunur: "Rəsulullahın (s.ə.s.) ilk vəhy alması yuxuda gördüyü sadiq röyalarla başlamışdır. Onun gördüyü hər yuxu səhərin aydınlığı kimi doğru çıxırdı"[40]. Bu rəvayətdən belə anlaşıla bilər ki, Hz. Peyğəmbər ilk vəhyi sadiq röyalar vasitəsi ilə almışdır. Ancaq bu Quranın ilk vəhyinin Ələq surəsinin ilk beş ayəsi olması xəbəri ilə ziddiyət təşkil edir. Bu ziddiyəti İslam alimləri həll etməyə çalışmışlar. Belə ki, onlara görə Hz. Aişədən gələn rəvayətdə zikr edilən vəhy şəkli Hz. Peyğəmbərə peyğəmbərliyə hazırlıq dövründə gəlmişdir. Ələq surəsinin ilk beş ayəsi isə Hira mağarasında nazil oldu və beləliklə Rəsulullaha (s.ə.s.) nübüvvət verildi.

**b. İlham yolu ilə gələn vəhy**: Bu hər hansı bir vasitə olmadan vəhyin Hz. Peyğəmbərin (s.ə.s.) qəlbinə endirilməsidir. Alimlərə görə

إِنَّا أَنزَلْنَا إِلَيْكَ الْكِتَابَ بِالْحَقِّ لِتَحْكُمَ بَيْنَ النَّاسِ بِمَا أَرَاكَ اللّهُ...

"*İnsanlar arasında Allahın sənə göstərdiyi ilə hökm edəsən deyə Kitabı sənə haqq olaraq endirdik...*"[41] ayəsi vəhyin bu növünə dəlalət edir.

39 Buxari, Bədiul Vəhy, 2
40 Buxari, Bədiul Vəhy, 1
41 Nisə 4/105

**c. Pərdə arxasından danışmaq**: Bu sadəcə Hz. Mühəmməd və Hz. Musaya məxsus vəhy alma şəklidir. Buradakı danışma bizim bildiyimiz danışıq tərzi olmayıb insanların düşüncə və duyğularının xaricində olan bir danışıq tərzidir.

## II. QURANİ-KƏRİM (QURAN VƏHYİ)

Qurani-kərim, Hz. Adəmdən Hz. Mühəmmədə (s.ə.s.) qədər insanlığa göndərilən səmavi mesajların sonuncusudur. Bir çox yönü ilə fərqlənən Quranın son ilahi mesaj olması, onun önəm və qiymətini daha da artırmaqdadır. Quran elmləri ilə məşğul olanların onu hər yönü ilə tanımaları vacibdir. Çünki onu tanımadan təfsir və təfsir üsulu kimi elmlərdən bəhs etmək qeyri-mümkündür.

### A. Quranın tərifi

#### 1. Quran kəlməsinin leksik mənası

Quran kəlməsinin heç bir kökdən törəmədiyini iddia edənlər kimi, onun həmzəsiz və ya həmzəli bir kökdən törədiyini iddia edənlər də olmuşdur. Bunları aşağıdakı kimi qruplaşdırmaq olar:

1. İmam Şafii (vəfatı-204/819) Quran sözünün heç bir kökdən əmələ gəlmədiyini, onun da Tövrat və İncil kimi Allahın kəlamına verilən xüsusi bir ad olduğunu söyləmişdir.

2. Əbu Zəkəriyyə əl-Fərra (vəfatı-207/822) isə Quran kəliməsinin "*qərinə*" sözünün cəmi olan və "*dəlil*" mənasına gələn "*qərəin*" sözündən törədiyini iddia etmişdir. Çünki Quran ayələri nəzm, vəzn və ahəng baxımından bir-birinə bənzəyir və bir-birinə dəlildirlər.

3. Əbu Həsən əl-Əşəri (vəfatı-324/936) isə Quran kəlməsinin "*bir şeyi başqa bir şeyə yaxınlaşdırmaq*" mənasına gələn "*qarənə*" felindən əmələ gəldiyini demişdir. Bunu da Qurandakı surə və ayələrin bir-biri ilə yaxın olmasıyla izah edir.

Quran kəlməsinin həmzəli bir kökdən törədiyini iddia edənlər iki fərqli görüş mənimsəmişlər:

1. Əbu İshaq əz-Zəccaca (311/923) görə Quran kəlməsi "*toplamaq*" mənasına gələn "*əl-qarü*" məsdərindən törəmişdir. Bu görüş sahiblərinə görə Quran qissə, əmr, qadağa, vəd, vəid, surə və ayələri bir yerə topladığı üçün bu adı almışdır.

2. Əbu Həsən Lihyani (vəfatı-215/830) isə bu kəlmənin "*oxudu*" mənasına gələn "*qaraə*" felindən törədiyini söyləmişdir. İslam alimlərinin bir çoxu da məhz Lihyanin bu fikri ilə razılaşmışlar.

**2. Terminoloji mənası**

Bir-birindən fərqli təriflər verilən Quranı belə tərif etmək olar: "*Hz. Peyğəmbərə (s.ə.s.) vəhy vasitəsi ilə endirilib səhifələrə yazılan, təvatürlə nəql edilən və oxunuşu ilə ibadət olunan möcüzəvi bir kəlamdır*".

-"Hz. Peyğəmbərə endirildi" ifadəsi digər ilahi kitabları və Hz. Peyğəmbər tərəfindən söylənən sözləri öz əhatəsi xaricində saxlayır.

-"Vəhy vasitəsi ilə endirildi" ifadəsi, onun ilahi mənşəli olduğunu göstərir.

-"Səhifələrə yazılan" sözü, Qurandan sayılmayan heç bir kəlam və kəlmənin Müshəfə daxil olmadığını göstərir.

-"Təvatürlə nəql edilən" ifadəsi, həm söz, həm də məna etibarilə mütavatir olmayan qiraətlərin Qurandan sayılmayacağını ifadə edir.

-" Oxunuşu ilə ibadət edilən" ifadəsi isə, Quranın özü xaric, nə onun məal və təfsiri, nə də qüdsi hədisləri oxuyaraq ibadət etməyin mümkün olmadığını göstərir.

## B. Quranın digər adları

Zərkəşi Quranda Quranın 55 fərqli adının keçdiyini söyləyir. Bu rəqəmi 90-a qədər çıxaranlar da vardır. İndi isə Quranın adlarının bir hissəsini tək-tək ələ alaq.

### 1. Kitab

Quranda *əl-Kitab* kəlməsi ümumi mənada bütün peyğəmbərlərə gələn vəhy və ya vəhylər mənasında işlənir. Quran özündən əvvəlki vəhylərə kitab dediyi kimi, özünü də *kitab* adlandırır. O, açıq və hikmətli kitabdır.

Quran nazil olmağa davam etdiyi zamanda da özünü kitab olaraq tanıtmışdır. Bu da vəhyin hələ davam edəcəyinə və ayələrin axırda kitab halında toplanacağına işarə edirdi. Bildiyimiz kimi nazil olub qurtardıqdan qısa müddət sonra Quran kitab şəklinə salınmışdır.

### 2. Furqan

*Furqan* kəlməsi arami dilində olub "ayırmaq" mənasına gəlir. Furqan surəsinin 1-ci ayəsində belə buyururlur:

*Aləmləri (insanları və cinləri Allahın əzabı ilə) qorxutmaq üçün (haqqı batildən ayıran) Quranı Öz bəndəsinə (Muhəmmədə) nazil edən Allah nə qədər (uca, nə qədər) uludur! (Ucalardan ucadır; əzəli və əbədidir, xeyir-bərəkəti bol və daimidir!)*

Qurana Furqan deyildikdə onun yaxşını pisdən, gözəli çirkindən, saleh olanı saleh olmayandan, haqqı batildən, nizamı xaosdan, halalı haramdan, günahı səvabdan, doğrunu yanlışdan, saxta tanrıları Allahdan, qaranlığı aydınlıqdan, baqini fanidən və başqa şeyləri bir-birlərindən ayırması nəzərdə tutulur.

### 3. Zikr

*Zikr* lüğətdə "xatırlamaq, anmaq, bir şeyi daim zehində tutmaq, bildirmək, xəbər vermək, tələffüz etmək" kimi mənalara gəlir. Quranın digər bir adı olan *Təzkir* də eyni kökdən gəlir və xatırlama, birinin diqqətini çəkmə, işarə etmə deməkdir.

Quran özünü *Zikr* adlandırır. Bəzi ayələrdə isə Qurana *əz-Zikrul-Həkim* deyilir. Yəni o hikmətli ifadələrlə dolu zikrdir.

### 4. Nur

Quran, Tövrat və İncilə *Nur* dediyi kimi, özünə də *Nur* deyir. Rağib əl-İsfəhani nuru "görməyə yardım edən işıq" kimi tərif etdikdən sonra dünyadakı nuru iki yerə ayırır. Biri gözlə görünən və gözün görməsini təmin edən nur, digəri isə bəsirət gözü ilə fərq edilən nurdur. Bu da ağlın və Quranın nurudur. Yəni Quranın nuru mənəvi, tövhidi və əxlaqi mənada insanları aydınladan nurdur.

### 5. Hüda

Quran həm doğru yolu göstərir, həm də doğru olana aparır. Bu mənada o, "hüdən lin-nəs" vəsfi ilə bütün insanlara haqqı və həqiqəti göstərir. "Hüdən lil-müttəqin" sifəti ilə isə onun göstərdiyi yolda gedə bilən insanları həqiqətə və səadətə çatdırır.

### 6. Bəyan

Nəhl surəsinin 89-cu ayəsində Quranın hər şeyi açıqladığı, hər şeyi izah etdiyi bildirilir. Burada qəsd olunan məna Quranın, insanın dini və əxlaqi məsələlərdəki əsas ehtiyaclarına cavab verən izahlardır. Quran insanların bu dünya və axirətdə xoşbəxt olmaları üçün lazım olan əsas məsələləri ələ almışdır. Quranın hər şeyi izah etdiyi deyildikdə isə, onun bütün məsələləri təfərrüatları ilə izah etməsi başa düşülməməlidir. Bəyan adı, Quranın, insan üçün çox əhəmiyyətli olan məsələləri açıqladığını bildirir.

### 7. Şəfa

Quranın digər bir xüsusiyyəti onun qəlblərdə olana[42] və möminlərə şəfa olmasıdır[43]. Allah təala Quranda qəlblərin İslama açılmasından, qəlblərin qatılaşmasından, qəlblərdəki əxlaqi və mənəvi xəstəliklərdən bəhs edir. Şəfa adını daşıyan Quran gözəllikləri, haqqı və həqiqəti görə bilmə qabiliyyətini itirən qəlbləri bu mənfi xislətlərdən xilas olmağa və onları göylərin və yerin Nuru olan Allaha yönəlməyə çağırır.

Quranın möminlərə Şəfa olması dedikdə isə, onun, müxtəlif çətinliklərlə qarşılaşan, bəzən ümidsizliyə düşən, bəzən də bədbin olan möminlərə dərman ola biləcək ifadələrə yer verməsi nəzərdə tutulur.

## C. Quranın nüzulü

Quranın nüzulundan bəhs edərkən hər nə qədər ilk olaraq Allah və Hz. Peyğəmbər yada düşsə də, əslində burada dörd tərəfin var olduğunu söyləsək yanılmarıq. Bu dörd tərəf də vəhyin qaynağı (Allah), vəhy mələyi (Cəbrayıl), vəhyi təbliğ etmə ilə vəzifələndirilən Hz. Peyğəmbər və bütün insanlardır.

### 1. Quranın vəhy məlyinə nəqli

İslam alimlərinin Quran vəhyinin Cəbrayıla nəqli mövzusunda üç fərqli görüşü vardır:

1. Cəbrayıl Quranı Lövhi-Məhfuzdan almışdır.

2. Bəzi mələklər Quran vəhyini iyirmi gecədə Cəbrayıla gətirmişlər.

42 Yunus, 10/57
43 İsra, 17/82, Fussilət, 41/44

3. Quranı Cəbrayıl şəxsən Allahdan dinləyərək əxz etmişdir. Ən çox qəbul edilən görüş də bu görüş olmuşdur.

### 2. Quranın Hz. Peyğəmbərə endirilməsi

Qurani-kərimin vəhy edilmiş kitab olduğu Şura surəsinin 7-ci ayəsində belə bildirilir:

*(Ya Peyğəmbər!) Şəhərlərin anası (olan Məkkə) əhlini və onun ətrafındakıları (bütün başqa insanları) haqqında heç bir şübhə olmayan (bütün məxluqatın bir yerə cəm olacağı) toplanış (qiyamət) günü ilə qorxutmağın üçün beləcə sənə ərəbcə Quran vəhy etdik. (Axirətdə insanların) bir qismi (möminlər) Cənnətdə, bir qismi (kafirlər) isə Cəhənnəmdə olacaqdır!*

Mənbələrin bildirdiyinə görə ilk vəhy miladi 610-cu ildə, Hz. Peyğəmbər Hira mağarasında ikən gəlmişdir. Hz. Peyğəmbər risalətin ağırlığını daşımaq üçün sanki əvvəlcədən hazırlanırdı. O Hira mağarasında ruhi və mənəvi cəhətdən kamilləşirdi. Yenə bir gün Hira mağarasında olarkən o zamana qədər qarşılaşmadığı bir şeylə qarşılaşır. Cəbrayıl gəlir və ona "oxu" deyir. O oxuya bilmədiyini söyləyir. Mələk onu üç dəfə sıxaraq "oxu" deyir və Ələq surəsinin ilk beş ayəsini oxuyur.[44] Beləliklə Quran vəhy olunmağa başlayır.

Hz. Peyğəmbərin Cəbrayıldan vəhyi necə aldığı mövzusunda da fərqli görüşlər ortaya atılmışdır:

1. Quran vəhyi Lövhi-Məhfuzdan "Betyul-izzətə", yəni dünya səmasına, oradan da fasilələrlə iyirmi üç il ərzində Hz. Peyğəmbərə nazil olmuşdur.

44 Əhməd ibn Hənbəl, *Müsnəd*, VI, 232, 233, Buxari, *Səhih*, I, 3

2. Quran Qədr gecəsindən başlayaraq təqribən iyirmi üç ildə meydana gələn hadisələrə görə müxtəlif zamanlarda Hz. Mühəmmədə endirilmşdir.

3. Quran iyirmi üç Qədr gecəsində dünya səmasına endirilmş və hər Qədr gecəsi Allahın o bir Qədr gecəsinə qədər təyin etdiyi miqdarda enmişdir. Oradan da Hz. Peyğəmbərə nazil olmuşdur.

Əz-Zərkəşi isə bu görüşlər içərisində ən doğru olanın birinci görüş olduğunu və alimlərin əksəriyyətinin də bu görüşü qəbul etdiklərini söyləyir. Bu görüşü mənimsəyənlərin dəlili İbn Abbasdan nəql edilən " Quran dünya səmasına Qədr gecəsində topdan endirildi. Oradan da iyirmi üç il ərzində hissə-hissə nazil oldu".[45] Lakin bu fikrə qarşı çıxan alimlərdə vardır. Onlar ikinci görüşün ağla daha uyğun olduğu qənaətindədirlər.

### 3. Quranın tədricən endirilməsinin hikməti

Qurani-kərim topdan deyil, iyirmi üç il ərzində tədricən endirilmişdir. Vəhy zəncirinin son halqası olan Quran hər hansı bir zamana aid olmayıb endiyi andan etibarən bütün zamanlara və bütün bəşəriyyətə xitab edir. O nazil olarkən bir tərəfdən nazil olduğu dövrün cəmiyyətinin ehtiyaclarına cavab vermiş, digər bir tərəfdən də ümumi mənada fərdlərin və cəmiyyətlərin möhtac olduqları beynəlmiləl prinsiplər gətirmişdir. Son ilahi vəhyin məqsədi bu olduğu üçün o, endirildiyi cəmiyyəti bütün bəşəriyyətə nümunə olacaq "ideal bir ümmət" səviyyəsinə gətiməli idi. Buna görə də Quran həmin cəmiyyəti formalaşdırmaq üçün tədricilik metodundan istifadə etmişdir. Tədrici şəkildə nazil olan Quran bir tərəfdən "iman-əxlaq" zəminini formalaşdırarkən, digər tərəfdən də müəyyən vaxtlarda daimi və ümumi hökümlər gətriməyə davam etmişdir.

45 Təbəri, Camiul-bəyan, XXX/166.

Quranın tədricən nazil olması onun yeni baş verəcək hadisələrə paralel olaraq endirilməsi ilə əlaqədardır. Bu da fərdi və ictimai inkişafın ilahi iradə istiqamətində formalaşması deməkdir. Çünki Quran endiyi cəmiyyəti bütün bəşəriyyətə nümunə olması üçün hazırlayırdı.

Quranın tədricən endirilməsininə eyni zamanda asanlıq və çətinlik prespektivindən də yanaşmaq lazımdır. Quran asandan çətinə metodunu tətbiq etmişdir. Bunlardan başqa Quranın belə fasilələrlə enməsi İslam hüquqçuları üçün çox əhəmiyyətlidir. Belə ki, onlar hökm çıxararkən ayələrin nüzulu əsnasındakı xüsusiyyətləri diqqətə alır və səbəblərlə hadisələr arasında əlaqə qura bilirlər. Bu da ayələrin mənalarının anlaşılmasını, təfsirini və onlardan hökm çıxarmağı asanlaşdırır.

Tədricilik metodunun tətbiq olunmasının ən əsas səbəblərindən biri də Quranın beynəlmiləl bir kitab olmasıdır. Çünki onun tətbiq olunduğu cəmiyyət ideal bir cəmiyyət olmuş və bu cəmiyyət özündən sonra gələcək bütün cəmiyyətlərə örnək təşkil etmişdir.

### D. Quranın fəsilləri

Qurani-kərim digər kitablar kimi qısa bir müddətdə tərtib və təsnif edilməmişdir. Onun mövzuları iç-içədir. Bunun da səbəbi Allah kəlamının endiyi dövrün dini, əxlaqi, siyasi, iqtisadi, ictimai və s. şərtlərini göz önündə tutmasıdır. Quran mətni əsasən iki bölümdən ibarətdir. Bunlar ayələr və surələrdir:

#### 1. Ayə

Ayə lüğətdə *" hər hansı bir şeyin varlığını göstərən əlamət"* mənasına gəlir. Bundan başqa *"açıq işarə"*, *"dəlil"*, *"ibrət"* və *"möcüzə"* kimi anlamları da vardır. Termin olaraq da *"bir və ya birdən çox cümlədən*

*meydana gələn, əvvəli və sonu olan Quran bölməsi*" kimi tərif edilmişdir. Ayələr də öz arasında iki yerə ayrılır:

*1. Kövni ayələr:* Kainatdakı her şeyi kövni ayə adlandıra bilərik. İnsan, günəş, ay, planetlər və s. hər biri bir ayədir. Bu ayələrə "feli", "təkvini" və "elmi" ayələr də deyilir.

*2. Qövli ayələr:* Peyğəmbərlərə endirilən bütün ilahi kitablar, o cümlədən Qurani-kərim də qövli ayələrdir. Bu ayələr eyni zamanda "təşrii", "tənzili" və "vəhy" ayələr adlandırılır. Bu növ ayələri alimlər, "*məkki-mədəni*", "*ərzi-səmavi*", "*hazari-səfəri*", "*nəhari-leyli*", "*sayfi-şitəi*", "*firaşi-növmi*" kimi qruplara bölmüşlər.

Quranda ayələrin sayı haqqında alimlər arasında yekdil fikir yoxdur. Bəziləri onların sayının 6600 olduğunu qeyd edərkən, bəziləri bu rəqəmin 6204, 6214, 6219 və s.kimi olduğunu söyləmişlər. Ayələrin sayındakı bu fərqliliyin səbəbi bəzi ayə sonlarının, surələrin başında yazılan bəsmələnin ayə sayılıb-sayılmamasından və hürufu-müqəttəənin müstəqil ayə kimi qəbul edilib-edilməməsindən qaynaqlanır.

Ayələri bir birindən ayıran son kəliməyə "*fasilə*", bu kəlimənin son hərfinə də "*hərfu-fasilə*" deyilir. Quranın ən uzun ayəsi "*müdayənə ayəsi*" deyilən Bəqərə surəsinin 282-ci ayəsidir. Ən qısa olan ayələri isə Yasin 36/1, Rəhman 55/1, 64, Müddəssir 74/21, Fəcr 89/1, Duha 93/ 1, Əsr 103/1 ayələridir.

İlk nazil olan ayələr Ələq surəsinin ilk beş ayəsi, Bəqərə 281, Maidə 3, Nisə 176, Nəsr 1-3 ayələrinin hər birinin isə son nazil olan ayələr olduğu haqqında rəvayətlər vardır. Ayələr endikləri yer və məkana görə də iki yerə bölünürlər: Məkki və mədəni ayələr.

### a. Məkki ayələr

Qeyd olunduğu kimi Quran iyirmi üç il ərzində nazil olmuşdur. Bunun on üç ilini Hz. Peyğəmbər Məkkədə, on ilini isə Mədinədə yaşamışdır. Quran Məkkədə, Mədinədə və digər şəhərlərdə nazil olmuşdur. Ancaq alimlər ayələri əsasən iki qrupda, məkki və mədəni ayələr olaraq ələ almışlar. Hz. Peyğəmbərin Mədinəyə hicrətinə qədər enən ayələr məkki ayələr adlandırılmışdır.

Quran nazil olmağa başlayanda Məkkə cəmiyyətində sosial və iqtisadi tarazlıq pozulmuş, əxlaqi səviyyə çox aşağı idi. Məkkədə qatı bütpərəstlik etiqadı və qəbiləvi, maddəçi əxlaq anlayışı hakimdi. Quran Məkkədə əvvəlcə bu mənfi xüsusiyyətlərə sahib insanları vəhy təlimi ilə tərbiyə etməyi özünə hədəf qoymuşdu. Bu təlim sayəsində Quran məsuliyyətli, bilgili, doğru və ədalətli fərdlər yetişdirmək istəyirdi. Buna görə də Quranın ilk dövrdəki çağırışı cəmiyyətdə sosial və iqtisadi ədaləti təmin etməkdi.

Quranın Məkkə dövründə enən ayələrinin üzərində durduğu əsas mövzulardan biri pozulmuş Allah etiqadını düzəltməkdi. Ərəblər Hz. İbrahimin gətirdiyi Hənif dinini təhrif edərək şirk dininə çevirmişdilər. Buna görə də məkki ayələrdə tövhid etiqadı ön plana çıxarılmışdı. Məkkə dövrünün əvvəllərində enən Tur, Müzzəmmil və İxlas surələrində əsasən Allahın qüdrəti, Onun kərəmi və lütfü vurğulanmışdır. Bu ayələrdə Onun xaricindəki hər hansı bir varlığa tanrılıq isnad etmənin yanlışlığı ortaya qoyulmuşdur.

Quranın bu dövrdə üzərində durduğu mövzulardan biri də axirət mövzusudur. Müşriklər öldükdən sonra təkrar dirilməyə inanmırdılar: *"Qaf! (Ya Peyğəmbər!) Şanlı Qurana and olsun (ki, Məkkə*

*müşrikləri sənə iman gətirmədilər)*!"[46] Quran müşriklərin təkrar dirilmənin mümkünsüzlüyünə dair iddialarını rədd etmişdir.[47]

Yenə məkki surələrdə qiyamət və axirət təsvirləri, inkarçıların acı aqibəti və möminlərə veriləcək mükafatlar geniş şəkildə anlatılmışdır.[48] Qeybi mövzular, cənnət və cəhənnəm təsvirləri əsasən bu ayələrdə yer alır.

Məkkə dövründə ibadətlər də formalaşmağa başlamışdır. Əvvəlcə müxtəlif ayəılərdə ibadət şüuru formalaşdırılmış, əxlaqi və mənəvi kamilliyə aparan davranışlara diqqət çəkilmişdir. Məkki ayələrdə namaz və zəkat üzərində durulmuşdur.

Məkki ayələrdə qissələr də mühüm yer tutur. Məkki ayələr mədəni ayələrə görə daha qısadır.

**b. Mədəni ayələr**

Endiyi məkandan asılı olmayaraq hicrətdən sonra nazil olan ayələrə də mədəni ayələr deyilmişdir. Mədəni ayələrdə işlənən mövzuların başında siyasət və hüquq məsələləri gəlir. Bu ayələrdə əsasən sosail nizamla əlaqədar əmrlər vardır. Belə ki, adam öldürmə, oğruluq və zina üçün cəzalar bu ayələrlə bildirilmiş, ailə, evlənmə, boşanma, miras və s. məsələlər bunlarla açıqlanmışdır.

Bu dövrdə nazil olan ayələrdə iqtisadi sahəyə aid bəzi qaydalar da qoyulmuşdur. Mədinədə Məkkə dövründə fərz olunan namaza və zəkata oruc və həcc ibadətləri də əlavə olunmuşdur. Digər dini topluluqlarla münasibətlər haqqındakı ayələr də məhz Mədinədə nazil olan ayələrdir. Bu ayələrdə müsəlmanların yəhudilərlə, xristianalarla və digər din mənsubları ilə münasibətləri ələ alınmışdır.

46 Qaf, 50/1

47 Möminun, 23/79-90, Yasin, 36/48-54, 78-83, Saffat, 37/16-39

48 Tur, 52/7-28, 45-48, Haqqə, 69/13-37, Məaric, 70/1-16, Təkvir, 81/1-14, İnfitar, 82/1-19, Leyl, 92/5-21, Zilzal, 99, 1-8

Mədəni ayələr daha uzun olub, ictimai məsələləri ələ aldıqları üçün ədəbi üslüb daşımırlar. Quranın 65-70%-ini məkki, 30-35%-ini mədəni ayələr təşkil edir.

Məkki və mədəni ayələrin fərqləndirilməsi ilə əlaqədar olaraq müsəlman alimləri bəzi meyarlar təklif etmişlər:

1. Məkki ayələri əqidə məsələləri ilə, xüsusilə tövhid, vəhy, nübüvvət, məad, habelə ən mühim əxlaqi məsələlərlə əlaqədar olaraq nazil edilmişdir.

2. Mədəni ayələrdə isə əsasən əhli-kitabın iddialarına cavab verilir, münafiqlərin tutduqları mövqe pislənir. Bu ayələrdə həmçinin möminlərin həyatı ilə bağlı hökmlər ehtiva olunur.

Məkki və mədini ayələri bilmək müfəssirə və mütərcimə hansı Quran ayələrinin əvvəl, hansılarının isə sonra nazil edilməsi barədə fikir hasil etməyə imkan verir. Alimlər hansı ayənin hansı ayədən sonra endiyinin müəyyənləşdirilməsinin qeyri-mümkün olduğunu söyləsələr də, surələrin xronoloji ardıcıllığını təxmini olsa da müəyyənləşdirməyə çalışmışlar. Onlar doxsan surənin Məkkədə, iyirmi dörd surənin isə Mədinədə nazil olduğu nəticəsinə gəlmişlər. Lakin həm məkki, həm də mədəni surələrdə qeyri-məkki və qeyri-mədəni ayələrin olduğu şübhəsiz bir həqiqətdir.

**2. Surə**

*"Surə"* lüğətdə *"yüksək məqam"*, *"üstün dərəcə"*, *"şan"*, *"şərəf"*, *"binanın mərtəbələri"* kimi mənalara gəlir. Termin olaraq da *"ayələrdən meydana gələn, əvvəli və sonu olan müstəqil Quran bölməsi"* şəkıində tərif edilmişdir. Quranda 114 surə vardır ki, bunların ən qısa olanı üç ayədən ibarət olan Kövsər surəsi, ən uzun olanı isə 286 ayədən meydana gələn Bəqərə surəsidir.

Surələrin adları qissələrdə keçən şəxslərin və haqqında bəhs etdikləri cəmiyyətlərin adlarından və ya əhatə etdikləri mövzulardan və yaxud da bəzi surələrin əvvəlində yerləşən müqəttəə hərflərindən götürülmüşdür. Hər nə qədər surə adlarının həm tövqifi, həm də ictihadi olduğu söylənmişsə də, bu adların ictihadi olduğunu söyləmək daha doğru olardı. Çünki bəzi surələrin birdən çox adı vardır. Sadəcə Fatihə surəsinin iyirmiyə qədər adı məlumdur.

Ehtiva etdikləri ayələrin sayına görə də surələrə bəzi adlar verilmişdir. Yüzdən çox ayənin olduğu Quran surələrinə "*tuvəl*", təxminən yüz ayənin olduğu surələrə "*miun*", yüzdən az ayə olan surələrə "*məsani*", daha kiçik surələrə də "*müfəssəl*" surələr deyilir.

### E. Quran mətninin tərtibi

Quranın tərtibindən məqsəd onun ayə və surələrinin düzülüşündə hansı meyarların əsas alınması məsələsidir. Bilindiyi kimi Quranın ayə və surələri enməyə başladığı andan etibarən ard-arda deyil, Hz. Peyğəmbərin göstərdiyi şəkildə tərtib edilmişdir.

#### 1. Ayələrin tərtibi

Ayələrin ilahi tərtiblə tərtib olunduğuna dair İslam alimləri arsında ittifaq vardır. Bu tərtibə tövqifi tərtib deyilir. Tərtib işində Hz. Peyğəmbərin və səhabilərin ictihadı olmamışdır. Hz. Peyğəmbər namazlarda və digər yerlərdə ayələri Cəbrayıl tərəfindən bildirilən tərtibə görə oxumuşdur. Məkki ibn Əbu Talibin (437/1045) bildirdiyinə görə, ayələrin müəyyən bir tərtiblə düzülməsi və surələrin əvvəlinə bəsmələnin qoyulması Hz. Peyğəmbərin əmri ilə olmuşdur. Buna görə də Rəsulullah (s.ə.s.) əmr etmədiyi üçün Tövbə surəsinin əvvəlinə bəsmələ qoyulmamışdır.

Bir rəvayətdə Hz. Peyğəmbərin belə buyurduğu bildirilir: "Kim gecə əl-Bəqərə surəsinin son iki ayəsini oxuyarsa, bu ona kifayətdir".[49] Başqa bir rəvayətdə isə Hz. Peyğəmbərin Dəccalın ortaya çıxışında ondan qorunmaq üçün Kəhf surəsinin ilk on ayəsini oxumağı tövsiyə etdiyi[50] nəql olunur ki, bütün bunlar Quran ayələrinin tərtibinin ictihadi deyil, tövqifi olduğunu göstərir.

Səhabilər də Quranı Rəsulullahdan (s.ə.s) eşitdikləri kimi əzbərləmiş, yazmış və ilahi tərtibi mühafizə etmişlər. Hz. Əbu Bəkr zamanında Quran kitab şəklinə gətirilərkən, daha sonra Hz. Osman dövründə Quranın nüsxələri çoxaldılarkən bu tərtib olduğu kimi qorunmuş və heç bir dəyişiklik olunmadan günümüzə qədər gəlib çatmışdır.

**2. Surələrin tərtibi**

İslam alimləri surələrin tərtibi mövzusunda müxtəlif fikirlər ortaya atmışlar. Səslənən bu fikirləri üç başlıq altında toplamaq mümkündür:

**a. Surələrin tərtibi ictihadidir.**

Bu qrupda yer alan alimlərin başında İmam Malik (vəfatı 179/795) gəlir. Baqillani də bu fikri dəstəkləmişdir. Bu görüşü müdafiə edənlər Hz. Osmanın Quranı çoxaldarkən surələri yenidən tərib etdirməsini və Hz. Əli, Abdullah İbn Məsud Və Übey İbn Kəb kimi xüsusi Quran nüsxələri olan səhabilərin hər birinin nüsxəsində surələrin fərqli şəkildə tərtib olunmasını əsas gətirirlər.

49 Müslüm, Səlatul-müfəssirin, 256
50 İbn Kəsir, *Təfsir*, III/70-71

**b. Surələrin tərtibi tövqifidr, yəni ilahidir.**

Əl-Ənbari, Əlusi, Kirmani kimi alimlər ayələrin tərtibinin tövqifi olduğunu söyləmişlər. Bu görüşdə olanlara görə Cəbrayıl vəhy gətirərkən hər surənin yerini Hz. Peyğəmbərə bildirmişdir.

**c. Surələrin bir qismi tövqifi, bir qismi isə ictihadidir.**

Onlara görə surələrin bir hissəsi Hz. Peyğəmbər tərəfindən tərtib olunmuş, digər hissəsi də ümmətin həvaləsinə buraxılmışdır. Məsələn İbn Atityyə (546/1151), "Səbut-Tival", "Həvamim/yeddi hamim" və "müfəssəl" kimi bir çox surənin Hz. Peyğəmbərin ictihadı ilə, digər surələrin isə müsəlmanlar tərəfindən tərtib olunduğunu söyləmişdir. İbn Hacər də (852/1448) də, "surələrin bir hissəsinin ictihadi olması, digər hissəsinin də tövqifi olmasına mane deyildir"-deyərək yuxarıdakı görüşü dəstəkləmişdir.

İslam alimlərinin bir çoxu bu görüşlər içərisində birinci görüşün daha müvafiq olduğunu söyləyirlər.

**F. Quranın əsas mövzuları**

Qurani-kərim insanların ehtiyaclarına və hadisələrin inkişafına görə fərqli vaxtlarda nazil olduğu üçün müxtəlif mövzulardan bəhs edən ayələr ard-arda düzülmüş və mövzu bütünlüyü əsas alınmamışdır. Quranın ələ aldığı mövzular müxtəlif surələrə yayılmışdır. Buna görə də Quranı oxuyanlar və ya dinləyənlər bir çox mövzu ilə qarşılaşırlar. Quranın bu üslubu əslində çox təsirlidir. Lakin bu Quranın mövzularını müəyyən başlıqlar altında toplamamızı çətinləşdirir.

İslam alimləri Quranın mövzularını müxtəlif başlıqlar altında təsnif etməyə çalışmışlar. Bəzi alimləri bütün mövzuları sadəcə bir neçə başlıq altında toplayarkən, bəziləri də yüzlərlə başlıqdan istifadə etmişlər. Məsələn, müfəssir Təbəri, Quranın, Allahın varlığı

və birliyi (tövhid), xəbərlər, qissələr və dinlə əlaqədar hökmlərdən ibarət olduğunu söyləmişdir. Zəməxşəri isə Qurandakı mövzuları, Allahı tanıdan ayələr, ibadətlər, əmir və qadağalar, axirət (vəd və vaid) deyə təsnif etmişdir. Razi də ona oxşar başlıqları seçmişdir: ilahiyyat, axirət (məad), peyğəmbərlik (nübüvvət), qəza və qədər. Əbu Bəkir İbn Ərəbi isə Quran ayələrini tövhid, təzkir və əhkam başlıqları altında toplamış və bu başlıq adlarını belə izah etmişdir:

Tövhid: Məxluqata və Allahın ad, sifət və feillərinə dair mövzuları əhatə edir.

Təzkir: Mükafatlandırma vədi və cəzalandırma təhdidi, Cənnət və Cəhənnəm, batini və zahiri təmizlik mövzularından ibarətdir.

Əhkam: Məsul olduğumuz şeylər, faydalı və zərərli şeylərin nələr olduğu, əmrlər, qadağalar və məndublar kimi mövzular bu başlıq altında incələnir.

Halis Albayrak isə Quranın əsas mövzularını aşağıdakı şəkildə təsnif etmişdir:

1. Allah-aləm münasibətləri.

2. Allah-insan münasibətləri

3. İnsan-insan münasibətləri

4. İnsan-aləm münasibətləri

Biz bu alimlərin təsnifatları içərisindən aşağıdakı təsnifatı seçirik və mövzuları da bu təsnifata görə ələ alırıq[51]:

### 1. Quranda əsas qavramlar və etiqadlar

Qurani-kərimin üzərində durduğu əsas mövzu Allah etiqadıdır. İnsanın və yaradıcısının kim olduğu, insanın harada yaşadığı

51 Bu təsnifat üçün bax. Mehmet Paçacı, *Kurana Giriş*, s. 61-68.

və aqibətinin necə olacağı mövzuları bu başlıq altında ələ alına bilər. Allah bütün məxluqatın Yaradıcısı və Rəbbidir. O, hər şeyə qadirdir. Kainatı yaratmış, dünyanı yoxdan var etmişdir. Yaratdıqlarından biri olan insanı bura yerləşdirmiş və təbiəti də onun əmri altına vermişdir. İnsan bu dünyada şüurlu varlıq kimi yaşadıqdan bir müddət sonra öləcək və dünyada işlədiyi əməllərə görə Allaha hesab verəcəkdir. Qurandakı bu təməl qavram və etiqadlardan əsas olanları belə sıralaya bilərik:

**a. Allah etiqadı**

Qurana görə Allah, hər şeyi yaradan, hər şeyə gücü çatan, bənzəri olmayan, tək olan Tanrıdır. Bütün kainatı o xəlq etmişdir:

"Həqiqətən, göylərdə və yerdə möminlər üçün ibrətlər vardır! Sizin yaradılışınızda və (Allahın yer üzünə) yayıb səpələdiyi canlılarda tam yəqinliklə inananlar üçün (Allahın birliyinə, qüdrət və əzəmətinə, qiyamət gününün haqq olmasına dəlalət edən) əlamətlər vardır. Gecə və gündüzün bir-birinin ardınca gəlib-getməsində, Allahın ruzi vermək üçün göydən yağış yağdırmasında, onun vasitəsilə yeri ölümündən (quruduqdan) sonra diriltməsində və küləkləri (müxtəlif tərəflərə) yönəltməsində ağılla düşünənlər üçün (Allahın hər şeyə qadir olmasını sübut edən) dəlillər vardır.

*(Ya Peyğəmbər!) Bunlar Allahın ayələridir (qüdrət nişanələridir). Biz onları (Cəbrail vasitəsilə) sənə doğru oxuyub bildiririk. Bəs onlar Allaha və Onun ayələrinə (Qurana) inanmadıqdan sonra hansı kəlama inanırlar?"*[52]

Allah insanın doğru yolu tapması üçün ona peyğəmbərlər və kitablar göndərmişdir:

*"Peyğəmbər Rəbbi tərəfindən ona nazil edilənə (Qurana) inanmış və möminlər də iman gətirmişlər. (Onların) hamısı Allaha, Onun mələklərinə,*

52 Casiyə, 45/3-6

*kitablarına və (bütün) peyğəmbərlərinə iman gətirərək dedilər: "Biz Onun peyğəmbərləri arasında fərq qoymuruq. (Allahın hökmlərini) eşitdik (anladıq) və itaət etdik. Ey Rəbbimiz, bizi bağışla, (axırda) Sənin dərgahına (hüzuruna) qayıdacağıq!"*[53]

**b. İnsanın məsul varlıq olması**

Qurani-kərimdə təbiətin Allah tərəfindən yaradıldığı və insanların ixtiyarına verildiyi bildirilir. Təbiət eyni zamanda Allahın varlığının dəlilidir. İnsana düşən isə, ona verilən bu qədər nemətin fərqinə vararaq yaşamasıdır:

*"Biz, Adəm övladını şərəfli və hörmətli elədik, onları suda və quruda (gəmilərə, heyvanlara və başqa nəqliyyat vasitələrinə) mindirib sahib etdik, özlərinə (cürbəcür nemətlərdən) təmiz ruzi verdik və onları yaratdığımız məxluqatın çoxundan xeyli üstün etdik. (İnsan şüur, nitq qabiliyyəti, gözəl surət, boy-buxun, əllə yemək və s. bu kimi məziyyətlərinə görə həmişə Allaha şükür edib yalnız Ona tapınmalı, Rəbbinə heç bir şərik qoşmamalıdır!)"*[54]

*"(Ya Peyğəmbər!) De: "Sizi yoxdan yaradan, sizə qulaq, göz və qəlb verən Odur. (Allahın nemətlərinə) nə az şükür edirsiniz!" De: "Sizi yer üzünə yayıb səpələyən Odur. (Qiyamət günü) Onun hüzuruna toplanacaqsınız!"*[55]

*"İki məşriqin və iki məğribin Rəbbi (günəşin və ayın yazda və qışda çıxıb batdığı yerlərin sahibi) Odur. Belə olduqda Rəbbinizin hansı nemətlərini yalan saya bilərsiniz?! (Suları şirin və acı olan) iki dənizi O qovuşdurdu (bir-birinə qovuşmaq üçün açıb buraxdı). Amma onların arasında maneə vardır, bir-birinə qatışmazlar (özləri üçün müəyyən edilmiş həddi aşmazlar). Belə olduqda Rəbbinizin hansı nemətlərini yalan saya*

53 Bəqərə, 2/285
54 İsra, 17/70
55 Mülk, 67/23-24

*biləsiniz?! Onlardan (o iki dənizdən) inci və mərcan çıxar. Belə olduqda Rəbbinizin hansı nemətlərini yalan saya bilərsiniz?!"*[56]

**c. Axirət etiqadı**

Quran bizə iman əsaslarından olan axirət etiqadından da bəhs etmişdir. İnsanın bu dünyadakı həyatı əbədi deyildir. Dünya həyatı insan üçün imtahandır. O, öldükdən sonra təkrar dirildiləcək və dünyada etdiyi əməllərə görə hesaba çəkiləcəkdir.

*"Yer özünə məxsus bir şiddətlə lərzəyə gəlib titrəyəcəyi zaman. Yer öz yükünü çıxardıb atacağı zaman. İnsan (təəccüblə): "Buna (bu yerə) nə olub?" – deyəcəyi zaman . Məhz o gün (yer) öz hekayətini söyləyəcəkdir. Çünki (bunu) ona sənin Rəbbin vəhy etmişdir (buyurmuşdur)! O gün insanlar əməllərinin özlərinə göstərilməsi üçün (qəbirlərindən məhşərə) dəstə-dəstə çıxacaqlar! (Cənnətliklər sağ tərəfə, cəhənnəmliklər isə sol tərəfdə olacaqlar). Kim (dünyada) zərrə qədər yaxşı iş görmüşdürsə, onu (onun xeyrini) görəcəkdir (mükafatını alacaqdır). Kim də zərrə qədər pis iş görmüşdürsə, onu (onun zərərini) görəcəkdir (cəzasını çəkəcəkdir)."*[57]

Yuxarıda saydığımız başlıqlar İslami digər dinlərdən ayıran əsas qavram və etiqadlardır. Digər dinlərdə bu qavram və etiqadlarya fərqli şəkildədir, ya da heç yoxdur. Məsələn Xristianlığın Allah anlayışı İslamın Allah anlayışından çox fərqlidir. İslamın peyğəmbər və ilahi kitab anlayışı da digərlərininkindən fərqlidir.

**2. Quranda əxlaq**

Yuxarıda Quranın əsas qavram və etiqadlarından bəhs etdik. Quranın əxlaq anlayışına görə bunların həyata da əks olunması lazımdır. Allaha və axirətə iman, insanın həyatına və davranışlarına da əks olunmalı, davranışlarına imanı istiqamət verməlidir:

56 Rəhman, 55/17-23
57 Zilzal, 99/1-8

*"Bəndələrinin tövbəsini O qəbul edir, günahları O bağışlayır və sizin nə etdiyinizi də O bilir. İman gətirib yaxşı işlər görənlərin duasını qəbul edən, Öz nemətini onlara artıran da Odur. Kafirləri isə şiddətli bir əzab gözləyir!"*[58]

Quran, müsəlman inandığı Allah etiqadına görə həyatına yön verməsini istəyir:

*"Həqiqətən, Allah (Quranda insanlara) ədalətli olmağı, yaxşılıq etməyi, qohumlara (haqqını) verməyi (kasıb qohum-əqrəbaya şəriətin vacib bildiyi tərzdə əl tutmağı) buyurar, zina etməyi, pis işlər görməyi və zülm etməyi isə qadağan edir. (Allah) sizə düşünüb ibrət alasınız deyə, belə öyüd-nəsihət verir!"*[59]

*"(Ey müsəlmanlar!) İçərinizdə (insanları) yaxşılığa çağıran, xeyirli işlər görməyi əmr edən və pis əməlləri qadağan edən bir camaat olsun! Bunlar (bu camaat), həqiqətən nicat tapmış şəxslərdir."*[60]

*"Onlar öz iştahaları çəkdiyi (özləri yemək istədikləri) halda (və ya: Allah rizasını qazanmaq uğrunda) yeməyi yoxsula, yetimə və əsirə yedirərlər. (Və sonra da yedirtdikləri kimsələrə belə deyərlər: ) "Biz sizi ancaq Allah rizasından ötrü yedirdirik. Biz sizdən (bu ehsan müqabilində) nə bir mükafat, nə də bir təşəkkür istəyirik."*[61]

Allah kainatı insan üçün yaratmış və onun ixtiyarına vermişdir. İnsan da öz növbəsində təbiəti və kainatı qorumalı, onlarla Allahın istədiyi şəkildə davranmalıdır:

*Sizə verdiyimiz ruzilərin təmizindən (halalından) yeyin, lakin bunda həddi aşmayın (israfçılıq, xəsislik və nankorluq etməyin, ehtiyacı olana şəri*

58 Şura, 42/25-26
59 Nəhl, 16/90
60 Ali İmran, 3/104
61 İnsan, 76/8-9

*qayda üzrə kömək göstərin), yoxsa qəzəbimə düçar olarsınız. Qəzəbimə düçar olan isə mütləq uçuruma düşüb bədbəxt (cəhənnəmlik) olar."*[62]

### 3. Quranda hüquq və öhdəliklər

Quranda fərdin cəmiyyətdəki hüquqları və öhdəliklərindən də bəhs olunur. Belə ki, Quranda bəzi sosial və təşkilati məsələlər üzərində durulmuş və fərdlər arasındakı münasibətlər haqqında dini və hüquqi hökmlərə yer verilmişdir. Allah etiqadının və əxlaqın sosial həyatdakı əksi Qurandakı hüquq və öhdəliklərdə özünü açıq şəkildə göstərir. Etiqadlı və əxlaqlı fərdlər sosial həyatda ədalətli olacaq, başqalarına haqsızlıq etməyəcəklər:

*"Ey iman gətirənlər! Allah qarşısında (borcunuzu yerinə yetirməkdə) sabitqədəm və ədalətli şahidlər olun. Hər hansı bir camaata qarşı olan kiniz sizi ədalətsizliyə sövq etməsin. Ədalətli olun. Bu, təqvaya daha yaxındır. Allahdan qorxun. Allah etdiklərinizdən xəbərdardır!"*[63]

Quran ədalət qarşısında hamının bir olduğunu və hüququn üstünlüyünün hər kəs tərəfindən qəbul edilməsinin zəruriliyini dilə gətirir:

*"Ey iman gətirənlər! (Şahidliyiniz) sizin özünüzün, ata-ananızın, yaxın qohumlarınızın əleyhinə olsa belə, ədalətdən möhkəm yapışan Allah şahidi olun! (Əleyhinə şahidlik edəcəyiniz şəxs) istər dövlətli, istər kasıb olsun, hər halda Allah onların hər ikisinə (sizdən) daha yaxındır. Nəfsinizin istəyinə uyub haqdan üz çevirməyin! Əgər dilinizi əyib büzsəniz və ya (doğru şəhadət verməkdən, yaxud ümumən şahidlikdən) boyun qaçırsanız, (bilin ki) Allah etdiyiniz işlərdən xəbərdardır!"*[64]

Quranda, bu ədalət işığında, sosial ədalət, ailə və iqtisadiyyat sahələrinə dair əmr və qadağalar da vardır:

---

62 Taha, 20/81
63 Maidə, 5/8
64 Nisa, 4/135

*"Ata, ana və qohumların (vəfat etdikdə) qoyub getdikləri maldan kişilərə və qadınlara pay düşür. Həmin malın azından da, çoxundan da (bunlara veriləcək) hissə müəyyən edilmişdir. Malın (vərəsələr arasında) bölünməsi zamanı varis olmayan qohumlar, yetimlər və yoxsullar da orada iştirak edərlərsə, onlara da o maldan bir şey verin və gözəl sözlərlə könüllərini alın!"*[65]

*"Ey iman gətirənlər! Müəyyən müddətə bir-birinə borc verib aldıqda, onu yazın! Bunu (bu sənədi) aranızda bir nəfər katib ədalətlə yazsın! Katib gərək Allahın öyrətdiyi kimi yazmaqdan boyun qaçırmasın, yazsın! Borclu olan şəxs borcunu söyləyərək (deyə-deyə) yazdırsın və Rəbbi olan Allahdan qorxaraq ondan (borcdan) bir şey əskiltməsin."*[66]

*"Ey iman gətirənlər! Allahın sizə halal buyurduğu pak nemətləri (özünüzə) haram etməyin və həddi aşmayın. Doğrudan da, Allah həddi aşanları sevməz!"*[67]

### 4. Quranda ibadətlər

Qurani-kərimdə namaz, oruc və həcc kimi ibadətlərdən də bəhs olunmuşdur. İbadətlər, yuxarıda bəhs olunan etiqadlara, əxlaqi və hüquqi əmrlərə baxışımızı həm fərdi, həm də ictimai cəhətdən gücləndirər və canlı saxlar. Buna görə də ibadətlərin yerinə yetirilməsi çox önəmlidir:

*"Mən, həqiqətən, Allaham. Məndən başqa heç bir tanrı yoxdur. Mənə ibadət et və Məni anmaq üçün namaz qıl!"*[68]

*"Ey iman gətirənlər! Oruc tutmaq sizdən əvvəlki ümmətlərə vacib edildiyi kimi, sizə də vacib edildi ki, (bunun vasitəsilə) siz pis əməllərdən çəkinəsiniz!"*[69]

---

65 Nisa, 4/7-8
66 Bəqərə, 2/282
67 Maidə, 5/87
68 Taha, 20/14
69 Bəqərə, 2/183

*"Allahdan ötrü həcc və ümrə (kiçik həcc) əməllərini tam yerinə yetirin!"*[70]

İbadətlər eyni zamanda Allahın işarələridir. Buna görə də onlar təməl etiqadlarla yaxından əlaqəlidirlər:

*"Ey iman gətirənlər! Allahın müəyyən etdiyi mərasimə (həcc mərasiminə), haram (hörmətli) aya (həcc ayı hesab edilən zülhiccəyə və ya rəcəb zülqədə, zülhiccə və məhərrəm aylarına), (Kəbəyə gətirilən) qurbanlara, boynuna nişan taxılmış qurbanlıq heyvanlara, həmçinin Rəbbinin lütfünü və razılığını diləyərək Beytülhərama (müqəddəs evə) üz tutub (ziyarətə) gələnlərə hörmətsizlik etməyin!"*[71]

## III. QURANIN KİTAB ŞƏKLİNƏ SALINMASI

Hz. Məhəmməd son peyğəmbər, aldığı vəhy də son vəhy idi. Buna görə də Quranın nuru sadəcə Ərəbistan yarımadası ilə məhdudlaşmamalıydı və məhdudlaşmadı da. Quran hələ kitab şəklində deyilkən belə özünü "əl-Kitab"[72] adlandırırdı. Allahın Qurana "əl-Kitab" adını verməsi Onun Quranın yazılmasını istədiyini göstərirdi.

Miladi 610-632-ci illər arasında nazil olan Qurani-kərim o dövrdə kitab şəklinə salınmamışdı. Ancaq gələn hər vəhyin gələcəkdə meydana gətiriləcək kitabdakı yeri Hz. Peyğəmbər tərəfindən göstərilirdi. Quranın kitab şəklinə salınması mövzusunu aşağıdakı kimi izah etmək olar:

### A. Quranın Hz. Peyğəmbər zamanında yazılması

Yazı mədəniyyəti inkişaf etməyən ərəblər güclü hafizələri sayəsində ayə və surələri əzbərləməkdə çətinlik çəkmirdilər. Ərəb

70 Bəqərə, 2/196
71 Maidə, 5/2
72 Bəqərə, 2/2 Nəml, 27/1

yazısının hələ inkişaf etməməsi vəhyləri yazmağı çətinləşdirirdi. Ancaq Məkkə dövrünün sonlarından etibarən yazma-oxuma bilən müsəlmanların sayı artdı. Ticarətlə, xüsusilə də xarici ölkələrlə ticarət əlaqələrində iştirak edən məkkəlilər arasında oxuyub yaza bilənlərin sayı mədinəlilərdən çox idi. Belə ki, Peyğəmbərimizin vəhyləri yazmağı tapşırdığı qırxa qədər vəhy katibinin çoxu məkkəli idi.

Nazil olan ayələrin Məkkə dövrünün ilk illərindən etibarən yazılması Quranda[73], hədis qaynaqlarında və tarix kitablarında bildirilir. Hz. Peyğəmbər Quran ayələri nazil olduqda səhabilərə onu əzbərləmələrini əmr etməklə yanaşı onlar içərisində yazı yazmağı bilənlərə də onu yazmalarını tapşırırdı. Hz. Peyğəmbər nazil olan ayələri vəhy katiblərinə yazdırıb sonra da onlara yazdıqları mətni yüksək səslə oxumalarını əmr edərdi. Beləliklə o vəhy katibinin doğru yazıb-yazmadığını təsbit edərdi. Zeyd İbn Sabit bu haqda belə deyir: "Rəsulullah (s.ə.s) vəhyi mənə yazdırar və sonra yazdığımı oxutdurardı. Əgər bir səhvə yol vermişəmsə onu düzəldərdi. Mən yalnız bu yoxlama işindən sonra vəhyi insanlara çatdırardım."[74]

Quranın Hz. Peyğəmbər zamanında yazıldığını göstərən bəzi dəlillər bunlardır:

Hz. Ömərin müsəlman olması ilə nəticələnən hadisədə onun bacısının oxuduğu Məkkədə nazil olan Taha surəsinin ilk ayələrinin olduğu səhifə, vəhyin ilk günlərdən qələmə alındığını göstərən qüvvətli bir dəlildir.

Hz. Osmanın aşağıdakı sözləri də Quranın ilk dövrdə yazıldığını göstərir: "Rəsulullaha (s.ə.s.) vəhy gəldiyi zaman o, vəhy

73 Bax: Furqan, 25/5, Tur, 51/1-3, Abəsə, 80/11-16, Bəyyinə, 98/2
74 Heysəmi, Məcməuz-Zəvaid, VIII/257

katiblərindən birini çağırar və : "Bu ayələri yazıb, filan ayələrin yerləşdiyi surənin içinə qoy" buyurardı. [75]

"Yalnız mənə nazil olan vəhyi yazın"[76] hədisi də Quranın Hz. Peyğəmbər zamanında yazıldığına dəlalət edir.

Abdullah ibn Ömər belə deyir: "Hz. Peyğəmbər yanımızda olan vəhy səhifələri ilə döyüşdə iştirak etməyimizi qadağan etdi. Çünki o, vəhy səhifələrinin düşmənin əlinə keçməsini istəmirdi".[77] Bəra ibn Azibdən isə belə rəvayət olunur: Nisa surəsinin: "*Zərər çəkmədən (üzrsüz səbəbə görə evlərində) əyləşən möminlərlə Allah yolunda öz malları və canları ilə cihad edən (vuruşan) kimsələr bir olmazlar. Allah malları və canları ilə vuruşanları (evlərində) əyləşənlərdən (cihada getməyənlərdən) dərəcə etibarilə üstün tutdu. Allah bunların hamısına (hər ikisinə savab) vəd etmişdir. (Lakin) Allah mücahidlərə (evlərində) oturanlardan daha böyük mükafatlarla imtiyaz vermişdir*"[78] ayəsi nazil olduğu zaman Rəsulullah (s.ə.s.): "Filan şəxsi yanıma çağırın"- dedi. Çağırılan şəxs (Zeyd ibn Sabit), mürəkkəb, qələm və səhifə alıb gələnədə, Rəsulullah ona belə dedi: Nisa surəsinin 95-ci ayəsini yaz"[79] Bu son iki rəvayət də Quranın Hz. Peyğəmbər dövründə yazıldığını göstərən dəlillərdəndir.

Hz. Peyğəmbərin vəhy katibləri enən ayələri dəvələrin kürək və qabırğa sümüklərinə (azm), aşılanmış dərilərə (ədim), bəyaz daşlara (lihaf), xurma yarpaqlarına (asib), taxtaya və papiruslara (qirdas) yazırdılar. Ancaq Quran ayələrinin Hz. Peyğəmbər zamanında bir kitab şəklinə gətirildiyinə dair hər hansı bir məlumat yoxdur. Ancaq Buxarinin Səhihində keçən bir hədisdə Hz. Peyğəmbərin hər

75 Əhməd b. Hənbəl, I, 57
76 Müslüm, Zühd, 16
77 Əhməd b. Hənbəl, II, 6, 10, 55, 63, 76
78 Nisa, 4/95
79 Buxari, Təfsir, 4.

il Ramazan ayında o vaxta qədər nazil olan ayələri Cəbrayılın hüzurunda oxuduğu bildirilir. Vəfatından öncəki Ramazan ayında isə Cəbrayıl Quranı başdan sona qədər iki dəfə oxumuşdur.[80] Bir çox ayədə vəhyi Hz. Peyğəmbərin hafizəsinə yerləşdirməyi Öz üzərinə götürən, ona hər hansı bir əlavənin edilməyəcəyini və ya ondan hər hansı bir şeyin əksilməyəcəyini bildirən Allah-təala (Haqqa, 44-45), son Ramazan ayında da Quran mətninin son yoxlanışını Cəbrayıl vasitəsi ilə etmişdir. Çünki Allah belə buyurur: "*Zikri Biz endirdik və onu qoruyacaq olan da Bizik*." (Hicr 9)

**B. Quranın Hz Peyğəmbər zamanında kitab şəklinə salınmamasının səbəbləri**

Quran ayələri Hz. Mühəmməd (s.ə.s) zamanında yazılmasına rəğmən kitab halına gətirilməmişdi. Bunun da səbəblərini İslam alimləri aşağıdakı kimi izah etmişlər:

1. Hz. Əbu Bəkrin xəlifəliyi dövründə Quranın cəm olunmasının və Hz. Osmanın zamanında istinsax edilməsinin səbəbi ehtiyacın ortaya çıxması idi. Hz. Peyğəmbərin zamanında isə Quranın kitab halına gətirilməsinə ehtiyac yox idi. Çünki "əminul-vəhy" olan Peyğəmbər həyatdaykən Qurana hər hansı bir xələlin gəlməsi qeyri-mümkün idi.

2. Son nazil olan ayələrlə Hz. Peyğəmbəri vəfat etməsi arasında sadəcə doqquz gecə olduğu rəvayət edilir. Belə qısa müddətdə Quranın o günkü şərtlərdə kitab halına gətirilməsi qeyri-mümkün idi. Çünki Zeyd ibn Sabit dağınıq olan Quran mətnlərini bir ildə bir yerə toplaya bilmişdi.

80 Buxari, *Səhih*, VI, 229

3. Quran bir dəfədə nazil olmamışdır. Hz. Peyğəbər də vəhyin nə zaman kəsiləcəyini bilmirdi. Quran nazil olmağa davam etdiyi üçün onu kitab şəklinə salmaq mümkün deyildi.

4. Bəzi alimlər isə bunu nəsx məsələsi ilə əlaqələndirmişlər. Vəhy davam edərkən bəzi ayələrin nəsx olunması ehtimalı vardı. Bu ehtimal ola-ola Quran kitab şəklinə salınsaydı qarışıqlıq meydana gələ bilərdi. Belə bir qarışıqlığın meydana gəlməməsi üçün Quran kitab şəklinə salınmadı.

Bütün bunları göz önündə tutduqda, Rəsulullah (s.ə.s.) həyatda ikən Quranın kitab halına gətirilməməsinin səbəbi asanlıqla başa düşülür.

**C. Quranın Hz. Əbu Bəkir zamanında kitab şəklinə salınması**

Yuxarıda da qeyd olunduğu kimi müəyyən səbəblərə görə Hz. Peyğəmbərin sağlığınnda Quranı cəm etmək mümkün olmamışdı. Quranın cəm olunması prosesi Hz. Peyğəmbərin vəfatından sonra xəlifə olan Hz. Əbu Bəkrin zamanında baş verdi. Peyğəmbərimiz "əminul-vəhy" idi. Ancaq ondan sonra dövlətin başına keçən Hz. Əbu Bəkir bu sifəti daşımırdı. Buna görə də o, Quranı Müshəf halına gətirməyə məcbur idi.

Bundan başqa Hz. Əbu Bəkirin xəlifəliyi dövründə dindən dönən qəbilələrlə müharibələr aparılırdı. Bu savaşlardan biri olan Yəmamə savaşında 10200 müsəlmanın şəhid olduğu, bunların da 500 və ya 700 nəfərinin Quran hafizi olduğu rəvayət olunmuşdur. Hz. Ömər bu savaşın dəhşətini belə təsvir edir: "Rəsulullahın (s.ə.s.) əshabı Yəmamədə kəpənəklərin alova düşüb yandıqları kimi şəhid edildilər".[81]

81 Mustafa Sadiq Rafii, *İcazul-Quran*, s. 17

Hz. Ömər bu hadisədən sonra hafizlərin şəhid olduğunu əsas gətirərək Hz. Əbu Bəkirə Quranın kitab şəklinə salınmasının vacibliyini bildirir. Hz. Əbu Bəkir isə Hz. Peyğəmbərin belə etmədiyi bu işi edə bilməyəcəyini söyləyir. Ancaq Hz. Ömərin israrı ilə o bu təklifi qəbul edir və bu iş üçün ən uyğun olan adamın Zeyd İbn Sabit olduğuna qərar verilir. Zeyd çağrılır və Quranın kitab şəklinə salınması məsələsi ona bildirilir. Əvvəlcə o da bu təklifdən boyun qaçırsa da, sonra bu işin vacib olduğu qənaətinə gəlir və təklifi qəbul edir.

Quranı cəm etmək üçün Məscidi-Nəbəvidə iclas təşkil olunur və burada Zeyd ibn Sabitin rəhbərliyi altında komissiya qurulur. Bu komissiyanın üzvləri aşağıdakılar idi: Hz. Ömər, Hz. Əli, Hz. Osman, Übeyy ibn Kəb, Abdullah ibn Məsud, Abdullah ibn Ömər, Abdullah ibn Abbas, Abdullah ibn Zübeyr, Abdullah ibn Səid, Talha, Səd, Hüzeyfə, Əmr ibn As, Əbu Hüreyrə, Xalid ibn Vəlid, Əbu Musa əl-Əşəri, Əbu Zeyd və Əbu Dərda.

Zeyd Quranı cəm edərkən gətirilən ayələrin həqiqətən Hz. Peyğəmbərin hüzurunda yazılmasına dair iki şahid tələb edirdi. İki şahid gətirə bilməyənlərin sözünə etibar etmirdi. Tövbə surəsinin son iki ayəsi ilə[82] Əhzab surəsinin 23-cü ayəsini sadəcə Hüzeymə b. Sabit əl-Əsari gətirmişdi. Hz. Peyğəmbərin onun şahidliyini iki nəfərin şahidliyi ilə eyni tutmasından yola çıxaraq onun gətirdiyi bu ayələr də qəbul edilərək Qurana yazılmışdır. Həm də Tövbə surəsindəki ayələr son enən ayələrdən olduğu üçün hələ də hafizələrdə qorunub saxlanılırdı. Digər səhabələr də bu ayələri əzbər bilirdilər ki, bu da həmin ayələrin ilahi olduğunu göstərir.

82 Tövbə, 9/128-129

Hz. Əbu Bəkrin əmri ilə kitab halına gətirilən Quran başda Hz. Ömər və Hz. Əli olmaqla bütün səhabələr tərəfindən qəbul edilmişdir. Onun cəm etdirdiyi Qurana heç bir səhabə etiraz etməmişdir.

### 1. Quranın cəm etmə vəzifəsinin Zeyd ibn Sabitə verilməsi

Quranın cəm edilməsi həvalə olunan Zeyd bu hadisə haqqında belə deyir: "Yəmamə döyüşündən sonra Əbu Bəkir məni yanına çağırdı. Onun yanına getdikdə Ömər də onunla birlikdə idi. Əbu Bəkir mənə belə dedi: Ömər yanıma gələrək Yəmamə döyüşündə bir çox hafizin şəhid edildiyini, hərb meydanlarında Quranı əzbərləyənlərin şəhid edilməsi ilə Quranın yox olma təhlükəsindən qorxduğunu söylədi və mənə Quranı cəm etmə vəzifəsini verdi. Mən ona belə cavab verdim: Allah Rəsulunun etmədiyi bir işi mən necə edə bilərəm? Ancaq Ömər bu işin xeyirli bir iş olduğuna and içdi və bu məsələni dəfələrlə təkrarladı. Nəhayət Allahın köməyi ilə bu iş ağlıma yatdı və Allah qəlbimə rahatlıq bəxş etdi. Ömərlə həmfikir olduğumu söylədim. Əbu Bəkir sonra mənə (Zeydı) belə dedi: Sən ağıllı bir gəncsən. Rəsulullahın vəhy katiblərindən birisən. Sənin ittiham olunacaq hər hansı bir qəbahətin də yoxdur. Buna görə də, Quranı araşdıraraq cəm et".

Zeyd sözlərinə belə davam edir: Allaha and olsun ki, əgər mənə dağı belimdə daşımağı təklif etsəydilər, onu daşımaq Quranı cəm etməkdən daha asan olardı. Əbu Bəkir israra etməyə davam etdi. Nəhayət Allah, Əbu Bəkirlə Ömərin qəlbinə sükunət verdiyi kimi mənim də qəlbimə sükunət verdi. Beləliklə mən, Quranı xurma budaqlarından, ağ daşlardan və insanların hafizələrindən cəm etməyə başladım. [83]

Bu vəzifənin Zeydə verilməsinin səbəbi onun Hz. Peyğəmbərin xüsusi vəhy katibi olması, Quranı gözəl oxuması, Hz. Peyğəmbərin

83 Buxari, Fəzailil-Quran, 3

sağlığında Quranı əzbərləməsi və "ərzeyi-axirə"də iştirak etməsi ilə izah olunur.

**2. Zeydin cəm etdiyi Qurani-kərimin xüsusiyyətləri**

Zeyd bir il müddətinə Quranı cəm etmə işini bitirdi. Ancaq cəm olunan bu nüsxə bu şəkildə qala bilməzdi. Çünki Quran mətni hələ də müxtəlif yazı ləvazimatlarının üstündə idi. Buna görə də ondan istifadə etmək mümkün deyildi. Quranı həm bu dağınıq görünüşündən qurtarmaq, həm də müsəlmanların ondan istifadəsini asanlaşdırmaq üçün Zeyd həmin Quran mətnlərini dəri üzərinə yazdıraraq yeni bir nüsxə meydana gətirdi. Bu yeni nüsxənin xüsusiyyətlərini aşağıdakı kimi sadalaya bilərik:

a. Cəm işi elmi metodlarla həyata keçirilmişdir.

b. Tilavəti mənsux olan ayələr yazılmamışdır.

c. Bu nüsxədə yazılan ayələrin hamısının təvatür yolu ilə bizə nəql olunduğuna dair ümmətin icması vardır.

d. Bu müshəf yeddi hərfi əhatə edirdi.

e. Zeyd tərəfindən kitab şəklinə salınan bu Qurana Abdullah İbn Məsudun təklifi ilə "*müshəf*" adı verilmişdir.

Bu müshəf Hz. Əbu Bəkir və Hz. Ömərin xəlifəlikləri zamanında onların himayəsi altında qorunmuş, Hz. Ömərin vəfatından sonra isə onun qızı Həfsəyə verilmişdir. Ancaq bu nüsxənin Həfsəyə verilməsi heç də bəzi müstəşriqlərin iddia etdikləri kimi onun xüsusi mülkünə çevrilməsi demək deyildi. Əksinə bunun səbəbi nüsxənin veriləcəyi xəlifənin hələ seçilməməsi idi. Bilindiyi kimi müshəf Quranın təksir ediləcəyi günə qədər Həfsənin yanında qalmış, Hz. Osmanın xəlifəliyi dövründə Quran istinsax edilərkən (çoxaldılarkən) ondan alınmış və dahas onra yenidən ona geri qayıtarılmışdır. Mənbələrin bildirdiyinə görə Həfsə vəfat etdikdən

sonra Mədinə valisi Mərvan ibn Hakəm bu Müshəfi Abdullah ibn Ömərdən götürmüş və bu nüsxə ilə Hz. Osmanın istinsax etdirdiyi müshəflər arasındakı fərqlər səbəiylə ixtilaf çıxmasından qorxaraq onu yandırtmışdır.

**D. Quranın Hz. Osman zamanında çoxaldılması**

Hz. Ömər və Hz. Osmanın dövründə fəthlər nəticəsində İslam coğrafiyası xeyli genişləndi. Əərb əsilli olmayan müsəlmanlar öz bölgələrində yaşayan məşhur səhabələrin müshəf və qiraətlərinə görə Quranı öyrənir və həmin müshəflərdən istifadə edərək özləri üçün xüsusi nüsxələr hazırlayırdılar. Çox keçmədi ki, Mədinə dövründə verilən Quranı fərqli ləhcələrə görə oxuma izni və ərəb yazısından qaynaqlanan bəzi oxuyuş fərqlilikləri nəticəsində Quranın oxunuşunda bəzi qarışıqlıqlar meydana çıxdı. Oxuyuşdakı fərqliliklər fikir ayrılığına gətirib çıxardı və bu mövzuda ciddi mübahisələrə səbəb oldu.

Əbu Qilabə rəvayət edir ki, Hz. Osmanın xilafəti əsnasında Quran müəllimləri müxtəlif səhabilərin qiraətini öyrədirdi. Bu da tələbələr arasında fikir ayrılığı yaradırı. Onlar bu məsələni müəllimlərinə söylədilər. Hətta tələbələrdən biri digərinin qiraətini inkar edirdi. Hz. Osman bu məsələdən xəbərdar olan kimi minbərə çıxaraq belə bir xütbə oxudu: "Ey müsəlmanlar! Siz mənim yanımda (Mədinədə) fikir ayrılığına düşürsünüz. Uzaq bölgələrdə yaşayan müsəlmanlar da əlbəttə ki, daha çox ixtilafa düşəcəklər. Ey Mühəmmədin əshabı! Toplanıb insanlar üçün bir imam Müshəfi yazın".[84]

Hz. Osmanın dövründə Quran nüsxələrinin çoxaldılmasını zəruriləşdirən əsas hadisə isə Buxarinin "əs-Sahihində" bu şəkildə

84 Əbu Davud, əl-Məsahif, s. 21

rəvayət olunur: "Azərbaycan və Ermənistan səfərində iştirak edən iraqlı və suriyalı əsgərlər arasında qiraət fərqlilikləri ortaya çıxır. Hüzeyfe ibn Yaman Hz.Osmanın yanına gələrək bu hadisənin təhlükəli olduğunu bildirərək belə deyir: "Ey möminlərin əmiri! Bu ümmət Quran haqqında yəhudilərin və xristianların düşdüyü ixtilafa düşmədən onun imdadına çat". Başqa şikayət və ixtilafları da nəzərə alan Hz. Osman Həfsəyə xəbər göndərərək belə deyir: "Quran səhifələrini bizə göndər. Onları çoxaltdıqdan sonra təkrar sənə geri verəcəyik". Hz. Həfsə səhifələri göndərir. Hz. Osman Zeyd ibn Sabit, Abdullah ibn Zübeyir, Said ibn As və Əbdürrəhman ibn Haris ibn Hişamdan ibarət komissiya qurur və onlara bu səhifələri çoxaltmağı əmr edir. Hz. Osman onlara bu vəzifəni verərkən Qüreyş qəbiləsindən olan üç nəfərə belə əmr edir: "Əgər Quranın hər hansı bir yerində Zeyd İbn Sabitlə ixtilafa düşsəniz onu Qüreyş ləhcəsi ilə yazın. Çünki Quran onların dili ilə nazil olmuşdur". Heyət əmri yerinə yetirərək Quranı istinsax etdi. Hz. Osman əsl nüsxəni Hz. Həfsəyə göndərdi və çoxaldılan müshəflərin hər birini bir bölgəyə göndərərək bunların xaricindəki müshəflərin yandırılmasını əmr etdi."[85]

Bu rəvayətdən də görürük ki, İslam dövləti fəthlər sayəsində çox genişlənmiş, müxtəlif millətlər İslam dinini qəbul etmişlər. Quranın yazısı hərəkəsiz və nöqtəsiz olduğu üçün yeni müsəlmanlar Quranı oxumaqda çətinlik çəkmişlər. Yuxarıda qeyd etdiyimiz ixtilafların səbəblərini bir az da açıqlasaq bunu deyə bilərik ki, əvvəllər Quranın yeddi hərf üzrə oxunmasına icazə verilmişdi və Hz. Əbu Bıkrin cəm etdirdiyi Quran da məhz yeddi hərə görə idi. Bundan başqa bəzi səhabələr xüsusi müshəflərinə ayələrin təfsiri ilə əlaqədar bəzi kəlmələr əlavə etmişdilər. Yeddi hərfdən qaynaqlanan ixtilaflar əsasən mənaca eyni olan kəlmələrin fərqli sözlərlə

85 Buxari, Fədailul Quran, 3.

(sinonimləri ilə) əvəzlənməsi nəticəsində ortaya çıxırdı. Məsələn, "fəsav ilə zikrillah" ayəsini[86] bəziləri "fəmdu ilə zikrillah", "in kənət illə sayhətən vahidətən" ayəsini[87] isə "in kənət illə zəqyatən vahidətən" şəklində oxuyurdular. Bəzi səhabilərin müshəflərinə təfsir kimi əlavə etdikləri kəlmələrə gəldikdə isə ona bu misalı verə bilərik: Bəqərə surəsinin 238-ci ayəsi Hz. Aişəyə məxsus müshəfdə " *Hafizu alə saləvəti vəs-salətil vusta və salətil-əsr*" şəklində yazılmışdı. Yenə bu surənin 198-ci ayəsini Abdullah ibn Abbas öz müshəfinə "*Leysə aleykum cünahun ən təbtəğu fadlən min rabbikum fi məvəsimil-həcci*" şəklində yazmışdı. O günkü şərtlərdə hər yerə Quran müəllimləri göndərmək də qeyri-mümkün idi. Ancaq bir tərəfdən də müsəlmanlar arasındakı bu fikir ayrılıqları təhlükəli həddə çatırdı və bu məsələ həll edilməsəydi onlar arasında müharibələr belə baş verə bilərdi. Bütün bunların nəticəsində Quran nüsxələrinin çoxaldılması zərurət halına gəlmişdi. Məhz buna görə daha öncə bəhs etdiyimiz Zeyd ibn Sabitin rəhbərlik etdiyi komissiya hicri 25-ci ildə Quran nüsxələrini çoxaltma prosesini başlatdı.

Hz. Osman Quranı istinsax edən bu heyətə bəzi təlimatlar vermişdir ki, o təlimatlar bunlardır:

1. İstinsaxda Hz. Əbu Bəkr tərəfindən cəm edilən Müshəf əsas alınacaqdır.

2. Yeddi hərfdən sadəcə Hz. Peyğəmbərin Cəbrayıla ən son oxuduğu hərf alınacaq, digərləri isə tərk ediləcəkdir.

3. Tilavəti nəsx edilən ayələr yazılmayacaqdır.

4. Əgər heyət üzvləri arasında ixtilaf çıxarsa Qüreyş ləhcəsi əsas alşnacaqdır.

86 Cümə, 62/9
87 Yasin, 36/29

5. Bu nüsxələr hazırlandıqdan sonra bəzi böyük şəhərlərə göndəriləcək, daha öncə hazırlanan, lakin bu nüsxələrə uyğun gəlməyən müshəflər yandırılacaqdır.

6. Surələr bugün əlimizdə mövcud olan Quran tərtibatına uyğun olacaqdır. Çünki Hz. Əbu Bəkrin cəm etdirdiyi Müshəfdəki hər bir surənin ayələrinin tərtibi bugünkü Quran ayələri ilə eyni olsa da, surələrin tərtibi fərqli idi.

7. Təfsir məqsədi ilə yazılan qeydlər yazılmayacaqdır.

Zeyd ibn Sabitin sədrlik etdiyi heyət bu işi beş ildə başa çatdırdı. Qaynaqların verdiyi xəbərlərə görə heyət Zeydlə digər üç qüreyşli heyət üzvüləri arasında sadəcə "*təbut*" kəlimənin yazılışında ixtilaf düşmüşdür. Zeyd bu kəlimənin yumuru "tə" ilə, onlar isə açıq "tə" ilə yazılacağını iddia edirdilər. Ancaq Hz. Osmanın müdaxiləsi ilə bu söz açıq "tə" ilə yazılır. Çoxaldılan bu nüsxələrin yeddi nüsxədən ibarət olduğu söylənir. Bunlardan biri Mədinədə qalmış, digərləri isə Məkkə, Kufə, Bəsrə, Şam, Yəmən və Bəhreynə göndərilmişdir. Bu nüsxələrin dördü yanğınlar, müharibələr nəticəsində məhv olmuş, onların sadəcə üçü bizə gəlib çatmışdır. Bu müshəflərdən biri İstanbuldakı Topqapı muzeyində, digər ikisi isə Daşkənd və London şəhərlərindədir.

Məhəmməd Həmidullah (vəfatı-2004) günümüzə qədər gəlib çatan bu müshəflər haqqında belə deyir: "Deyilənlərə görə, Birinci Dünya Müharibəsinin sonlarında türk əsgərləri Mədinədən çıxarkən bəzi kitabları da özləri ilə götürürlər. Bu kitablar arasında Hz. Osmanın istinsax etdirdiyi müshəflərdən bir də vardı. Sevr müqaviləsinə türklərə tərəfindən aparılan bu müshəfin şərif Hüseynə geri verilməsi şərti qoşulmuşdu. Ancaq türklər bu məsələ ilə əlaqədar rəsmi bəyanat verdilər ki, "Bu kitablar filan yerdə saxlanırdı, ancaq sel nəticəsində hamısı məhv oldu". Həmin müshəfin "*Al-*

*lah onlara qarşı sənə kifayət edər*"[88] ayəsinin üstündə Hz. Osmana aid olduğu söylənən qan ləkələri mövcuddur.[89] Hər üç nüsxəni araşdırdığını söyləyən Həmidullah, bu nüsxələrin ölçü və yazı cəhətdən bir-birlərinə bənzədiyini ifadə etmişdir.

Səhabə və tabeundan heç kim Hz. Osmanın bu işinə qarşı çıxmamışdı. Abdullah ibn Məsudun etiraz etdiyi məlum olsa da, onun etirazı Quranın istinsax edilməsindən daha çox Zeyd ibn Sabitin komissiyanın sədri təyin edilməsinə idi. Belə ki, o da daha sonralar Hz. Osmanın həyata keçirdiyi bu fəaliyyətin zəruriliyini qəbul etmişdir. Hz. Əli də Quranın istinsaxı məsələsini dəstəkləmişdir. Bütün müsəlmanlar və bütün İslam məzhəbləri yekdilliklə Hz. Osman tərəfindən istinsax etdirilən Müshəfi tanımışlar.

### E. Quranın hərəkələnməsi və nöqtələnməsi

Ərəb yazısı İslam gəlmədən əvvəl çox bəsit və ibtidai şəkildə idi. İslamın gəlişi ilə bu yazı inkişaf etməyə başlayır. Çünki İslam özü ilə bərabər yazının istifadə sahəsini daha da genişləndirmişdir. Ancaq yazının yayılmasına baxmayaraq, o hələ mükəmməl vəziyyətə gəlməmişdi. Hərfləri bir-birindən ayırd etmək üçün nöqtələr qoyulmamışdı. Ərəblər ana dilləri olduğu üçün nöqtəsiz və hərəkəsiz oxuya bilirdilər. Lakin qeyri-ərəblərin İslam dinini qəbul etməsi ilə Quranın oxunuşunda çətinliklər get-gedə artırdı. Məsələn, Osman ibn Əbu Şeybə "Fil" surəsinin birinci ayəsindəki "ələm" sual və inkar ədatını hürufu-müqəttə zənn edərək "əlif, ləm, mim" kimi, Həmzə əz-Zəyyat da, Bəqərə surəsinin ikinci ayəsindəki "lə raybə" ifadısini "lə zeytə" şəklində oxumuşdur. Məhz buna görə də Quranı bu cür yanlış oxunuşlardan qorumaq lazım idi. Bunun da yolu bir an öncə Quranın hərəkələnməsindən və nöqtələnməsindən keçirdi.

88 Bəqərə, 2/137
89 Məhəmməd Həmidullah, "*Kuran-i Kerim Ders Notları*", s. 30

Bu problemi görən Bəsrə valisi Ziyad o dövrün böyük alimi Əbul Əsvəd Duəlini (vəfatı-69/688) yanına çağırır və ondan yazı işini sistemli hala gətirməsini tələb edir. Bu istəyi rədd edən Duəli bir nəfərin Tövbə surəsinin 3-cü ayəsi olan

أَنَّ اللّهَ بَرِيءٌ مِّنَ الْمُشْرِكِينَ وَرَسُولُهُ

"*Allah ve elçisi müşriklərdən* uzaqdır " ayəsindəki "*və rəsuluhu*" ifadəsini "*və rəsulihi*" şəklində oxuduğunu görür və Ziyadın yanına gedib onun bu təklifini qəbul etdiyini söyləyir. Çünki o adamın "*və rəsuluhu*" ifadəsini "*və rəsulihi*" şəklində oxuması nəticəsində həmin ayənin mənası pozulur və bu mənaya gəlir: "*Allah müşriklərdən və Rəsulundan uzaqdır*". Bu da Duəlini narahat edirdi. O otuz katiblə birlikdə Quranı hərəkələyir. Katiblər Duəlinin təlimatına əsasən, Müshəfin yazısında istifadə edilən mürəkkəbin rəngindən fərqli bir rənglə fəthə üçün hərfin üstünə, kəsrə üçün hərfin altına və dammə üçün hərfin önünə nöqtə qoyurlar. Bu üsulla yazılan hər bir səhifə əd-Duəli tərəfindən yoxlanılmış, əgər naqislik varsa yenidən tamamlanmışdır.

Ancaq yenə də Quranın oxunuşunda problemler qalırdı. Belə ki, "bə", "tə", "sə", "cim", "ha", "fə", "qaf" kimi bir birilərinə bənzəyən hərfləri fərqləndirmək çətin idi. Bu nöqsanı görən İraq valisi Həccac ibn Yusif bəzi rəvayətlərə görə Nəsr İbn Asimdən (vəfatı- 89/707), bəzi rəvayətlərə görə isə Yəhya ibn Yamərdən (vəfatı-129/746) bu problemin həll edilməsini tələb etmişdir. Nəsr ibn Asım və ya Yəhya ibn Yamər Quran qirətinin ikinci mühüm işi olan nöqtələmə işini həyata keçirmişdir. Bu problemin həlli üçün hərflərin üzərinə nöqtələr qoyulmuşdur ki, buna "icam" deyilir. Həm hərəkə, həm də nöqtələmə işi hərflərin müəyyən yerlərinə nöqtələrin qoyulması ilə baş vermişdi. Amma hərəkə və nöqtələrin bir-birlərinə qarışmaması üçün nöqtələmədə rəngləri müxtəlif olan mürəkkəblərdən

istifadə olunmuşdur. Beləliklə bu problem həll edilmişdir. Daha sonralar isə Xəlil ibn Əhməd (vəfatı-175/791) bugün də davam edən bu sistemi təkmilləşdirmişdir.

Hərəkələrin olmaması digər bir müqəddəs kitab olan Tövratın oxunuşunda da probleme səbəb olmuşdur. Belə ki, Tövratın dili bir çox cəhətdən ərəb dilinə bənzəyən ibrani dilidir. Yəhudi alimləri bu problemi uzun müddət həll edə bilməmişlər. Bu da Tövratın yanlış oxunmasına və anlaşılmasına səbəb olmuşdur. Yəhudi alimləri də daha sonralar hərəkə və nöqtələrdən istifadə edərək bu məsələni həll etmişlərdir.

Hərəkə və nöqtələmə fəaliyyətlərindən sonra Qurana başqa bəzi işarələr də qoyulmuşdur. Bunlardan biri ayə sonlarına qoyulan "durğu-fasilə" işarəsidir. Bu işarələr əvvəlcə ellips (meyilli dairə), sonra dairə, daha sonra isə gül formasında qoyulmuşdur.

Hicri altıncı əsrdə Məhəmməd ibn Teyfur əs-Səcavəndi (vəfatı-560/1165) Qurana ayələrin mənaları nəzərə alınaraq hazırlanan və "səcavənd" adlanan işarələr qoymuşdur. Bunlardan başqa surə və cüz başlıqları, hizb və səcdə işarələri Qurana əlavə edilmişdir. Eyni zamanda hər beş və on ayədən sonra "təxmis" və "təşir" işarələri yazılmışdır.

## IV. QURANIN OXUNUŞU

Qurani-kərimin oxunuşu ilə əlaqədar İslam ədəbiyyatında üç əsas istilah işlədilir: tilavət, təcvid və qiraət.

"*Tilavət*" sözü "*izləmək, ardınca getmək və oxumaq*" mənalarını daşıyır. Tilavət sözü Quranda təsirli fel kimi vəhy ilə əlaqədar dörd dəfə, Kitab və səhifələrlə əlaqədar bir dəfə, hekayələrlə əlaqədar altı dəfə, hökm ilə əlaqədar bir dəfə, Tövratla əlaqədar üç dəfə, ayələrlə əlaqədar olaraq isə otuz iki dəfə işlədilmişdir.

Qurandakı kəlimələrin nitqinə məxsus səslərin əmələ gəlməsini, tələffüzünü və akustikasını öyrənməklə məşğul olan Quran elminə "*təcvid elmi* ( *ilm ət-təcvid*)" deyilir.

Qiraət kəliməsi "*qa-ra-ə*" felinin məsdəri olub "*oxumaq*" mənasına gəlir. Termin olaraq isə qiraət "*Quran sözlərinin tələffüz variantlarını öyrənən elmdir* ". Başqa cür tərif etsək qiraət "*hər hansı bir kəlmə üzərində məd, cəzm, hərəkə, sükun, nöqtə və irab cəhətdən ortaya çıxan dəyişikliklərdir*".

**A. Qiraət məsələsi**

İlk nəsildən nəql olunan rəvayatlərə əsaslanan mühüm elmlərdən biri də qiraətdir. Hz. Peyğəmbər həyatdaykən Quranın bəzən fərqli şəkildə oxunmasına icazə vermişdir. Səhabilər Rəsulullahdan (s.ə.s.) müxtəlif qiraət formalarını öyrənirdilər. Sonrakı dövrlərdə də onlardan bu qiraətləri tabeun və ətbaut-tabeun alimləri əxz etmişlər. Bütün bunların nəticəsində də bir-birindən fərqli qiraət formaları ortaya çıxmışdır. Bu qiraətləri oxuyan qurralar, müxtəlif İslam ölkələrinə yayılmış və onların bu ölkələrdə oxuduqları qiraət tərzləri də onların adını almışdır. Bu qiraətlər içərisində ən məşhur olanları Abduulah ibn Kəsirin, Nafinin, Əbu Amrın, İbn Amirin, Asımın , Həmzənin və Kisayinin qiraətləri idi.

Hicri ikinci əsrin sonlarında qiraət məsələsində mütəxəssis olan İslam alimləri bütün qiraətləri bir yerə topladılar, vəchlərin və rəvayətlərin kimlərə aid olduğunu ortaya çıxarıb səhih və şəz qiraətləri bir-birindən ayırmaq üçün bəzi qaydalar təsbit etdilər. Və beləliklə qiraətlərin təsbitinə dair ilk araşdırmalar hicri ikinci əsrdə rəsmən başladı. Bu sahədə ön plana çıxan alim Harun ibn Musadır (vəfatı-170/786). Ancaq bu dövrdəki qiraət sahəsindəki fəaliyyətlər şifahi şəkildə idi. Qiraətə dair ilk əsərlər hicri III əsrdə yazılmışdır. Tarixi mənbələr bu mövzuda ilk dəfə əsər yazan alimlərin Əbu

Übeyd əl-Qasım ibn Səllam (vəfatı-224/828), Əbu Hatim əs-Sicistani (vəfatı-255/868) və İbn Cərir ət-Təbəri (vəfatı-310/922) olduğunu bildirir. Lakin hər nə qədər qiraət mövzusunda əsərlər qələmə alınsa da, hələ "yeddi qiraət" ifadəsi işlədilmirdi.

Hicri IV əsrdə Əbu Bəkr İbn Mücahid (vəfatı-324/935) xalq arasında yayılan qiraətləri bir yerə toplayaraq "*Kitabus-Səba*" adlı əsərini yazdı. Bundan sonra xalq da onun bu təsnifini əsas aldı. Daha sonra isə İbn əl-Cəzəri (vəfatı-833/1429) bu yeddi qiraət imamının qiraətlərinə üç qiraət əlavə edərək onların sayını ona çatdırdı və bu qiraətlər "*qiaraəti aşərə*" adlandırıldı.

**1. Qiraətlərin növləri**

Qiraətlər səhih və qeyri-səhih ( şaz) deyə iki yerə ayrılır. Səhih qiraətlər "*mütəvatir*" və "*məşhur*", qeyri-səhih qiraətlər isə "*ahad*", "*müdrəc*" və "*mövzu*" qiraətlərdən ibarətdir.

**a. Səhih qiraətlər**

Qiarətlərin məqbulluğu (səhihliyi) şərtlərini alimlər belə müəyyənləşdirmişlər:

1. Qiraət gərək ərəb dilinin sintaktik kateqoriyalarından birinə (vəch min vücuh ən-nəhv) müvafiq olsun, dilçilik qaydalarını pozmuş olmasın.

2. Hz. Osman Müshəfinin yazılışına (rəsm) müvafiq olsun.

3. İsnadı ardıcıl olaraq (bit-təvatür) Peyğəmbərə (s.ə.s) gedib çıxsın.

Mütəvatir qiraətlər isnadı düzgün, sübuta yetirilmiş və ardıcıl şəkildə ötürülmüş qiraətlərdir. Bunlar "*qiraət əl-səba/yeddi qiraət*" imamlarının nəql etdiyi qiraətlərdir.

Məşhur qiraətlərə gəlincə bunlar isnadı düzgün, lakin ardıcıllığı tam olmayan, ərəb dili qaydalarına və Müshəfin rəsminə müvafiq olan, qarelər arasında məşhur olan, onlar tərəfindən səhv və ya müstəsna ( şaz) hesab edilməyən qiraətlərdir. Əbu Cəfər , Yaqub və Xələfin qiraətləri məhz məşhur qiraətlərdir.

**b. Qeyri-səhih** (şaz) **qiraətlər**

Mütəvatir qiraətin üç şərtinin və ya bu şərtlərdən hər hansı birinin olmadığı qiraətlər qeyri-səhih qiraətlərdir. Daha əvvəl qeyd etdiyimiz kimi bu qiraətlər üç yerə bölünür: ahad, müdrəc və mövzu (uydurma) qiraətlər.

İsnadı düzgün, lakin ərəb dili qaydalarına və müshəfin rəsminə müxalif olan, qarelər arasında tanınmayan qiraətlərə "*ahad qiraətlər*" deyilir. Bu qiraətlərdə oxumaq düzgün sayılmır.

Müdrəc qiraətlər bəzi ayələrə təfsir şəklində əlavə edilmiş dəyişiklikləri nəzərdə tutan qiraətlərdir. Səd ibn Əbi Vəqqasa, İbn Abbasa və İbn Zübeyrə aid edilən bəzi qiraətlərdə onların təfsirləri qiraət ünsürü kimi qəbul edilmişdir. Məsələn, Nisə surəsinin 12-ci ayəsiki ifadə "*və ləhu əxun əv uxtun*" şəklində oxunarkən, Səd ibn Əbi Vəqqas təfsir məqsədilə "*min ümmin*" ifadəsini buraya əlavə etmiş və bu əlavə qiraət ünsürü hesab edilmişdir.

Mövzu qiraətlər (uydurma qiraətlər) əsli olmadan kimə isə istinad edilən qiraətlərdir. Mühəmməd ibn Cəfər Xüzainin İmam Əbu Hənifəyə istinad etdiyi Fatir surəsinin 28-ci ayəsindəki "*Allah*" sözünü damməli oxuması buna misal verilə bilər. Bu oxuyuşa görə

إِنَّمَا يَخْشَى اللهُ مِنْ عِبَادِهِ الْعُلَمَاء ayəsi "... *Allah, alim qullarından qorxar*..." mənasına gəlir. Halbuki ayənin əsl mənası belədir: " ...*Allahdan qullar içərisində yalnız alim olanlar qorxar*..."

Quranda fərqli qiraətlərə izn verilməsini alimlər müxtəlif səbəblərlə izah edirlər:

1. Ərəblər Quran enmədən əvvəl müxtəlif ləhcələrdə danışırdılar. Onların hamısının bir ləhcədə danışmaları qeyri-mümkün idi. Buna görə də müxtəlif ləhcələrdə danışan ərəblərin təhrifə yol verməmələri və Quranı oxumalarını asanlaşdırmaq üçün müxtəlif qiraətlərədə oxumalarına izn verildi.

2. Quranın fərqli qiraətlərdə oxunmasının bir hikməti də bütün ərəb qəbilələrinə Quranın möcüzəvi bir kitab olduğunu göstərməkdir. Çünki Quran onlara özünün və ya on surəsinin və yaxud da bir surəsinin bənzərini gətirmələri mövzusunda meydan oxuyarkən sadəcə bir ləhcədən deyil, müxtəlif ləhcələrdən istifadə etsələr belə onun bənzərini yarada bilməyəcəklərinə diqqət çəkir.

3. Bundan başqa qiraətlər İslam hüquqşünaslarının hökm çıxarmaqda müraciət etdikləri bir yoldur. Fəqihlərdən biri bir qiraəti əsas alarkən, digər fəqih başqa bir qiraəti əsas almışdır. Məsələn Maidə surəsinin 6- ayəsindəki “və ərculəkum” ifadəsindəki “ləm” hərfini Nafi, İbn Amir, əl-Kisai və Həfs kəsrə ilə oxumuşlar. “Ləm” hərfini fəthə ilə oxuyanların qiraətinə görə dəstəmaz alarkən ayaqlar yuyulmalı, kəsrə ilə oxuyanlara görə isə məsh edilməlidir.

4. Qiraətlər eyni zamanda Hz. Peyğəmbərin ümmətinin digər ümmətlərdən üstünlüyünü göstərir. Çünki bu ümmət Rəblərinin kitabına böyük maraq göstərmiş, onun fərqli oxunuş şəkillərini Peyğəmbərdən öyrəndikdən sonra onu elm halına gətirmiş və beləliklə Quranı təhrif və təbdildən qorumuşlar.

**2. Qiraət imamları və raviləri**

a. Əbu Abdurrəhman Nafi (vəfatı-169/785). İsfahanlıdır, Mədinədə yaşamışdır. Onun raviləri Qalun və Vərşdir.

b. Abdullah ibn Kəsir (vəfatı-120/738). Məkkəlilərin qiraət imamı olan İbn Kəsir tabeun alimlərindəndir. Onun raviləri Bəzzi və Qunbüldür.

c. Əbu Əmr əl-Mazini (vəfatı- 154/770). Bəsrəlilərin qiraət imamıdır. Raviləri əd-Duri və əs-Susidir.

d. Abdullah ibn Amir (vəfatı-118/736). Şamlıların qiraət imamıdır. Tabeun alimlərindən olub qiraəti səhabələrdən əxz etmişdir. Raviləri Hişam və İbn Zəkvandır.

e. Əbu Bəkr Asim ibn Əbi-n Nücud (vəfatı-128/745). Tabeundan olan Asim Kufəlilərin qiraət imamıdır. Raviləri Əbu Bəkr Şubə və Həfsdir.

f. Həmzə ibn Həbib əz-Zəyyat (vəfatı-156/773). Raviləri Xələf və Xəlladdır.

g. Əli ibn Həmzə əl-Kisai (vafatı-189/805). Raviləri əd-Duri və Əl- Harisdir.

h. Əbu Cəfər Yəzid ibn əl-Qəqa əl-Məxzumi (vəfatı-130/747). Raviləri İsa ibn Vərdan və Süleyman İbn Cəmmuzdur.

i. Yəqub ibn İshaq (vəfatı- 205/820). Raviləri Mühəmməd ibn Mütəvəkkil və Rəvh ibn Əbdülmümindir.

j. Xələf ibn Hişam (vəfatı-229/843). Raviləri İshaq ibn İbrahim və İdris ibn Əbdülkərimdir.

"*Qiraət-i Əşərə*" deyə bilinən bu qiraətlərdən bu gün sadəcə üçü işlənməkdədir ki, bunlar Asim, Nafi və Əbu Əmrin qiraətləridir. Günümüzdə müsəlmanların əksəriyyəti Quranı demək olar ki Asim qiraətinin Həfs rəvayətinə görə oxuyurlar. Nafi qiraətinə gəlincə bu qiraətdən Misir istisna olmaqla Şimali Afrikanın bəzi

bölgələrində istifadə olunur. Əbu Əmr qiraəti isə sadəcə Sudanda oxudulmaqdadır.

Bu mövzuda İslam alimləri bir çox əsərlər yazmışlar. Azərbaycan alimləri Mühəmməd ibn Mahmud ət-Tusi (vəfatı- hicrətin 620-ci ilindən sonra) və Mühəmməd ibn Abdulkərim ət-Təbrizinin (vəfatı-704 h.) də qiraətlər elmi sahəsində böyük xidmətləri olmuşdur.

**B. Yeddi hərf (əl-Əhruhufu-s səbə) məsələsi**

Quran qiraətində ən önəmli məsələlərdən biri də yeddi hərf məsələsidir. Bu ifadə, "*uc, tərəf , zirvə, tiyə , yön , üslub , ləhcə , qiraət*" və s. kimi mənalara gələn "*hərf* " sözü ilə yeddi rəqəmi anlamına gələn "*səbə*" kəlməsindən meydana gəlmişdir. "*Səbə*" kəlməsi ərəb dilində həqiqi və məcazi anlamlarda işlədilir. Həqiqi mənada yeddi sayını, məcazi mənada isə rahatlıq mənasını bildirir.

Übeyy ibn Kəbdən belə bir rəvayət gəlir : "Hz. Peyğəmbər Bənu Qiffar quyusunun başında olarkən Cəbrayıl onun yanına gəlmiş və demişdir:

Allah təala sənə əmr edir ki, ümmətin Quranı bir hərf üzürə oxusun.

Hz. Peyğəmbər dedi:

Allahdan məni bağışlamasını diləyirəm. Ümmətimin gücü buna çatmaz.

Bu dialoq bu şəkildə üç dəfə təkrarlandı. Dördüncü dəfə Cəbrayıl belə dedi:

Allah sənin ümmətinə Quranı yeddi hərf üzürə oxumalarını əmr edir, hansı hərf üzürə oxusalar doğru oxumuş olarlar.[90]

90 Müslüm, Salətul-müsafirin; 274. Əbu Davud, əl-Vitr, 22; Nəsai, əl-İftitah, 38.

Yenə bu mövzuda Hz. Ömərdən gələn başqa bir rəvayət belədir: ″ Rəsulullahın (s.ə.s.) sağlığında Hişam İbn Hakimin (namazda) Fürqan surəsini oxuduğunu eşitdim. Hişam bu surəni Hz. Peyğəmbərin mənə öyrətdiyindən fərqli olaraq oxuyurdu. Az qala onun üzərinə atılacaqdım. Ancaq salam verənə qədər səbr etdim. Salam verən kimi ondan soruşdum:

Bu surəni sənə bu şəkildə kim öyrətdi ?

Hişam:

Rəsulullah öyrətdi -dedi.

Mən də ona:

Yalan söyləyirsən. Çünki Peyğəmbər bu surəni mənə sənin oxudduğundan fərqli olaraq öyrətdi-dedim. Yaxasından tutaraq onu Rəsulullahın yanına apardım.

Ey Allahın Rəsulu! Bu adamın Fürqan surəsini sənin mənə öyrətdiyindən fərqli olaraq oxuduğunu eşitdim-dedim

Hz. Peyğəmbər mənə:

Hişamın yaxasını burax-dedi və ona :

Ey Hişam oxu!-deyə əmr etdi. Hişam da o surəni mənim Hişamdan eşitdiyim kimi oxudu. O zaman Hz. Peyğəmbər:

Bu surə bu şəkildə endirildi dedi. Sonra da mənə sarı dönərək :

Ey Ömər oxu-deyə əmr etdi. Mən də Rəsulullahın (s.ə.s) mənə öyrətdiyi kim oxudum. Hz. Peyğəmbər mənə də:

Bu surə bu şəkildə endirildi. Quran yeddi hərf üzürə nazil olmuşdur. Bunlardan hansı sizə asan gəlirsə onu oxuyun buyurdu.[91]

Yeddi hərf mövzusunda qırx altı hədis rəvayət edilmişdir ki, bunların otuz dördü səhihdir.

91 Buxari, Fəzailul-Quran, 5; Müslüm, Salətul-müsafirin, 272.

Yeddi hərflə bağlı görüşlər:

Yeddi hərflə bağlı müxtəlif fikirlər söylənmişdir. Bu fikirlərdən birincisinə görə "*yeddi* hərf" bir neçə ərəb qəbiləsinin birgə dili kimi başa düşülməlidir. Əbu Übeyd əl-Qasim ibn Səllam göstərirdi ki, "*əhrufu-s səba*" hədisində məqsəd ərəb qəbilə dillərinin yeddi ləhcəsinə işarə etməkdir, daha doğrusu, Quran ərəb qəbilələrindən yeddisinin, məsələn, Qüreyşin, Hüzeylin, Həvazinin, Yəmən əhlinin və başqa qəbilələrin ləhcələrində nazil edilmişdir.

Lakin bu fikrin əleyhdarları onu tutarlı dəlillərlə təkzib edirlər. İbn Qüteybə deyir ki, Quran yalnız Qüreyş ləhcəsində nazil olmuşdur və məlum Quran ayəsini (İbrahim, 4) misal gətirir.

İkinci rəy ondan ibarətdir ki , "*yeddi hərf*" nitqdə müxtəlif, mənaca müvafiq yeddi ləfzdir. Bu müddəanı Süfyan İbn Üyeynə və Əbu Cəfər İbn Cərir ət-Təbəri müdafiə etmişlər. Təbərinin fikrincə "*yeddi hərf*" bir sözün ləfzcə müxtəlif, mənaca müvafiq yeddi variantıdır. Məsələn, biz "*gəl*" demək üçün "*həlummə*", "*əqbil*", "*təal*", "*ileyyə*", "*qəsdi*", "*nəhvi*" və "*qurbi*" sözlərini işlədirik. Bu sözlər tələffüzdə müxtəlifdir, mənaca isə müvafiqdirlər. Quranda da belədir: məsələn, "*səyhətən*" və "*zəqyətən*" ləfzcə müxtəlif olsalar da eyni mənalı sözlərdir.

Lakin bu rəyin tərəfdarları Quranda elə bir ləfz göstərə bilmirlər ki, yeddi cür tələffüz edilsin, amma eyni mənada olsun.

Üçüncü rəyə əsasən, "*yeddi hərf*" qiraətlərdəki yeddi müxtəlif variantdır (vücuh əl-xilaf). Bu rəyin tərəfdarları səhih və şaz qiraətləri nəzərdə tutur və onların yeddi variantını göstərməyə çalışırlar, guya hər variant bir hərfdir. Bu variantları İbn Qüteybə aşağıdakı kimi sadalayır:

1. Sözün sonluq fleksiyalarında (irab) ixtilaf. Bu cür ixtilaf sözün yazılışını saxlayır, mənasını da dəyişdirmir, yalnız sonluqlarda, yaxud səs tərkiblərində dəyişikliyə səbəb olur, məsələn , *"hünnə ətharu ləkum"* (Hud, 78) kəlamında "*ətharu*" sözü "*əthərə*" kimi oxunmuşdur.

2. Sözlərin sonluqlarında, yaxud səs tərkiblərində baş verən, onların mənalarını dəyişdirən, yazılışlarını isə saxlayan dəyişikliklər, məsələn , "*Rəbbəna baid beynə əsfarina*" kəlamında ilk iki söz "*Rəbbuna baədə*" kimi oxunmuşdur.

3. Sözlərin sonluqlarında dəyişiklik etmədən onların hərfləri barəsində ixtilaf. Bu zaman sözlərin mənaları dəyişilirdi, halbuki yazılışı saxlanılırdı, məsələn, *"keyfə nunşizuhə"*[92] kəlamı "*nunşiruhə*" kimi oxunmuşdur.

4. Sözün özü barəsində onun yazılış rəsmini dəyişdirən, amma mənasını dəyişdirməyən fərq, məsələn, *"in kənət illə sayhətən"* ( Yasin 29) kəlamı *"illə zəqyətən"* kimi oxunmuşdur.

5. Sözün həm yazılışında, həm də mənasında dəyişiklik, məsələn, *"və təlhin məndud"*[93] kəlamı *"və təlin məndud "* kimi oxunmuşdur ki, burada *"salxım-salxım sallanmış möüz"* dəyişilərək *"salxım-salxım bir-birinin üstünə düzülmüş tumurcuqlar"* mənasını almışdır.

6. Sözün cümlə tərkibində qabağa və ya geriyə çəkilməsi ilə bağlı yerdəyişmə fərqi, məsələn, *"və cəət səkrəu-l məvti bi-l həqqi"* ( Qaf, 19) kəlamı *"və cəət səkrətu-l həqqi bi-l məvti"* kimi oxunmuşdur.

7. Artırma və ya əksiltmə yolu ilə dəyişiklik, məsələn, *"ləhu tisun və tisunə nəcətən"*[94] cümləsinə "*nəcətən*" kəliməsindən sonra "*ünsa*" sözü də əlavə edilərək oxunmuşdur.

---

92 Bəqərə, 2/259
93 Vaqiə, 56/29
94 Sad, 38/23

Yuxarıda zikr olunan rəylərdən hansının daha doğru olduğunu söyləmək çətindir. Amma Quranın oxunmasını asanlaşdırnaq məqsədi güdən bu rüxsət Hz. Osmanın müshəfləri çoxaltması ilə ortadan qalxmışdır. Buna görə də yeddi hərf məsələsi artıq bu günün məsələsi olmayıb, tamamilə o dövrlə əlaqədar olan müvvəqqəti rüxsət idi.

## V. QURANİ-KƏRİMİN TƏRCÜMƏSİ

Qurani-kərimdə və hədisdə Quranın başqa dillərə tərcüməsini açıq şəkildə əmr edən və ya qadağan edən hər hansı bir ifadə yoxdur. Ancaq xüsusilə fiqh məzhəblərinin ortaya çıxdığı dövrdən etibarən bu məsələ mübahisə mövzusu olmuşdur. Alimlərin bir qismi bəzi ayələrdən və hədislərdən yola çıxaraq Quranın tərcümə edilməsinin vacib olduğunu söyləmişlər. Bəzi alimlər isə yenə Qurandan yola çıxaraq onun başqa dillərə tərcümə edilməsinin doğru olmayacağı, tərcümə edildiyi təqdirdə möcüzə xüsusiyyətini itirəcəyi görüşündə olmuşlar. Nəticə də isə tərcümə edilməsi tərəfdarlarının görüşü üstün gəlmiş və Quran müxtəlif dillərə tərcümə olunmağa başlanmışdır. Çünki hər nə qədər Qurani-kərim ərəb dilində nazil olsa da, onun muxatəbləri sadəcə ərəblər deyil, eyni zamanda bütün insanlardır. Buna görə də Quranı sadəcə ərəblərlə məhdudlaşdırmaq doğru olmazdı.

Ərəblərin xaricindəki digər millətlər İslam dinini qəbul etdikdən sonra, Qurani-kərimi və başqa din kitablarını ana dillərinə tərcümə etmə ehtiyacını hiss etmişlər. İranlı və türk mənşəli alimlər bu sahədə mühüm fəaliyyətlər göstərmişlər .[95]

Quran tərcümə tarixində ilk olma xüsusiyyətinə malik olan tərcümə, Hz. Peyğəmbər tərəfindən bəzi xarici dövlət başçılarına

95 Abdulkadir İnan, *Kurani Kerimin Türkçe Tercümeleri Üzerine İnceleme*, s. 3.

göndərilən diplomatik məktublardakı bəzi ayələrdir.[96] Rəsulullah (s.ə.s) tərəfindən göndərilən bu məktublarla birlikdə həmin ayələr də tərcümə edilmiş və ehtimal olunur ki, bu tərcümə işi Hz. Peyğəmbərin göndərdiyi elçilər tərəfindən həyata keçirilmişdir.[97]

Böyük tarixçi və hüquqşünas olan əs-Səraxsi belə deyir: "Rəvayət edildiyinə görə iranlılar Salman Farisiyə məktub yazaraq Quranın birinci surəsini farsca yazmasını istəmişlər. Onlar dilləri ərəb dilinə öyrəşənə qədər namazlarında onu oxumuşlar."[98]

Tacuş-Şəriə də "*Nihayə haşiyətül-hidayə*" adlı əsərində belə deyir: "Salman Farisi Hz. Peyğəmbərə müraciət etmiş və onun razılığı ilə Quranın birinci surəsini fars dilinə tərcümə etmişdir. Bilindiyi kimi Salman Farisi Hz. Peyğəmbərin Mədinədəki səhabələrindən biri idi.[99] Beləliklə deyilə bilər ki, Qurana dair ilk tərcümə az da olsa Hz. Peyğəmbər zamanında edilmişdir.[100]

**A. Qurani-kərimin türk dilinə tərcüməsi (məalı) və təfsiri**

Türk xalqlarının mədəniyyət tarixində din kitablarının bu dilə tərcüməsi fəaliyyəti müxtəlif türk boylarının beynəlmiləl dinlərlə təmas qurduqları dövrlərdə başlamışdır. Türklər qədim zamanlarda buddizmlə tanış olmuşdu. Türk dilindəki qədim terminlərin bir çoxu islam ədəbiyyatına türk dilinə tərcümə edilən buddizm dininə aid əsərlərdən keçmişdir. Türklər buddizmdən başqa Zərdüştlük, Manixeizm və Xristian dinləri ilə də təmas qurmuşdular. Türklərin böyük mədəni və ticarət mərkəzlərində bütün bu dinlərə mənsub insanlar yaşamışlar. Yüz ildən bəri aparılan tədqiqatlar nəticəsində

96 Bu ayələr üçün bax. Taha 20/ 47; Əli İmran 3/64; Nisə 4/71; Tövbə 9/29.

97 Muhsin Demirci, *Kuran Tarih*i, s. 214.

98 Məhəmməd ibn əs-Səraxsi , *əl-Məbsut* , I, 37.

99 Muhammed Hamidullah, *Aziz Kuran*, tərc: A. Hatip- M. Kanık, s. 78.

100 Muhsin Demirci, *e.a.ə.* s.214

bu dinlərin müqəddəs kitablarının türk dilində tərcümələri tapılmışdır.[101]

Türklər X əsrin ortalarında İslam dinini kütləvi olaraq qəbul etdikdən sonra, bu yeni dinin təlimatını və əsaslarını öyrənmə ehtiyacı duyduqları və dinin əsas mənbəyi olan Quranı anlamaq üçün öz dillərinə tərcümə etdirmək istədikləri şübhəsizdir.[102]

İslamdan əvvəl türklər arasında uyğur əlifbası yayılmışdı. İlk türkcə Quran tərcümələrinin də bu əlifba ilə tərcümə edilmə ehtimalı böyükdür. Ancaq bugünə qədər uyğur əlifbası ilə yazılmış mükəmməl bir Quran tərcüməsi tapılmamışdır. [103] Bizə qədər gələn ən əski türkcə Quran tərcümələri bunlardır:

1. Rusiya Elmlər Akademiyası Şərqşünaslıq İnistitunda olan tərcümə.

2. Türk və İslam Əsərləri Muzeyində olan tərcümə.

3. İstanbulda Millət Kitabxanasındakı tərcümə.

4. Mançestr şəhərində yerləşən Rilands kitabxanasındakı Quran tərcüməsi.[104]

### B. Qurani-kərimin Azərbaycan dilinə tərcüməsi (məalı) və təfsiri

Qaraqoyunlu və Ağqoyunlu saraylarında dövlət dili Azərbaycan dili idi. Bu dövrdə türkcənin önəmi gündən-günə artırdı. Hürufi mütəfəkkirlər Quranda ərəbcə mətnlə yanaşı türkcə məala[105] da yer

101 A. İnan, *Kurani Kerimin Türkçe Tercümeleri Üzerine İnceleme*, s. 3-4.

102 Ahmet Topaloğlu, *Kurani Kerimin İlk Türkçe Tercümeleri Ve Cevahirul-Asdaf*, s. 58.

103 Muhammed Hamidullah, *Kurani Kerim Tarihi*, s. 107-108.

104 A. Topaloğlu, *e.a.ə*. s.59-60.

105 Qurani-kərim Allah kəlamı olduğu üçün onu hərfi olaraq tərcümə etmək mümkün deyildir. Buna görə də tərcümə olunan Quranlara “Quran

verirdilər. Nəsimi ustadı Nəimiyə belə yazırdı: "Ərəb nitqi dutulmuşdur dilindən, səni kimdir deyən kim türkmansan". Yəni "sənin ana türkcən qarşısında ərəb dili sarsılıb susmalı olmuş, amma kim deyər ki bu dilin sahibi sən türksən". Nəsimini bu qədər sərt ifadə işlətməyə məcbur edən o zaman ərəb və fars dillərinin türk dilindən üstün tutulması idi. Sonralar ana türkcənin Nəsimidəki kimi yüksək dəyərləndirilməsi Quranın bu dildə oxunub öyrənilməsi düşüncəsini ortaya çıxardı. Faruk Sürənin apardığı tədqiqatlara görə Ağqoyunlu sultanı Uzun Həsən Quranı Azərbaycan dilinə tərcümə etdirib hüzurunda oxutdururdu ki, bu da müqəddəs kitabımızın dilimizə ilk tərcüməsi sayılır.[106]

Qurani-kərimin Azərbaycan dilinə tərcüməsi orta çağlarda başlamış olsa da, bu tərcümələr əlyazma şəklndə qalaraq nəşr edilməmişdir. Azərbaycanlı müfəssir olan Nemətulla Naxçıvani hələ XV əsrdə " *Fəvatihul-ilahiyyə vəl-məfatihul-ğaybiyyə* " adlı təfsir yazmışdır. Lakin onun bu əsəri ərəb dilində yazılmışdır. Bundan başqa İran, Osmanlı və s. kimi müxtəlif ölkələrdə yaşayıb-yaradan alimlərimiz olmuşdur. Ancaq bu alimlərin tərcümə və təfsirləri indiyə qədər araşdırlmadığı üçün onlar haqqında məlumat vermək qeyri-mümkündür .

Quranın günümüzə qədər gəlib çatan ilk Azərbaycanca tərcüməsi və təfsiri Bakı qazısı Məhəmməd Kərim Ağanın "*Kəşfül-həqayiq an nükətil-ayati vəd-dəqaiq*" adlı əsəridir. Üç cilddən ibarət olan bu əsər, "*Kaspi*" qəzetinin Buxariyyə mətbəəsində çap edilmişdir. Birinci və ikinci cildi 1904 cü ildə, üçüncü cild isə 1906-cı ildə nəşr olunmuşdur. 1908 -ci ildə isə Zaqafqaziya müsəlmanları şey-

---

tərcüməsi" deyil, "naqis ifadə olunan məna" anlamna gələn "məal" deyilmişdir.

106 Süleyman Əliyarlı, "XIII-XV Əsrlərin Tarixi", *Azərbaycan Tarixi* s. 333-334.

xülislamı Məhəmməd Həsən Mövlazadə Şəkəvinin "*Kitabul-bəyan fi təfsiril-Quran*" adlı təfsiri Tiflisdəki Qeyrət mətbəəsində çap edilmişdir.[107]

28 aprel 1920-ci ildə Azərbaycanda sovet hakimiyyətinin qurulmasından bir neçə gün sonra bütün dini imtiyazlar ortadan qaldırıldı. Sovet hakimiyyət orqanları din ilə mübarizə aparmağa qərar vermişdilər. Hakimiyyət öz planlarını həyata keçirmək üçün hər cür müəssisələr qurur, konfrans və seminarlar keçirirdi. 1924-cü ildə Bakıda "Allahsızlar Cəmiyyətinin" qurulmasının səbəbi də bu idi. Ancaq bütün bunlara rəğmən kommunistlər öz istəklərini həyata keçirə bilmədilər. Azərbaycanın bəzi yerlərində dini fəaliyyətlər gizli olsa da davam edirdi.

İkinci dünya mühribəsinin başlaması ilə sovet hökuməti müsəlmanlara qarşı ateizm təbliğatında güzəştə getməyə məcbur oldu. Hökuməti bu mövzuda mülayim davranmağa məcbur edən cəmiyyət içərisində narahatlığın artması, ruhanilərin bir mərkəzdən idarə olunmaması və onların istəklərinin yerinə yetirilməməsi, düşmənə qarşı xalq içərisində yekdil müqavimət əzminin qırlıması qorxusu idi. Bu mülayimlik müxtəlif səbəblərdən müharibədən sonra da davam etdi. Məhz Əhməd Həşimzadənin 1962-ci ildə yazıb tamamladığı dörd cildlik "*Təfsirul-Quranil-əzim*" adlı təfsiri də bu dövrə təsadüf edir. Bu əsr ərəb əlifbasıyla yazılmış və Azərbaycan Elmlər Akademiyasının Əlyazmalar İnistitutuna verilmişdir.[108]

Həmçinin mərhum Azərbaycan ədəbiyyatçısı, klassik Azərbaycan ədəbiyyatını və əruzu çox gözəl bilən Əli Fəhmi Ələkbərov 1969-1970-ci illərdə Vasim Məmmədəliyevin redaktəsi ilə Bəqərə,

107 Vasim Məmmədəliyev, Quranın Azərbaycan dilindəki tərcüməsinə yazdığı ön söz , s. XXVII

108 Davut Aydüz, *Sovet dövründə Azərbaycan türkcəsi ve ərəb qrafikası ilə yazılmış təfsir*, s. 86

Ali İmran və Nisə surəsinin doqquz ayəsini tərcümə etmişdir.[109] Bu dövrdə ümumiyyətlə Quranın rusca tərcümələri yayılmış və xalq Quranı anlama ehtiyacını bu tərcümələrlə qarşılamağa çalışmışdır.[110]

1991-ci ildə Azəbaycan yenidən öz müstəqilliyinə qovuşduqdan sonra Azərbaycan xalqı Qurani-kərimi öz dilində anlamaq istəmiş və bu sahə ilə məşğul olan bəzi elm xadimləri da onların bu istəklərini qarşılamaq üçün Quranı Azərbaycan dilinə tərcümə etmişlər.

Belə ki, 1991-ci ildə akademik Ziya Bünyadov və Vasim Məmmədəliyevin kiril əlifbası ilə hazırladığı Quran məalı nəşr edildi. Bu məal müstəqillikdən sonra Azərbaycanda ilk Quran tərcüməsi olaraq tarixə keçmişdir. Məal 1996-cı ildə təkrar latın əlifbası ilə çap edilmişdir. Bu məaldan təxminən bir il sonra isə Nəriman Qasımoğlunun kiril əlifbası ilə hazırladığı tərcümə işıq üzü görmüşdür.

1990-cı illərdən sonra tərcümə edilən digər bir Quran tərcüməsi də Rəsul İsmayılzadə Duzalın tərcümə etdiyi tərcümədir. Azərbaycan dilində olmasına rəğmən ərəb əlifbası ilə çap edilmişdir. Ərəb əlifbası ilə çap edilməsinin ən önəmli səbəbi isə Cənubi Azərbaycanda yaşayan azəri türkləri üçün nəzərdə tutulmuş tərcümə olmasıdır.

2000-ci ildə İranın Beynəlxalq "*Əlhuda*" Nəşriyyatının tərcüməçilər qrupu tərəfindən yeni bir Quran məalı dilimizə qazandırılmışdır. Həmçinin həmin ildə Məhəmmədhəsən Qənioğlu və Tariyel Bilaloğlunun latın qrafikasıyla hazırladıqları Quran tərcüməsi Türkiyə Diyanət Vəqfi tərəfindən nəşredilmişdir. Azərbaycan dilində yazılan Quran təcümələrindən biri də Əhməd Kayvanpurun

109 Erdoğan Pazarbaşı, *Azerbaycanda Yaygın Kuran Tercümeleri*, s. 116.
110 *E. a. ə.*, s. 103.

şəmsi təqvimi ilə 1369-1371-ci illər arasında İranda ərəb əlifbası ilə çap olunan Quran tərcüməsidir.

### C. Avropada Quran tərcümələri

Qeyri-müsəlmanların Qurana olan marağı çox əvvəllərə gedib çıxır. Həbəşistan kralı Nəcaşinin və Bizans kralı Heraklisin Quran ayələrini dinlədikləri zaman ona necə hörmət göstədikləri tarixdən bizə məlimdur. Ancaq daha sonrakı dövrlərədə onların Qurana baxışları daha çox onu rədd edərək xristianlar arasında hörmətdən salmaq istiqamətində olmuşdur. Bunu Quran tərcümələrinin ilklərindən olan sürayinicə tərcümədə görmək mümkündür. Avropa dillərində ilk tərcümə hesab edilən Robertus Ketenensislə Hermanus Dalmatanın latın dilindəki tərcüməsi (1143) də eyni mahiyyətdədir. Belə ki, bu Quran tərcüməsi islami iddiaları çürütmədə yetərsiz qaldığı üçün bir neçə əsr onun yayılmasına icazə verilməmiş, bu nöqsanlar aradan qaldırıldıqdan sonra 1543-cü ildə çap edilmişdir. Latın dilindəki bu tərcümə əvvəlcə italayan dilinə, sonra bu dildən alman dilinə, alman dilindən də holland dilinə tərcümə edilmişdir.

Quranın Avropa dillərindəki digər tərcümələrinə gəldikdə, Andre du Riyer, C. E. Savari, B. Kazimirski, E. Montet, D. Masson kimi orientalistlər Quranı fransız dilinə, Corc Seyl, Edvard Henri Palmer, Riçard Bel, Artur Con Arberi, N. J. Davood kimi ingilis orientalistlər isə ingilis dilinə tərcümə etmişlər. Rus dilindəki ilk tərcümələr də fransız dilindən rus dilinə olan tərcümələrdir. Ərəb dilindən rus dilinə ilk tərcümə isə Qoril Sablukova aid olub 1878-ci ildə Qazanda çap edilmişdir.

Quran, XIX əsrdən etibarən əvvəllər tərcümə olunmayan digər dillərə də tərcümə edilmişdir. İspan, polyak və yunan dillərinə edilən tərcümələri bu tərcümələrə misal verə bilərik. Bundan başqa

müsəlman alimləri də Quranı Avropa dillərinə tərcümə etmişlər. Mirzə Bəşiruddin Mahmud Əhmədin holland dilinə tərcümə etdiyi "*Der Hellige Qoran*" adlı tərcümə 1954-cü ildə nəşr edilmişdir. 1959-cu ildə isə müsəlman alimi Məhəmməd Həmidullah Quranı fransız dilinə tərcümə etmişdir. Bunlardan başqa Mövlana Məhəmməd Əlinin "*The Holy Quran*", Məhəmməd Zəfrullah Xanın "*The Koran*" adlı ingiliscə tərcümələri vardır.

Yuxarıda qeyd olunan dillərdən başqa Quranın bir çox dilə tərcüməsi vardır ki, bunlar Asiyada çin, yapon, koreya, malaziya və urdu, Avropada rumın, macar, isveç, norveç, portuqal, serb, xorvat, boşnak, Afrikada isə sevahil və yorba dilləridir.

## I. ULUMUL-QURANIN (QURAN ELMLƏRİNİN) MEYDANA ÇIXMASI VƏ TƏDVİNİ

"Ulumu-l Quran" ifadəsini ilk dəfə hicri V əsrdə yaşayan Əli İbn İbrahim əl-Hufi (vəfatı-430/1038) "*əl-Bürhan fi ulumil-Quran*" adlı əsrində işlətmişdir. Ancaq Adnan Zarzur ilk dövr alimlərinin bu məfhumu "ulumut-təfsir" mənasında işlətdiklərini söyləyir. Buna görə də alimlər "Ulumul-Quran" ifadəsinin bu gün bilinən mənasıyla ilk dəfə Zərkəşinin (vəfatı-794/1391) "*əl-Bürhan fi ulumil-Quran*" adlı əsərində işlədildiyi qənaətinə gəlmişlər. Hufinin əsərindən fərqli olaraq bu əsər Quran elmlərinin bütün şöbələrini əhatə edir.

Beləliklə deyilə bilər ki, "Ulumul-Quran" ifadəsindən qavram kimi hicri IV əsrin əvvəllərində istifadə olunmağa başlansa da, bu ifadə tam mənası ilə hicri VIII əsrdə işlənmyə başlanmışdır.

### A. Ulumu-l Quranın (Quran elmlərinin) tərifi, mövzusu və sayı

"*Ulumu-l Quran*" ifadəsindəki "*ulum*" sözü "*elm*" kəlməsinin cəmidir. Lüğətdə "*bilmək və anlamaq*" mənasına gələn bu söz termin olaraq "*məsələləri dəlilləri ilə idrak etmək*" deməkdir. "*Ulumu-l Quran*" deyildikdə isə "*Quranın nazil olması, tərtibi, cəmi, yazılması, oxunması, təfsiri, ecaz, nasix, mənsux və s. kimi Quranla əlaqədar elmlər*" qəsd olunur.

Quran elmləri Quranın xətti, ləfzi və mənası, üslub və ecazı kimi müxtəlif mövzuları əhatə edir. Bu elmləri bilməyənlər Quranı anlaya və təfsir edə bilməzlər. Bu elmlərdən başqa Quranda bəzi təbiət elmləri ilə əlaqədar ifadələrə də rastlaşmaq mümkündür. Lakin bu ifadələrdən yola çıxaraq təbiət elmlərinə də Quran elmləri deyə bilmərik. Çünki Quran bu elmlərin qanunlarını qoymaq və onları isbat etmək üçün nazil olmamışdır.

Təbiət elmlərinin Quran elmləri sayılmaması onların İslam dinində əhəmiyyət verilməyən elmlər olmaları mənasına gəlməz. Əksinə Qurani-kərim bu elmləri öyrənməyi, bu sahələrdə mütəxəssis kimi yetişməyi əmr edir. Lakin bunu da unutmamaq lazımdır ki, Quran elmləri sadəcə Quranın anlaşılmasına xidmət edirlər. Eyni şeyi isə təbiət elmlərini üçün söyləmək qeyri-mümkündür.

Zərkəşi "*əl-Burhan fi ulumil-Quran*" adlı əsərində Quran elmlərinin qırx yeddi elmdən ibarət olduğunu və eyni zamanda bu elmlərin sayını məhdudlaşdırmanın əslində doğru olmayacağını bildirir. Suyuti isə Zərkəşinin çəkdiyi çevrəni daha da genişləndirərək bu elmlərə astronomiya, tibb və digər elmləri daxil etmişdir.

Burada üzərində durulması lazım olan məsələlərdən biri də Əbu Bəkir ibn əl-Ərəbinin (vəfatı-543/1148) nəql etdiyi bu rəvayətdir: "Qurandakı hər bir kəlmənin zahir, batin, hədd (halal-haram) və matla (vəd-vəid) deyə dörd mənası vardır". Bu rəvayətdə İbn Ərəbi Quran elmlərinin 77540 olduğunu yazır.

Zərqani isə Suyutinin və İbn Ərəbinin Quran elmləri haqqında söylədiklərinin təvilə əsaslandığını, bunlarla tədvin edilmiş elmlərin deyil, Quran kəlmələrindəki mənaların qəsd olunduğunu söyləyir.

**B. Meydana çıxması və tədvini**

Qurani-kərim o dövrdə yaşayan insanların dili ilə nazil olsa da, onda mübhəm, mücməl, müşkil, mütəşabeh və mütləq ayələrin olması, o cümlədən bu insanların zəka baxımından eyni olmamaları Quranı anlamaqda bəzi problemlərə gətirbib çıxardırdı. Düzdür səhabilər başa düşmədikləri yerləri Hz. Peyğəmbərdən soruşurdular. Ancaq onların sualları daha çox o dövrün şərtləri çərçivəsində idi. Ancaq zaman keçdikcə səhabilər bəzi mövzular ətrafında fikirlər yürütməyə başladı. Onların əsəs fəaliyyəti Quranı oxumaqdan, əzbərləməkdən, mənasını anlamaq və anlatmaqdan ibarət idi. Onlar Quran haqqındakı bilgiləri rəvayət yolu ilə sonra gələnlərə nəql edirdilər. Yəni, Qurana və ona əsaslanan elmlərə maraq göstərən səhabilərin bu sahədəki bilgiləri Hz. Peyğəmbər zamanında hələ tədvin olunmamışdı. Bunun da bəzi səbəbləri vardır ki, bunlar aşağıdakılardır:

1. Quran haqqındakı məlumtları yazılı hala gətirməyə ehtiyac hiss etməmələri.

2. Səhabilər arasında oxuya və yaza bilənlərin sayının az olması.

3. Yazı ləvazimatlarını əldə etmədə bəzi çətinliklərin olması.

4. Hz. Peyğəmbərin (s.ə.s.): “Məndən, Qurandan başqa heç bir şey yazmayın. Kim məndən Quran xaricində (bir şey) yazmışsa onu məhv etsin...”[111] buyuraraq Quran xaricindəki şeylərin yazılmasını qadağan etməsi.

Məhz bu səbəblərə görə Quran elmləri Hz. Peyğəmbər zamanında yazılı hala gətirilməmiş, şifahi şəkildə nəql olunmuşdu. Hz. Peyğəmbər vəfat etdikdən sonra isə səhabilər daha çox tələbə yetişdirməklə məşğul idilər.

111 Müslüm, Zühd, 16

Hz. Əbu Bəkrin zamanında Hz. Ömərin təşəbbüsü ilə Zeyd ibn Sabitin rəhbərliyi altında Quran səhifələri bir yerə toplanaraq kitab halına salınır. Ancaq bu dövrdə də Quran elmləri tədvin edilməmişdi. Hz. Osmanın xəlifəliyi dövründə İslam dövləti bir xeyli genişlənmiş, bu genişlənmə nəticəsində bir çox qare Misir, Şam, İran, Iraq kimi ölkələrə getmişlər və getdikləri yerlərdə Quranı özlərinin öyrəndikləri qiraətlərə görə oxumuşlar. Bunun nəticəsində də qiraət fərqlilikləri ortaya çıxmışdır. Bu fərqliliklərin getdikcə ixtilafa səbəb olduğunu görən Hz. Osman Quranı nazil olduğu Qüreyş ləhcəsinə görə yazdırıb əsas İslam mərkəzlərinə göndərdi.

Əbu əl-Əsvəd əd-Duəli və tələbələri olan Nəsr ibn Asim və Yəhya ibn Yamər Quranın hərəkələnməsi və nöqtələnməsi vəzifələrini yerinə yetirdilər. Bütün bunlardan yola çıxaraq deyə bilərik ki, hicri təqvimi ilə I əsrin sonlarından etibarən rəvayət yolu ilə nəql edilən Quran bilgiləri yavaş-yavaş yazılmağa başlandı.

Hicri I əsrdə tədvin olunmağa başlayan Quran elmlərinin əsasını formalaşdıran səhabə və tabeun alimlərindən bəziləri bunlardır:

Səhabilər: Hz. Əbu Bəkir, Hz. Ömər, Hz. Osman, Hz. Əli, İbn Abbas, İbn Məsud, Zeyd ibn Sabit, Əbu Musa əl-Əşəri və Abdullah ibn Zübeyir

Tabeun: Mücahid ibn Cəbr, İkrimə, Ata ibn Əbi Rabah, Qəttadə ibn Diamə, Səid ibn Cübeyir və Zeyd ibn Əsləm.

## II. QURAN ELMLƏRİ

Quranın məna və məfhum yönünün anlaşılmasına yardım edən qayda və qanunlar Quran elmləri başlığı altında toplanır. Bu elmlərdən bəzilərı bunlardır:

**A. Əsbabün-nüzul**

Quran ayələrinin nazil olmasına səbəb olan hadisələrə "əsbabun-nüzul" deyilir. Quranın doğru təfsir edilməsi üçün ayələrin hansı şərtlərdə, hansı hadisəyə görə, harada və necə endiyini bilmək lazımdır. Bu məlumatlar sayəsində ayələrin qəsd etdiyi mənaya daha da yaxınlaşmaq mümkündür. Hədis kitablarının təfsir bölümləri "əsbabun-nüzul" rəvayətlərindən meydana gəlmişdir. Ayələrin nüzul səbəbləri Quranın tarixini və ictimai zəminini sonrakı nəsillərə daşıyır.

Əsbabün nüzul məfhumu "*əsbab*" və " *nüzul*" kəlmələrindən meydana gəlmişdir. "*Əsbab*" "*səbəb*" sözünün cəm formasıdır. "*Səbəb*" lüğətdə "*metod, yol, işarə, vəsilə və vasitə*" mənalarına gəlir.

"*Nüzul*" kəlməsinə gəlincə isə bu kəlmə "*nə-zə-lə*" felinin məsdəri olub "*yuxarıdan aşağıya enmək*" mənasına gəlir. Bu kökdən gələn "*inzal*" və "*tənzil*" ifadələri də "*endirmək*" deməkdir. Ancaq "*inzal*" topdan endirmə, " *tənzil*" isə hissə hissə endirməkdir.

Quran iyirmi üç il müddətində ayə-ayə, surə-surə nazil edilmişdir. Bu cür nazil olmaya "*təncim* deyilir. Təncim "*nəcm*" (ulduz) sözündəndir, hər ulduz çıxanda, yəni müəyyən vaxtlarda Qurandan bir hissənin nazil edildiyini bildirmək üçün işlədilir.

"Əsbabun-nüzul"un daha geniş tərifini versək onu belə tərif etmək mümkündür: "Hz. Peyğəmbərin risaləti dövründə baş verən və Quranın bir və ya bir neçə ayəsinin və yaxud da surəsinin nazil olmasına səbəb olan hadisəyə, şəraitə, ya da hər hansı bir şey haqqında Rəsulullahdan soruşulan suala nüzul səbəbi" deyilir.

Yuxarıdakı tərifdə ön plana çıxan əsas xüsusiyyətlərdən biri hər hansı bir hadisənin baş verməsidir. Bəzi ayələr hər hansı bir hadisə nəticəsində nazil olmuşdur.

Tərifdə qeyd olunan ikinci xüsusiyyət bəzi ayələrin zühur edən bəzi xüsusi məsələlər haqqında nazil edilməsidir. Hz. Ömərin fərqli vaxtlarda etdiyi dua və təmənnilər nəticəsində nazil olan ayələri buna misal göstərmək olar. Hz. Ömərin belə dediyi rəvayət olunur: "Uca Allah üç dəfə mənim istəklərimə uyğun olaraq ayə endirmişdir. Bir gün Rəsulullaha dedim: " Ey Allahın Rəsulu! İbrahimin məqamını namaz yeri seçək". Bundan sonra Bəqərə surəsinin 125-ci ayəsi nazil oldu.[112]

Bir dəfə də: "Ey Allahın Rəsulu! Evinizı müxtəlif insanlar girib-çıxır, sizin xanımlarınızı görürlər. Onlara əmir edin ki, örtünsünlər"-dedim. Əhzab surəsinin 33-cü ayəsi məhz bundan sonra nazil oldu.[113]

Yenə başqa bir gün Hz. Peyğəmbərin xanımları qısqanlıq nəticəsində onu kədərləndirdikləri üçün "Əgər Rəsulullah sizi boşasa, Rəbbi ona sizdən daha xeyirli xanımlar bəxş edər..."-dedim. Bu hadisədən sonra isə Təhrim surəsinin 5-ci ayəsi endirildi.[114]

Tərifdə vurğulanan üçüncü xüsusiyyət isə bəzi ayələrin Hz. Peyğəmbərdən soruşulan suallara cavab olaraq endirilməsidir. Bu suallar daha çox səhabilərə aid olsa da, bəzən əhli-kiatba mənsub insanlar da ona sual verirdilər. Səhabilər daha çox din sahəsində bilmədikləri və ya anlamaqda çətinlik çəkdikləri məsələlrə barədə soruşurdular. Məsələn, Ali İmran surəsinin 97-ci ayəsi: "*Orada aydın nişanələr – İbrahimin məqamı vardır. Ora daxil olan şəxs əmin-amanlıqdadır (təhlükədən kənardır). Onun yoluna (ərzaq, minik, və sağlamlıq baxımından) gücü çatan hər bir kəsin həccə gedib o evi ziyarət etməsi insanların Allah qarşısında borcudur. Kim bunu (bu borcu) inkar edərsə (özünə zülm etmiş olar). Əlbəttə, Allah aləmlərə (heç kəsə) möhtac deyildir!*" nazil olduqda, səhabilər: "Hər ilmi həccə gedəcəyik

112 Buxari, Təfsir, Surə, 2.
113 Buxari, Təfsir, Surə, 2.
114 Buxari, Təfsir, Surə, 2.

ey Rəsulullah"-deyə soruşdular. Peyğəmbərimiz cavab vermədi. Onlar sualı təkrarladıqda "xeyir" cavabını verdi və buyurdu: "Əgər bəli desəydim sizə hər il həccə getmək fərz olunacaqdı". Bu suala cavab olaraq aşağıdakı ayə endirildi: *Ey iman gətirənlər! Sizə bəlli olunca qanınızı qaraldacaq şeylər barəsində soruşmayın. Əgər onlar haqqında Quran nazil edildikdə soruşsanız, onlar sizə aydın olar. (Lakin pis vəziyyətdə qalar və kədərlənərsiniz). Allah onları (indiyə qədər verdiyiniz bu cür sualları) bağışladı. Allah bağışlayandır, həlimdir! (Bəndələrinə əzab verməkdə tələsən deyildir!)"*[115]

Ancaq kitab əhlinin sualları bu cür məqsıd daşımırdı. Onlar Peyğəmbəri çətin vəziyyətdə qoymaq, möminlərin fikirlərini qarışdırmaq və islami dəyərləri ələ salmaq niyyəti ilə sual verirdilər.

Quranın tədricən endirlməsində böyük hikmət vardır. Allahtəala bununla Quranı müsəlmanların gündəlik həyat problemləri ilə əlaqələndirmək, həyatın bütün sahələrində onlara rəhbər olabiləcək bir kitab göndərmək istəmişdir. Quranın nazil olmasınsdakı bu tədricilik sonralar səhabiləri, tabeiləri və müsəlman alimlərini Quran ayələrinin nazil olması münasibətini araşdırmağa sövq etmişdir. Nəticədə "*əsbabün nüzul*" elmi meydana çxmışdır.

Quran ayələri Peyğəmərə (s.ə.s) onun istəyi və iradəsindən asıl olmayaraq, Allah-təalanın istədiyi şəraitdə, iradə etdiyi vaxtda, seçdiyi yerdə nazil olurdu. Ayələrdən bəzisi gecə, bəzisi gündüz, bir qismi dağda, bir qismi düzənlikdə, bir qismi qışda, bir qismi də yada nazil edilirdi. Peyğəmbərimizin oturduğu yerdə, minik üstündə, yolda və evdə olduğu vaxt vəhy aldığı məlumdur.

Quran alimləri bu elmi "*əsbabun-nüzul* (*nazil olma səbəbləri)*" adlandırmışlar. Əslində bunu səbəb yox, vasitə adlandırmaq daha düzgün olardı. Çünki Quran ayəlrinin nazil olmasını hər hansı bir

115 Maidə, 5/101

səbəbin nəticəsi kimi qiymətləndirmək doğru deyildir. Bu səbəblər sadəcə o ayələrin enməsi üçün vasitələrdir.

Onu da qeyd etmək lazımdır ki, Quranın bütün ayələrinin müəyyən səbəblərə görə nazil olmamışdır. İslam alimləri hər hansı bir səbəbə görə nazil olan ayələrin təxminən 600-ə qədər olduğu qənaətindədirlər. Ayələrin böyük bir hissəsi xüsusi bir hadisəyə, məsələyə və ya başaq hər hansı bir səbəbə görə deyil, ümumiyyətlə insanları möhtac olduqları məsələlərdə məlumatlandırmaq, aydınlatmaq, istiqamətləndirmək və ya xəbərdar etmək məqsədi ilə vəhy olunmuşdur.

Nüzul səbəbləri olan rəvayətlərdə bəzi xüsusi ifadələr işlədilir. Bu ifadələrin bəziləri keçdikləri rəvayətin həqiqətən də nüzul səbəbi olduğunu bildirirlər ki, bu ifadələr aşağıdakılardır: "Səbəbu nüzuli həzihil-ayə", "fənzələ Allahu həzihil-ayə", "nəzələt həzihil-ayə"

**1. Əsbabun-nüzul ilə əlaqəli rəvayətlərin səhihliyi məsələsi və rəvayətlərin müxtəlifliyi**

Təfsir alimləri nüzul səbəbləri haqqındakı rəvayətlərin səhihliyi məsələsində həssas davranmışlar. Səbəbi-nüzul elmi hər şeydən əvvəl rəvayətlə əlaqədar bir elm olduğu üçün hədis üsulunda hədislərin səhihliyi üçün qoyulan şərtlər burada da keçərlidir. Buna görə də, müfəssirlər səhih bir rəvayətə əsaslanmadan mühakimə, istidlal və ictihad yolları ilə nüzul səbəbi axtarmanın doğru olmadığını söyləmiş və səbəbi-nüzul rəvayətlərinin səhihliyi üçün bəzi şərtlər qoymuşlar. Bu şərtlər aşağıdakılardır:

a. Hədis üsulu elminin səhih hədislər üçün qoyduğu şərtlərin bu rəvayətlərdə də mövcud olması.

b. Səbəbi-nüzulla bağlı rəvayətlərdə bəhs olunan hadisələrin Hz. Peyğəmbərin yaşadığı dövrdə baş verməsi.

c. Rəvayətlərdə bəhs olunan xüsusiyyətlərlə həmin ayə və ya surələr arasında əlaqə olması.

Yekun olaraq deyə bilərik ki, səbəbi-nüzulla əlaqədar rəvayətlər ya səhih mərfu və mürsəl, ya da yuxarıdakı şərtləri daşıyan mürsəl bir xəbər olmalıdır. Bunların xaricindəki rəvayətlər qətiyyən qəbul olunmur.

Rəvayətlərin müxtəlifliyi (təaddudul-əxbar) deyildikdə isə, bir ayənin eniş səbəbi barədə birdən çox rəvayətin olması nəzərdə tutulur. Lakin bu rəvayətlər eyni hadisədən bəhs etsələr də, zaman, məkan və şəxslər baxımından fərqli ola bilərlər. Burada diqqət edəcəyimiz nöqtə həmin rəvayətlərdə bəhs olunan hadisənin şəkli deyil, rəvayətlər arasında səbəb baxımından hər hansı bir fərqliliyin olub-olmamasıdır. Əgər səbəb baxımından hər hansı fərqlilik varsa o zaman üsul alimlərinin qoyduğu bu kriteriyalara müraciət etməliyik:

a. Bir ayə və ya surənin nüzul səbəbi haqqında birdən çox rəvayət olarsa, əvvəlcə bu rəvayətlərin səhihliyinə baxılmalı, səhih olan qəbul edilməlidir.

b. Bir ayə və ya surənin nüzul səbəbi barədə iki rəvayət olarsa və bu rəvayətlərin hər ikisi də səhihdirsə, o zaman onların arasında hər hansı üstünlük səbəbi olub-olmadığına baxılır. Əgər bu rəvayətlərdən biri hadisənin şahidi olan ravi tərəfindən, digər isə səma (eşitmə) yolu ilə rəvayət edən ravi tərəfindən nəql olunursa və yaxud da bu rəvayətlərdən biri Buxarinin "Səhih"ində, digəri də başqa hədis kitabında keçirsə, o təqdirdə hadisənin şahidi olan ravinin nəql etdiyi və Buxarinin "Səhih"ində keçən rəvayət seçilər.

c. Bəzən ayələrin nüzul səbəblərindən bəhs edən hər iki rəvayət səhih olur və onların arasında hər hansı üstünlük səbəbi olmur. Bu vaxt rəvayətlərdəki hadisələrin zaman baxımından bir-birlərinə

yaxın olub-olmamasına baxılır. Əgər zaman baxımından da yaxınlıq varsa, bu rəvayətlər cəm və təlif olunur.

ç. Nəql olunan hər iki rəvayət səhih olar, lakin aralarında birini digərindən üstün edən bir səbəb olmazsa və hadisələrin zaman baxımından bir-birindən uzaqlığı nəticəsində cəm və təlif mümkün deyilsə, o vaxt həmin ayə və ya surənin mükərrər nazil olduğu qəbul olunur.

### 2. Əsbabün-nüzulun Quranın anlaşılmasındakı rolu

Əsbabün-nüzulun Quranın anlaşılmasındakı roluna gəldikdə bunu aşağıdakı kimi açıqlaya bilərik:

a. Bu elm Quranda bizə əmr edilən şeylərin hikmətini daha yaxşı anlamamıza kömək edir.

b. Nüzul səbəbləri bilindikdə ayələrdən qəsd olunan mənalar daha rahat başa düşülər. Belə ki, ayə və ya surənin harda, nə zaman, hansı şərtlərdə endiyini bilmə imkanı qazanırıq ki, bu da o ayə və ya surənin ilahi məqsədə uyğun olaraq təfsir edilməsinə yardım edər.

c. Həsr və təxsis şübhəsi ortadan qalxar.

d. Ayə və surələr arasındakı əlaqənin qurulmasını təmin edər.

Lakin yuxarıda sadalananların əksinə, bəzən əsbabün-nüzul rəvayətləri Quranı anlamağa mane olur ki, onun bu xüsusiyyətləri aşağıdakılardır:

a. Ayələri nüzul səbəbləri çərçivəsində açıqlayarkən onların hər hansı bir xüsusi hadisə və tarixi şərtlərlə məhdudlaşdırılması ortaya çıxa bilər ki, bu da ilahi muradın mənasından uzaqlaşmağa aparıb çıxarar.

b. Təfsir zənginliyinə mane olması.

c. Müfəssirləri həddindən çox məşğul edərək onların vaxtını boş yerə keçirmək.

d. Ortaya çıxan bəzi yeni problemlerin Quran nöqteyi-nəzərindən ələ alınmasına mane olmaq.

Bu sahədə alimlər bir çox əsər qələmə almışlar. Bunların arasında Vahidinin (vəfatı-468/1075) "*Əsbabün-nüzul*", İbn Teymiyyənin (vəfatı-728/1328) "*ət-Tibyan fi nüzulil Quran*" və Suyutinin (vəfatı-911/1505) "*Lübabun nüqul fi əsbabün nüzul*" adlı əsərləri ən məşhurlarıdır.

**B. Nəsx**

"*Nəsx*" lüğətdə "*ortadan qaldırmaq, yox etmək yazmaq ve bir şeyi bir yerden başqa bir yerə keçirmək*" kimi mənalara gəlir. Termin olaraq isə "*şəri bir hökmü başqa bir şəri dəlillə ortadan qaldırmaq*" deməkdir. Bundan başqa Quranın Kitabi-müqəddəs kimi özündən əvvəlki kitablardakı hökmlərin tətbiqatını qadağan etməsi də nəsx adlanır.

Dəyişilmiş hökmü ehtiva edən ayə mənsux ayə, başqa bir ayədəki hökmü dəyişdirən hökm ehtiva edən ayə isə nasix ayə adlanır. Quranda nəsxin olub olmaması məsələsi əsrlər boyunca mübahisə mövzusu olmuşdur.

Təfsir üsulunda qarışıq mövzulardan biri də nəsx mövzusudur. Bu mövzu ətrafında İslamın ilk dövrlərindən başlayaraq mübahisələr edilmişdir. Bəzi alimlər nəsxi "bəda" və "təxsis"lə qarışdırmışlar. Əslində bəda, mövcud olmayan bir şeyin meydana gəlməsi deməkdir. Təxsis isə ümumi olan bir şeyin bəzi hissələrini xüsusiləşdirməkdir.

**1. Nəsxin varlığını qəbul edənlər**

Əksər müsəlman alimləri Qurani-kərimin

مَا نَنسَخْ مِنْ آيَةٍ أَوْ نُنسِهَا نَأْتِ بِخَيْرٍ مِّنْهَا أَو مِثْلِهَا أَلَمْ تَعْلَمْ أَنَّ اللّهَ عَلَىَ كُلِّ شَيْءٍ قَدِير

*"Biz hər hansı bir ayənin hökmünü ləğv edir və ya onu unutdururuqsa, ondan daha yaxşısını, yaxud onun bənzərini gətiririk. Allahın hər şeyə qadir olduğunu bilmirsənmi*?!"[116] və

وَإِذَا بَدَّلْنَا آيَةً مَّكَانَ آيَةٍ وَاللّهُ أَعْلَمُ بِمَا يُنَزِّلُ قَالُواْ إِنَّمَا أَنتَ مُفْتَرٍ بَلْ أَكْثَرُهُمْ لاَ يَعْلَمُونَ

*"Biz bir ayənin hökmünü ləğv edib, onu başqası ilə əvəz etdikdə-Allah nə nazil etdiyini Özü daha yaxşı bilir- (kafirlər Mühəmmədə) "Sən ancaq bir iftiraçısan" deyərlər. Xeyr! Onların əksəriyyəti (bir hökmü başqası ilə əvəz etməyin hikmətini) bilməz*!" [117] ayələrini Quranda nəsxin mövcudluğuna dəlil kimi qəbul edirlər. Bundan başqa onlara görə bu mövzuda icma vardır və Quranda nəsxin varlığını göstərn səhabi rəvayətləri də vardır.

**2. Nəsxin varlığını rədd edənlərin dəlilləri**

a. Qurani-kərimdə hər hansı bir ayədə nəsxin varlığına dair açıq bir dəlil yoxdur. Nəsx tərəfdarlarının dəlil gətirdiyi Bəqərə 2/106, Nəhl 16/101 və Rəd 13/39 ayələri Quranın özündən əvvəlki kitabların hökmünü qaldırdığını bildirir. Yuxarıdakə ilk iki ayədəki "ayə" sözü "risalət" mənasında işlədilib. Üçüncü ayə də digər iki ayə kimi Quranın keçmiş risalətləri ortadan qaldırdığını bəyan edir.

b. Hz. Peyğəmbərin də bu mövzuda üzərində ittifaq ediləcək hər hansı bir hədisi mövcud deyildir.

c. Nasix və mənsux ayəlrin sayılarının nə qədər olduğu haqqında belə fikir birliyi əldə olunmamışdır. Nəsx olunan ayələrin sayını 500-ə qədər çıxaranlar olduğu kimi, bunu 5-ə qədər endirənlər də vardır. Məsələn, Suyutiyə görə mənsux ayələrin sayı 20, Şah Vəliyullah Dihləviyə görə isə 5-dir.

116 Bəqərə, 2/106
117 Nəhl, 16/101

d. Nəsxi qəbul edənlər mənsux ayənin əvvəl, nasix ayənin isə sonra nazil olduğunu göstərən dəlilləri hər zaman gətirə bilmirlər. Məsələn, Bəqərə surəsindəki "*iddət*" məsələsi ilə bağlı ayələrdə[118] olduğu kimi mənsux ayənin nasix ayədən sonra nazil olması hallarına da rast gəlinir.

e. Quranda nəsx iddiası İslam əqidəsi ilə əlaqədar məsələ deyildir. Buna görə də nəsxi rədd etmək küfr mənasına gəlmir.

**3. Nəsxlə təxsisin fərqi**

Biraz əvvəl nəsxlə təxsisin bir-birindən fərqli şeylər olduğunu qeyd etdik. İndi də onların arasındakı fərqlərin nələr olduğuna yer verək:

a. Nəsx hökmün bütün cüzlərini ləğv edər, təxsis isə hökmün sadəcə bir hissəsini ortadan qaldırar.

b. Nəsx sadəcə əmr və nəhylərdə olur, xəbərlərdə nəsx olmaz. Ancaq təxsis bunların hamısında ola bilər.

c. Nəsxdə mənsuxun əvvəl, nasixin isə sonra gəlməsi lazımdır. Təxsisdə isə belə bir şey yoxdur.

d. Nəsx sadəcə kitab və sünnədə, təxsis isə bunlarla yanaşı digər şeylərədə də ola bilər.

**4. Nəsxin şərtləri**

Nəsx üçün bəzi şərtlər qoyulmuşdur ki, bunlar aşağıdakılardır:

a. Nasix və mənsux nəsslər arasında bir-biriylə uyğunlaşdırılmayacaq dərəcədə ziddiyət olmalıdır. Əgər hər iki nəssi bir-biriylə uzlaşdırmaq mümkündürsə o zaman burada nəsxə yer yoxdur.

118 Bəqərə, 2/ 240 və 224

b. Nəsxlə əlaqədar nəsslərin şəri bir hökm daşıması və mənsux nəssin əbədi olduğuna dair hər hansı bir ifadənin olmaması lazımdır.

c. Nasixlə mənsux arasında zaman baxımından fərq olmalıdır. Yəni mənsux ayə nasix ayədən əvvəlcə nazil olmalıdır. Əks halda nəsx olmaz.

d. Nəsxə aid olan hökm yaxşılıq və ya pislikdən bəhs edən hökm olmamalıdır. Məsələn, ana-ataya yaxşılıq etmək, zülm və əxlaqsızlıq kimi hökmlərdə nəsx qeyri-mümkündür.

e. Nasixin ən azından mənsux səviyyəsində və ya ondan daha üstün olması vacibdir.

**5. Nəsxin növləri**

Müfəssirlər Quranda üç növ nəsxin olduğunu söyləmişdirlər:

***a. Hökm qalır, amma mətn nəsx edilir.*** "*Rəcm*" ayəsi kimi. Hədis kitablarında bu ayə belə keçir: "*Evli kişi ilə evli bir qadın zina edərsə, Allahdan bir cəza olaraq onları mütləq rəcm edin. Allah əzizdir, hikmət sahibidir*". Səhihi Buxaridə keçən bir rəvayətə görə Hz. Ömər belə bir ayənin əvvəllər var olduğunu, sonra isə mətninin nəsx olundunğunu söyləyir. Lakin hədis tənqidçilərinin bir çoxu bu hədisin səhihliyini qəbul etməmişlər. Bundan başqa bu rəvayət Quranın ümumi prinsiplərinə uyğun gəlmir. Çünki məntiqlə düşünsək, yazılı olmayan bir ayənin hökmünün mühafizə edildiyini qəbul etmək mümkün deyildir. Əgər bu ayə bir hökm gətirmişsə nə üçün onun mətni Quranda yazılmamışdır? Bir mətnin Qurandan olduğunu qəbul etmək üçün onun mütəvatir olaraq gəlməsi lazımdır. Rəcm ayəsi isə belə bir xüsusiyyət daşımır.

***b. Mətnin həm oxunuşu, həm də hökmü nəsx edilir.*** Yəni vəhy edilməsinə baxmayaraq həm hökmü, həm də mətni nəsx edildiyi

üçün Qurana yazılmayan ayələr. Buna misal olaraq Hz. Aişədən nəql olunan "*Bilinən on əmizdirmə haramlıq yaradır*" ayəsi haqqındakı rəvayətdir. O, bu barədə belə demişdir: "*Bilinən on əmizdirmə haramlıq yaradır*" ayəsi Quranda var idi. Ancaq daha sonra "bilinən beş əmmək" ayəsi ilə nəsx edildi. Hz. Peyğəmbər vəfat edərkən onlar Quran ayələri kimi oxunurdular".[119]

***c. Mətn qalır, hökm isə nəsx edilir.*** Buna misal olaraq Ənfal surəsinin 65 və 66-cı ayələrini verə bilərik.

يَا أَيُّهَا النَّبِيُّ حَرِّضِ الْمُؤْمِنِينَ عَلَى الْقِتَالِ إِن يَكُن مِّنكُمْ عِشْرُونَ صَابِرُونَ يَغْلِبُواْ مِئَتَيْنِ وَإِن يَكُن مِّنكُم مِّئَةٌ يَغْلِبُواْ أَلْفًا مِّنَ الَّذِينَ كَفَرُواْ بِأَنَّهُمْ قَوْمٌ لاَّ يَفْقَهُونَ

*" Ey Peyğəmbər! Mömінləri döyüşə qaldır. Əgər sizin aranızda iyirmi nəfər səbirli adam olsa, iki yüz ( kafirə) qalib gələr, əgər aranızda yüz nəfər olsa kafirlərdən mininə üstün gələr, çünki onlar anlamaz camaatdır"* [120]

الآنَ خَفَّفَ اللّهُ عَنكُمْ وَعَلِمَ أَنَّ فِيكُمْ ضَعْفًا فَإِن يَكُن مِّنكُم مِّئَةٌ صَابِرَةٌ يَغْلِبُواْ مِئَتَيْنِ وَإِن يَكُن مِّنكُمْ أَلْفٌ يَغْلِبُواْ أَلْفَيْنِ بِإِذْنِ اللّهِ وَاللّهُ مَعَ الصَّابِرِينَ

*"İndi isə Allah (vəziyyəti) sizin üçün yüngülləşdirmişdir. O bilir ki, sizdə zəiflik vardır. Əgər içərinizdə yüz səbirli adam olsa, onlar iki yüz adama qalib gələrlər. Əgər sizdən min nəfər olsa, Allahın izni ilə iki min nəfərə qalib gələr. Axı Allah səbr edənlərlədir."*[121]

İlk ayədə "*iyirmi*"və " *yüz*" kimi veilən rəqəmlər, ikinci ayədə "*yüz*" və "*min*" kimi verilmişdir. Alimlər də burdan yola çıxaraq ikinci ayənin birinci ayəni nəsx etdiyi nəticəsinə gəlmişlər. Ancaq nəsxi qəbul etməyənlər müsəlmanların əsri-səadəttən sonra say baxımından çoxaldıqlarını, keyfiyyət baxımından isə azaldığını,

119 Müslim, Rəda, 24.
120 Ənfal, 8/65
121 Ənfal, 8/ 66

buna görə də müsəlmanların güclü olduqları zaman birinci ayə ilə, bu gücə sahib olmadıqları zaman isə ikinci ayə ilə əməl etmələrinin lazım olduğunu söyləmişdirlər.

Nəsxin bu növünə Bəqərə surəsinin 234 və 240-cı ayələri də misal göstərilir. Belə ki, 240-cı ayədə qadınların iddət müddəti bir il, 234-cü ayədə isə dörd ay on gün olaraq göstərilir və 234-cü ayənin 240-cı ayəni nəsx etdiyi bildirilir. Lakin nəsxi qəbul etməyənlər 240-cı ayədəki bir il müddəti, qadının istəyinə bağlı olaraq ərinin evində qala biləcəyi müddət, digər ayədəkinin isə qalma məcburiyyətində olduğu müddət kimi açıqlamışlar.

Nəsx mövzusunda bir çox əsər qələmə alınmışdır ki, Əbu Übeyd əl-Qasım İbn Səllamın (vəfatı-224/838) "*ən-Nasix və-l mənsux*", Məkki İbn Əbu Talibin (vəfatı-437/1045) "*əl-Ecaz fi nasixil-Quran və mənsuxuhi*" və Mustafa Zeydin "*ən-Nəsx fi Quranil- kərim*" adlı əsərləri bunlardan bəziləridir.

**C. Möhkəm və mütəşabeh ayələr**

"*Mütəşabeh*", lüğətdə iki şeyin bir-birinə bənzəməsi mənasına gələn "*təşabüh*" məsdərindən törəmiş ismi-faildir. Məfhum olaraq da "*nəyin qəsd olunduğu bilinməyən, izaha, təvilə ehtiyacı olan ayələr*" deyə tərif edə bilərik. Ayələrin möhkəm və mütəşabehliyi mövzusunda Quranda bu ayələr keçir:

1. Hud surəsini 1-ci ayəsində belə buyurulur:

الَر كِتَابٌ أُحْكِمَتْ آيَاتُهُ ثُمَّ فُصِّلَتْ مِن لَّدُنْ حَكِيمٍ خَبِيرٍ

*"Əlif, ləm, ra (bu) elə bir kitabdır ki, ayələri hikmət sahibi və hər şeydən xəbəri olan (Allah) tərəfindən möhkəm təsbit edilmiş, sonra isə müfəssəl aydınlaşdırılmışdır".* Bu ayəyə görə Quran başdan sona qədər möhkəm ayələrdən ibarətdir.

2. Zümər surəsinin 23-cü

اللَّهُ نَزَّلَ أَحْسَنَ الْحَدِيثِ كِتَابًا مُّتَشَابِهًا مَّثَانِيَ

*“Allah sözün ən gözəlini (Quranı) ayələri bir-birinə bənzəyən, hökmləri qarşılıqlı (cəza – mükafat) olan kitab şəklində nazil etmişdir....”* ayəsinə görə isə Quran tamamilə mütəşabehdir.

3. Ali İmran surəsinin 7-ci

وَأُخَر مُتَشَابِهَاتٌ الَّذِي أَنزَلَ عَلَيْكَ الْكِتَابَ مِنْهُ آيَاتٌ مُّحْكَمَاتٌ هُنَّ أُمُّ الْكِتَابِ هُوَ

*“Kitabı sənə nazil edən Odur. Orada qəti mənalı (möhkəm) ayələr vardır ki, onlar Kitabın əsasıdır. Başqa ayələr isə oxşar mənalıdır (mütəşabehdir)...”* ayəsinə görə isə Quran ayələrinin bir qismi möhkəm, digər bir qismi isə mütəşabehdir.

İlk baxışda burada bir ziddiyətin olduğu qənaətinə vararıq. Ancaq diqqətlə incələdikdə görərik ki, Hud surəsindəki “*möhkəm*” sözü pozulmaqdan uzaq, sağlam və sonsuz hikmətləri ehtiva etmək mənasını daşıyır.

Quranın başdan sona qədər mütəşabeh olduğunu göstərən Zümər surəsinin -٢٣cü ayəsi də ayələrin bəlağət, fəsahət və ecaz yönləri ilə bir-birinə bənzədikləri mənasındadır. Ali İmran surəsinin -٧ci ayəsinə gəlincə, bu ayə termin mənasında Quranın bir hissəsinin möhkəm, bir hissəsinin də mütəşabeh olduğunu ifadə edir.

### 1. Mütəşabehin növləri

Şatıbi (vəfatı-790/1388) mütəşabehləri iki qismə ayırır: mütləq mütəşabehlər və izafi mütəşabehlər.

#### a. Mütləq mütəşabehlər

Bu mütəşabehlərin mahiyyətini yalnız Allah-təala bilir. Bəşər ağlı bunu idrak etməkdən acizdir. Bu mütəşabehlərin başında “*hü-*

*rufu müqəttəə”* gəlir. Bundan başqa Allahın sifətləri, axirət xəbərləri, *“ruh”*, *“sur”*, *“dabbətül-ərz”*, *“ərş”*, *“kürsi”*, *“lövhi –məhfuz”* və s. kimi ifadələr də mütəşabehlərin bu növünə daxildir.

**1. Ruh**

*(Ya Rəsulum!) Səndən ruh (ruhun mahiyyəti və keyfiyyəti) haqqında soruşarlar. De: “Ruh Rəbbimin əmrindədir. (Allahın əmri ilə yaradılmışdır). Sizə (bu barədə) yalnız cüzi (az) bir bilik verilmişdir!”*[122] ayəsində keçən ruhun mahiyyəti haqqında məlumatımız olmadığı kimi, burada ruhdan qəsd olunan mənanın Quranmı, Cəbrailmi, Quranın vəhy olunuş şəklimi, yoxsa bədənlərə həyat verən ruhmu olduğunu də bilmirik.

**2. Sur**

Quranın on ayəsində “sur” kəlməsi keçir. Sur kəlməsinin də mahiyyəti bilinmir. Müfəssirlər, surun ceyran və ya başqa heyvanların buynuzlarından hazırlanan və güclü səs çıxaran boru olduğunu söyləmişlər.

Qurani-kərim nə surun mahiyyəti haqqında, nə də surun ilk dəfə nə zaman çalınacağı və surun hər dəfə çalınması müddətinin nə qədər olacağı barədə məlumat vermir. Bu barədə gələn rəvayətlər israili rəvayətlərdir. Ona görə də sur mütləq mütəşabehlərdən hesab olunur.

**3. Dəbbətul-ərz**

*Onlara deyilən söz yerinə yetdiyi (qiyamət yaxınlaşdığı) zaman onlar üçün yerdən (möminlərlə kafirləri xüsusi nişanla bir-birlərindən ayıran) bir heyvan çıxardarıq ki, onlarla danışıb (Bizim adımızdan): “İnsanlar ayələrimizə inanmırdılar!” – deyər* ayəsində[123] qiyamətdən öncə

122 İsra, 17/85
123 Nəml, 27/82

yerdən bir heyvanın çıxarılacağı bildirilir. "Dəbbətul-ərz" adlı bu heyvanın necə bir heyvan olduğu, böyüklüyü, harda, nə zaman, necə ortaya çıxarılacağı barədə müxtəlif görüşlər vardır. Lakin bu barədə söylənənlərin heç birisi Nəml surəsinin 82-ci ayəsində yoxdur. Hədislərdə də bu heyvan haqqında müxtəlif rəvayətlər keçir. Buna görə də bu kəlmə də mütaşabeh kəlmə hesab olunur.

**b. İzafi mütəşabehlər**

Bunlar alimlərin izah etməyə, təvil etməyə səy göstərdikləri mütəşabehlər olub öz içərisində iki yerə ayrılır: Ləfzi mütəşabehlər və mənəvi mütəşabehlər.

Ləfzi mütəşabehlər də qərib və müştərk sözlər olmaq üzrə iki qismə ayrılır. Əbəsə surəsinin 31-ci ayəsindəki "*əbbən*" kəlməsi qərib sözlərə misal verilə bilər. Müştərək sözlərə gəlincə Quranda bəzi sözlər vardır ki, bunlar birdən çox mənaya gəlir. Buna misal olaraq Saffat surəsindəki "*yəmin*" sözünü verə bilərik. Bu söz "*sağ əl*", "qüvvət" və "*and*" kimi müxtəlif mənalarda işlədilir.

Mənəvi mütəşabehlər ayələrin mənalarında olur. Bu ayələrin mənaları açıq olmadığı üçün bunlar bir çox mənaya gələ bilər. Allahın varlığına və qüdrətinə işarə edən ayələrlə kainat haqqındakı bəzi həqiqətləri dilə gətirən ayələr mənəvi mütəşabihlərə daxildir.

Aşağıdakı:

*Birinin suyu çox şirin, digərininki isə olduqca şor (acı) olan iki dənizi qovuşduran, aralarında (bir-birinə qarışmamaq üçün) maneə və keçilməz sədd qoyan Odur!*[124]

*(Suları şirin və acı olan) iki dənizi O qovuşdurdu (bir-birinə qovuşmaq üçün açıb buraxdı).Amma onların arasında maneə vardır, bir-birinə qatışmazlar (özləri üçün müəyyən edilmiş həddi aşmazlar)*[125] ayələri

124 Furqan, 25/53
125 Rəhman, 55/19-20

mənəvi mütəşabehə misal göstərilə bilər. Bu ayələrdə keçən və şirin su ilə acı suyun qarışmasına mane olan səddi Təbəri, Razi, İbn Kəsir və Əlmalılı Həmdi Yazır iki dəniz arasındakı “quru” və ya “Allahın öz qüdrətindən yaratdığı sədd” şəklində izah etmişlər. Halbuki son elmi araşdırmalar bu iki su kütləsinin bir-birinə qarışmasına mane olan şey, iki dəniz arasındakı “su əngəli”dir. Bunu ilk dəfə fransız dənizçisi Kapitan Kusto Cəbəllütariq boğazında kəşf etmişdir.

Zariyat surəsinin 47-ci ayəsində Allah-təala belə buyurur: وَالسَّمَاء بَنَيْنَاهَا بِأَيْدٍ وَإِنَّا لَمُوسِعُونَ *“Biz səmanı qüdrətimizlə qurduq. Biz onu genişləndiririk”*.

Əvvəlki əsrlərdə yaşamış müfəssirlər bu ayədəki “*musiun*” kəlməsini Allahın qüdrətinin və məxluqata verdiyi ruzinin genişlədilməsi kimi izah etdikləri halda günümüz alimləri eyni ayənin kainatın genişləməsi teoriyasına işarə etdiyini söyləyirlər.

**2. Mütəşabeh ayələrin Quranda yer almasının hikmətləri**

Mütəşabeh ayələrin Quranda yer almasının hikmətlərini belə sıralamaq olar:

a. Bunlar insanlar üçün bir imtahan vasitəsidir. Çünki bu ayələr insanın qeybə olan imanının ölçüsünü göstərər.

b. İnsan nə qədər bilgili və qabiliyyətli olsa da bu ayələr ona onun acizliyini və cəhalətini göstərir, Allahın qüdrətini dərk etdirir.

c. Mütəşabeh ayələr sayəsində Quranı əzbərləmək və mühafizə etmək asanlaşmışdır. Belə ki, əgər bu ayələrdəki mənalar geniş bir şəkildə ələ alınsaydı o zaman Quran bir çox cilddən ibarət olardı və onu əzbərləmək çox çətinləşərdi.

d. Bu ayələr insanın zehni inkişafını artırır və onu düşünməyə sövq edir.

Qazi Abdulcəbbarın (vəfatı-415/1024) "*Mütəşabihul-Quran*", Suyutinin (vəfatı-911/ 1505) "*Mütəşabihul-Quran*" adlı əsərləri bu sahədə yazılmış önəmli əsərlərdəndir.

**D. Hüruful-müqəttəə**

Qurani-kərimdə bəzi surələrin baş hissəsində yerləşən hərflərə "müqəttəə hərfləri" (kəsik hərflər) deyilir. Bu hərflər iyirmi doqquz surədə yer alır. On dörd fərqli hərfdən ibarət olub, on üç şəkildə gəlir. Bu hərflərin müstəqil ayə olduğunu söləyənlər kimi, bunları müstəqil ayə hesab etməyənlər də vardır. Kufə alimlərinə görə bu hərflər bəzi yerlərdə müstəqil ayə, bəzi yerlərdə isə ayənin bir hissəsidir. Bəsrəlilər isə bu hərflərin heç birini mütəqil ayə saymamışlar.

Müqəttəə hərflərinin şərh edilib edilməyəcəyi haqqında iki fərqli görüş vardır. Bunlardan birincisi sələf alimlərinin görüşüdür ki, onlara görə bu hərflər Quranın sirlərindəndir və bunların mənası insanlardan gizlədilmişdir. Məsələn, Hz. Əbu Bəkir bu barədə belə deyir: "Hər kitabın bir sirri vardır. Allahın Qurandakı sirri də surələrin əvvəlindəki hərflərdir". Hz. Əli də bu hərflər haqqında belə demişdir: "Hər kitabın özəyi vardır. Bu kitabın da özəyi hürufu-müqəttəədir".

Razi, Əlmalılı və s. kimi bəzi müfəssirlər də bu hərflərin Quranın sirri olduğunu söyləmişlər. Bu görüşü mənimsəyənlərə görə bu hərflərin mənaları var. Lakin bu mənaları sadəcə Hz. Peyğəmbər bilirdi.

İkinci görüş sahibləri olan xələf alimləri isə bu hərfləri şərh etmək tərəfdarlarıdır. Onlar Allah-təalanın insanalara mənası bilinməyən şeyləri endirməyəcəyi qənaətindədirlər. Ancaq alimlər bu hərflərin mənası haqqında yekdil fikrə sahib deyillər. Bu mövzuda iyirmiyə

qədər görüş ortaya atılmışdır. Bəzilərinə görə müqəttəə hərfləri Allahın ad və sifətlərindən bir qisminə işarə edir. İbn Abbasdan gələn bir rəvayətə görə "*əlif, ləm, mim*" hərfləri "*Allah*", "*Lətif*" və "*Məcid*" adlarını göstərir. Dəhhaka görə isə əlifdən "*Allah*", ləmdən " *Cəbrayıl*" , mim hərfindən isə "*Mühəmməd*" (s.ə.s) qəsd olunmuşdur. Bir qrup alimə görə isə bu hərflər olduqları surəlrin adlarıdır. Digər bir qrup alim isə bu hərflərlə and içməyin murad edildiyini söyləmişlər. Bir başqa görüşə görə isə bu hərflər inanmayanların diqqətini cəlb etmək üçündür.

Nəticə olaraq bu hərflər haqqında bunları demək mümkündür:

1. Ya Allah-təala bu hərflərin Özü ilə Rəsulu arasında sirr olaraq qalmasını istəmişdir.

2. Ya da səhabilər bunlar barədə Hz. Peyğəmbərdən bir şey soruşmadıqları üçün Rəsulullah (s.ə.s.) bu hərflər haqqında heç bir söyləməmişdir.

3. Və yaxud da, səhabilər bu hərflərin mənasını bilirdilər, ona görə də Peyğəmbər (s.ə.s. ) bu hərfləri izah etməyə ehtiyac görməmişdir.

### E. Surələrin başlanğıcları (Fəvatihus-suvər)

Qurani-kərimdə surələrin başlanğıcları müxtəlif şəkillərdədir. Onları aşağşdakı kimi qruplaşdırmaq olar:

**1. Allah Təalanın öyülməsi ilə başlayan surələr.** Bunlar on dörd surə olub beş yerdə "*əl-həmdu lilləh*", iki yerdə "*təbarəkə*", yeddi yerdə isə "*təsbeh*" ifadələri ilə başlayır. Həmin surələr bunlardır: Fatihə, Ənam, İsra, Kəhf, Furqan, Səbə, Fatir, Hədid, Həşr, Saff, Cümə, Təğabun, Mülk və Əla.

**2. Heca hərfləri (müqəttəə hərfləri) ilə başlayan surələr.** Daha əvvəldə qeyd etdiyimiz kimi bunlar iyirmi doqquz surədir: Bəqərə, Ali-İmran, Əraf, Yunus, Hud, Yusuf, Rəd, Ibrahim, Hicr, Məryəm, Taha, Şüəra, Nəml, Qəsəs, Ənkəbut, Yasin, Sad, Mömin, Fussilət, Şura, Zuxruf, Duxan, Casiyə, Əhqaf, Qaf və Qələm surələri.

**3. Nida ilə başlayan surələr.** Quranda on surə nida ilə başlayır. Bunların beşi Hz. Peyğəmbərə, digər beşi də onun ümmətinədir. Bu surələr isə belədir: Nisə, Maidə, Hac, Əhzab, Hucurat, Mumtəhinə, Talaq, Təhrim, Müzzəmmil və Müddəssir surələri.

**4. Xəbər cümləsi ilə başlayan surələr.** Bunlar iyirmi bir surə olub Ənfal, Tövbə, Nəhl, Ənbiya, Muminun, Nur, Zümər, Mühəmməd, Fəth, Qəmər, Rəhman, Mücadələ, Haqqə, Məaric, Nuh, Əbəsə, Qədr, Bəyyinə, Qariə, Təkasur və Kövsər surələrindən ibarətdir.

**5. Qəsəm (and) ilə başlayan surələr.** Bunlar da on yeddi surədən ibarət olub Saffat, Zariyat, Tur, Nəcm, Qiyamət, Mursəlat, Naziat, Buruc, Tariq, Fəcr, Bələd, Şəms, Leyl, Duha, Tin, Adiyat və Əsr surələridir.

### F. Quranın ecazkarlığı

Yəqin ki, İslam düşüncəsi tarixində ilk nəzəri mübahisələr Quranın ecazkarlığı məsələsi ilə əlaqədar meydana çıxmışdır. Qurani-kərimin möcüzəli və bənzərsiz olması, onun təqlidedilməzliyi haqqında təsəvvürlər hələ Hz. Peyğəmbərin sağlığında müşriklərlə kəskin əqidə ixtilafları şəraitində yaranmış və Quranda öz əksini tapmışdır.

Peyğəmbərlərin tarixinə dair mənbələr göstərir ki, hər bir risalə sahibi müəyyən əlamətlərlə, onun adi insanlardan fərqləndiyini, Allah tərəfindən seçilmiş olduğunu bildirən möcüzələrlə gəlmişdir: adi şüur insanın Allahla əlaqəsi barədə hər iddianı qəbul et-

mir, peyğəmbərlik iddiasında olanlardan nə isə qeyri-adi, amma görünən, duyulan, hiss edilən bir şey tələb edir. Allah-təala Musaya (ə.s) ilana çevrilə bilən əsa vermişdi ki, o öz əsası ilə Nil çayını iki yerə ayırmışdı, İsa (ə.s) xəstələrə şəfa verə bilirdi, ona ölüləri diriltmək qabiliyyəti bəxşedilmişdi. Allah-təala istəmişdir ki, Onun sonuncu Peyğəmbərinin möcüzəsi Quran olsun. Çunki ərəblər öz bəlağətləri və fəsahətləri, natiqlik qabiliyyətləri ilə fərqlənmiş, gözəl şer nümunələri yaratmışdılar. Onlar öz dillərinin təmizliyi, səlisliyi, söz sənəti sahəsindəki məharətləri ilə fəxr edirdilər. Buna görə də onlar üçün ən böyük möcüzə dil cəhətindən olabilərdi.

"*Ecaz*", lüğətdə "*aciz qoymaq*" mənasına gəlir. Bir şeyin bənzərini düzəltməkdən başqalarını aciz qoyan şeyə də "*möcüzə*" deyilir. Quranın ecazkarlığı deyildikdə isə "*onun bütün insanları öz oxşarını meydana gətirməkdən aciz qoyması*" nəzərdə tutulur. Quranın oxşarını meydana gətirmək bəşər qüdrətinin fövqündədir. Quran fəsahət və bəlağət baxımdan elə bir səviyyədədir ki, bir insanın ona nəzirə yazması qeyri-mümkündür. Ancaq mötəzili alimi olan Nəzzamın (vəfatı-231/845) bu mövzuda bir etirazı vardır. Onun bu mövzuda irəli sürdüyü iddia "*sərfə*" adını almışdır. **Sərfə nəzəriyyəsinə** görə Allah-təala ərəblərin Qurana nəzirə yazmalarına mane olmuşdur. Quranın möcüzəvi yönü də məhz bu maneədən qaynaqlanır. Əgər Allah mane olmasaydı insanlar Quranın oxşarını meydana gətirə bilərdilər.

Lakin, İslam alimlərinin əksəriyyəti onun bu nəzəriyyəsini qəbul etməyərək onu bəzi yönlərdən tənqid etmişlər. Çünki sərfə nəzəriyyəsini qəbul etsək, o zaman Quranın meydan oxumasına ecaz deyil, təciz deyilərdi. Həmçinin Qurani-kərimin aciz qoyma vəsfi olmasaydı onun möcüzə olduğunu söyləyə bilməzdik. Quran onun ilahi bir kitab olduğuna qarşı çıxanlara meydan oxuyaraq belə buyurur:

قُلْ فَأْتُوا بِكِتَابٍ مِّنْ عِندِ اللَّهِ هُوَ أَهْدَى مِنْهُمَا أَتَّبِعْهُ إِن كُنتُمْ صَادِقِينَ .

*“Ey Rəsulum! Onlara de: “Əgər düz deyirsinizsə, ondan Allahın dərgahından elə bir kitab gətirin ki, bunların ikisindən (Tövrat və Quran) də daha doğru yol göstərici olsun. Mən də onun ardınca gedim”.*[126]

Bu mümkün olmadığı üçün heç olmasa özü kimi bir kitab meydana gətirməklərini istəyərək belə buyurur:

قُل لَّئِنِ اجْتَمَعَتِ الإِنسُ وَالْجِنُّ عَلَى أَن يَأْتُواْ بِمِثْلِ هَـذَا الْقُرْآنِ لاَ يَأْتُونَ بِمِثْلِهِ وَلَوْ كَانَ بَعْضُهُمْ لِبَعْضٍ ظَهِيرًا

*“De: “İnsanlarla cinlər bir yerə yığışaraq bu bənzərini gətirmək istəsələr, bir-birlərinə arxa olsalar belə onun kimisini gətirə bilməzlər”.*[127]

Qurani-kərim insanlara meydan oxumağa davam edərək onların Qurandakı surələrə bənzər on surə, buna da gücləri çatmasa heç olmasa bir surə meydana gətirmələrini istəməkdədir:

أَمْ يَقُولُونَ افْتَرَاهُ قُلْ فَأْتُواْ بِعَشْرِ سُوَرٍ مِّثْلِهِ مُفْتَرَيَاتٍ وَادْعُواْ مَنِ اسْتَطَعْتُم مِّن دُونِ اللّهِ إِن كُنتُمْ صَادِقِينَ

*“Yaxud da onlar deyərlər: “Bunu (Quranı) o, özündən uydurubdur”. De: “Əgər haqlısınızsa, onda Allahdan başqa kimi bacarırsınızsa,köməyə çağırın və buna bənzər uydurulmuş on surə də siz gətirin.”*[128]

*“Yaxud da onlar deyərlər: “Onu o (Mühəmməd peyğəmbər) uydurmuşdur”. De: “Əgər düz deyirsinizsə, onda Allahdan başqa kimi bacarırsınızsa, köməyə çağıraraq siz də ona bənzər surə bir gətirin!”*[129]

Qurani-kərimin meydan oxumasına rəğmən heç kəs onun bənzərini meydana gətirməyə müvəffəq olmamışdır. Mənbələr bizə bəzi inkarcıların ilk dövrlərdə Qurana nəzirə yazmağa çalışdıqlarını xəbər verir. Məsələn, Müseyləmə ibn Kəzzabın fili vəsf edən bu bənzətməsi çox məşhurdur: “əl-filu məl-filu və mə ədrakə məl-

126 Qəsəs, 28/49.
127 İsra, 17/88.
128 Hud, 11/13.
129 Yunus, 10/38.

filu, ləhə mişfərun tavilun və zənəbun əsilun / Fil, nədir o fil? Sən bilirsənmi o fil nədir? Onun uzun xortumu və böyük quyruğu var".

əl-Xəttabi "*Bəyanu icazil-Quran*" adlı əsərində bu nəzirə barədə belə deyir: "Ey aciz insan! Sən bilmirsənmi ki, belə bir üslub tərzi sadəcə çox əhəmiyyətli və mənalı bir məsələdən bəhs edərkən işlədilir? Görmürsənmi ki, Allah-təala sadəcə insanları dəhşətə salan və mahiyyətini də Özündən başqa heç bir kəsin bilmədiyi qiyamətdən danışarkən :

بسم الله الرحمن الرحيم. الْحَاقَّةُ . مَا الْحَاقَّةُ. وَمَا أَدْرَاكَ مَا الْحَاقَّةُ

"*O qiyamət! Nədir o qiyamət? Sən bilirsənmi qiyamət nədir ?*"[130] ayəsində olduğu kimi bu üslubu işlədir?"

**Qurani-kərimin ecaz yönlərinə gəldikdə bunlar aşağıdakılardır:**

**1. Nəzm və təlif**

"*Nəzm*" kəlməsi "*tərtib etmək, düzmək*", "*təlif*" isə "*sıraya düzmək*" mənalarını daşıyır.

Quranın hərfləri, kəlmələri və ayələri elə tərtib edilmişdir ki, onlardan hər hansı birini yerindən tərpətmək qeyri-mümkündür. İyirmi üç ildə fasilələrlə nazil olmasına baxmayaraq bu şəkildə tərtib olunması onun ecazkarlığını göstərən nişanələrdən biridir.

**2. Dil və üslubu**

Qurani-kərimin ən əsas ecazkarlığı onun dil və üslubundadır. Səs nizamındakı həmahənglik, ləfz-məna tarazlığı, eyni vaxtda müxtəlif səviyyədə olan insanlara xitab etməsi, müxtəlif mövzuların iç-içə olması və bəyan tərzindəki müxtəliflik Quranın dil və üslub cəhətlərindən ecazkarlığını göstərir.

**3. Qeybdən xəbər verməsi**

130 Həqqa, 69/1-3.

Quranda keçmişə, indiyə və gələcəyə dair xəbərlər vardır. Məsələn, risalətin ilk illərində səsanilər tərəfindən məğlub edilən bizanslıların çox yaxın bir zamanda onlara qalib gələcəyi Rum surəsində bildirilmişdir ki, həqiqətən də yeddi il sonra bizanslılar səsanilərə qalib gəlmişlər.[131]

**4. Bəşəriyyətin ehtiyacını qarşılaması**

Qurani-kərim hər əsrdə və hər yerdə insanlara doğruluğu göstərərək onları həm bu dünyada, həm də axirətdə xoşbəxt etməyi özünə bir hədəf etmşdir. O bəşəriyyətin mənəvi, ictimai, əxlaqi və iqtisadi əsaslar ilə yanaşı onun ruh, qəlb və vicdan təmizliyi, sağlamlığı, idarəçiliyi, hüquq və axirət həyatına dair prinsiplər gətirmişdir.

**5. Elmi cəhətdən ecazkarlığı**

Qurani-kərim insanlar ibrət alsınlar deyə elmi həqiqətlərdən də bəhs etmişdir. Müasir elmlərin kəşf etməyə çalışdığı bəzi elmi həqiqətlər əsrlər əvvəl Quran tərəfindən bildirilmişdir. Yer və göyün hərəkəti və digər xüsusiyyətləri haqqındakı Qurani bilgilər[132] bunun ən bariz nümunələridir.

**6. Quranın Hz. Peyğəmbər tərəfindən dəyişdirilməməsi**

Müşriklərin Hz. Peyğəmbərdən Quranın onlardan istədiyi bəzi şeyləri dəyişdirməsini tələb etmələrinə baxmayaraq, Onun müşriklərin bu arzularını yerinə yetirməməsi və Quranın da Rəsulullahı (s.ə.s) bu mövzuda xəbərdar etməsi də Quranın ilahi bir mənbədən gəldiyini və möcüzəvi bir kitab olduğunu göstərir. *"Onlara ayələrimiz açıq şəkildə oxunduğu zaman (öldükdən sonra) bizim görüşümüzə ümidi olmayanlar dedilər:"Ya bundan başqa bir Quran gətir,*

131 Rum, 30/1-5.
132 Ənbiya, 21/30, Zümər, 39/5, Naziat, 79/30, Yasin, 36/38.

*ya da bunu dəyişdir." De ki, "Mənim onu öz tərəfimdən dəyişdirməyə haqqım yoxdur. Mən mənə vəhy olunana tabeyəm..."*[133]

Quranın ecazkarlığına dair bir çox əsər qələmə alınmışdır ki, bunlardan bəziləri aşağıdakılardır:

1. Rummani (vəfatı-384/994), *ən-Nükət fi icazil-Quran*.

2. Əl-Xəttabi (vəfatı-388/998), *Bəyanu icazil-Quran*.

3. əl-Baqillani (vəfatı-403/1012), *İcazil-Quran*.

4. Mustafa Sadiq ər-Rafii (vəfatı-1357/1938), *İcazul-Quran və bəlağatun-nəbəviyyə*.

**G. Qəribul-Quran**

Ərəb dilində "*ğərib*" sözü "*yurdundan uzaq qalan, bənzəri olmayan, qapalı olan*" deməkdir. Təfsir üsulunda isə, "*Quranda olan, ancaq ərəblər arasında çox işlənməyən kəlmələrə qərib kəlimələr*" deyilir. Bu kəlmələri açıqlayan Quran elmi də "*Qəraibul-Quran"* adını almışdır.

Quranda əvvəlki dövrlərdə işlədilən, sonra isə unudulan və ya daha az istifadə olunan sözlər olduğu kimi Təbəri və Şafinin qarşı çıxmasına baxmayaraq bir çox alimin qəbul etdiyinə görə digər ərəb ləhcələrindən və başqa dillərdən alınıb ərəbcələşdirilən kəlmələr mövcuddur. Məsələn, "*ər-raqim*" rum dilində kitab, "*tur*" süryani dilində dağ, "*əl-mühl*" bərbər dilində qaynar yağ, "*əl- yəmmu*" isə qibti dilində dəniz mənalarına gəlir. Bu sözləri ərəblər ticarət və başqa məqsədlərlə təmasda olduqları xalqlardan almışlar. Quran, nüzul edilərkən ərəblərin başqa xalqlardan alıb ərəbcələşdirdikləri bu kəlmələri eynilə qoruyub saxlamışdır.

Hz. Peyğəmbərin Quranla bağlı izahları kəlmə izahlarından daha çox ayələrdəki hökmlərlə əlaqədar olurdu. Bəlkə buna görə sə-

133 Yunus, 10/15.

habilərin bir qismi bu kəlmələrin mənalarını bilmədiklərini etiraf etmişlər. Məsələn, "tərcümanul-Quran" adlanan və səhabilər arasında təfsir sahəsində ən məşhur olan İbn Abbas belə altı ayədə keçən "fatir" kəlməsinin mənasını əvvəllər bilmədiyini, bunları iki ərəb kəndli bir-biriylə mübahisə edərkən onlardan eşidərək öyrəndiyini söyləmişdir. Bundan başqa o, "qislin"[134], "hənanən"[135], "əvvah"[136] və "ər-raqim"[137] kəlmələrinin mənalarını daha sonralar öyrəndiyini etiraf etmişdir. Lakin unutmamaq lazımdır ki, Qurandakı istər Qüreyş və digər ərəb ləhcələrində verilən sözlərin, istərsə də başqa dillərdən ərəb dilinə keçən kəlmələrin izahında ən böyük pay İbn Abbasa düşür. O, bu kəlmələri izah edərkən ərəbcə şeirlərdən çox istifadə etmişdir. Buradan belə bir nəticəyə gələ bilərik ki, qəribul-Quranla əlaqədar ilk fəaliyyətlər səhabi dövründə başlamışdı.

Lakin bu dövrdə islami elmlər yazılı hala gəlmədiyi üçün bu sahədəki məlumatlar əsasən şifahi yolla nəql olunurdu. Hicri II əsrdə təfsir və digər elmlərlə yanaşı qəribul-Quran mövzusundakı məlumatlar da yazılı hala gətirilməyə başlandı.

İbn Abbasla başqa Əbu Übeyd əl-Qasım ibn Səllam (vəfatı 200/815), əl-Fərra (vəfatı-207/822), Əxfəş əl-Əvsad (vəfatı-221/835), əz-Zəccac (vəfatı-311/923), Mamər əl-Müsənna (vəfatı-210/825), İbn Qüteybə (vəfatı-276/889) və Rağıb əl-İsfəhani (vəfatı-502/1108) kimi alimlər qəribul-Qurana dair əsərlər yazmışlar.

### H. Quranın mübhəmləri

"Mübhəm" kəlməsi lüğətdə "*çətin anlaşılan, çətin başa düşülən şey*", "*nəyin qəsd edildiyi bilinməyən söz*" mənalarına gəlir. Termin

134 Haqqa, 69/36
135 Məryəm, 19/13
136 Tövbə, 9/114
137 Kəhf, 18/9

olaraq mübhəm *"insan, mələk və cin kimi varlıqlar və ya bir qəbilə, camaat üçün Quranda ismi-məvsulların, əvəzliklərin, bilinməyən zaman zərflərinin və bilinməyən məkan adlaının işlədilməsidir"*.

Mübhəmlərin Quranda işlədilməsinin bir çox səbəbləri vardır ki, onlardan bəziləri bunlardır:

**1. İfadə zənginliyini qorumaq.**

Məsələn:

*"Bizə doğru yolu göstər. Nemət verdiyin kəslərin yolunu, qəzəbə düçar olanların və azanların yolunu deyil"*[138] ayəsindəki *"əlləzi"* sözü ilə mübhəm qalan *"nemət verilənlər"* ifadəsi,

... فَأُوْلَـئِكَ مَعَ الَّذِينَ أَنْعَمَ اللّهُ عَلَيْهِم مِّنَ النَّبِيِّينَ وَالصِّدِّيقِينَ وَالشُّهَدَاء وَالصَّالِحِينَ ...

*"...Onlar Allahın nemət verdiyi peyğəmbərlər, siddiqlər, şəhidlər və salehlərlə bərabərdir"*[139] ayəsi ilə açıqlanmış və fərqli üslubda işlədilərək ifadə zənginləşdirilmişdir.

**2. Haqqında danışılan kəsin şəxsiyyətini ucaltmaq.**

Məsələn: Zümər surəsinin 33-cü ayəsi olan;

وَالَّذِي جَاء بِالصِّدْقِ وَصَدَّقَ بِهِ أُوْلَئِكَ هُمُ الْمُتَّقُونَ

*"Doğrunu gətirən və onu təsdiq edənlər- bunlar Allahdan qorxanlardır"* ayəsindəki *"əlləzi"* həm Hz. Məhəmmədi, həm də onun ümmətini ucaltmaqdadır. Çünki doğrunu gətirən Allahın Rəsulu, onu ilk təsdiq edən də onun ümmətidir.

**3. Xoşa gəlməz bir ifadə ilə qarşıdakını təhqir etmək.**

Məsələn:

138 Fatihə, 1/6-7
139 Nisa, 4/69

إِنَّ شَانِئَكَ هُوَ الْأَبْتَرُ

*"Həqiqətən, Səni gözü götürməyənin özü zürriyətsizdir."*[140] ayəsində Hz. Peyğəmbərə "*əbtər*" (soyu kesik) deyən As İbn Vaili təhqir etmək üçün "*huvə*" zamiri işlədilmişdir.

**4. Fail məşhur olduğu üçün açıqlamağa ehtiyacın olmaması.**

Məsələn:

يَا آدَمُ اسْكُنْ أَنتَ وَزَوْجُكَ الْجَنَّةَ

"*...Ey Adəm! Sən və zövcən cənnətə yerləşin...*"[141] ayəsindəki "*zövcə*" kəliməsindən qəsd olunan kəsin Həvva olduğu hər kəs tərəfindən bilinməkdədir.

**5. Mühəmin açıqlanmasının heç bir faydası olmaması.**

Məsələn:

أَوْ كَالَّذِي مَرَّ عَلَى قَرْيَةٍ وَهِيَ خَاوِيَةٌ عَلَى عُرُوشِهَا

"*Yaxud damları çökmüş bir kənddən keçən kəsi ( görmədinmi)*?..."[142] ayəsində qeyd olunan "*əlləzi*" və "*qaryə*" sözləri mübhəmdir. Hər nə qədər "*əlləzi*" ilə Üzeyirin (ə.s), "*qaryə*" kəliməsi ilə də Beytul-məqdisin qəsd olunduğu söylənsə də, nə bu izahların dəqiq olduğunu iddia edə bilmərik, nə də bunlardan nəyin qəsd olunduğunun bilinməsinin bizə heç bir faydası yoxdur.

Mübhəmatın açıqlanmasına ağla gələn ilk qaynaq Qurandır. Lakin həm səhabi, həm də tabeun müfəssirlərdən israiliyyata meyl edənlər mübhəmatın izahında Tövratdan da istifadə etmişlər. Bundan başqa bu cür ayələrin təfsirində müraciət olunan digər qaynaq tarixdir. Çünki mübhəmatla əlaqədar olan şeylərin bir çoxu tarixdə

140 Kövsər, 108/3
141 Bəqərə, 2/35
142 Bəqərə, 2/259

baş verən hadisələr, o hadisələrin meydana gəldiyi məkanlar və qəhrəmanlarıdır. Səhabi nəqlləri və tabeun alimlərinin şəxsi görüşləri də mübhəmatın izahında müraciət olunan qaynaqlardandırlar.

Lakin bu qaynaqların hamısı yuxarıda da qeyd etdiyimiz kimi ciddi araşdırılmalıdır. Çünki bunların əksəriyyəti başda Quran olmaqla, ağıla, məntiqə, ərəb dilinə və tarixə zidd olan məlumatlardır. Bu cür rəvayətlərə misal versək mövzunu daha yaxşı anlayarıq.

Məsələn, Hicr surəsinin 44-cü ayəsinə cəhənnəmin yeddi qapısından bəhs olunur. Suyuti, Aməş və İbn Abbasdan gələn iki ayrı rəvayətdə bu qapıların Hütamə, Haviyə, Ləza, Səqar, Cəhim, Səir və Cəhənnəm olduğu bildirilir. Halbuki bu kəlmələrin siyaq və sibaqına baxdıqda görürük ki, bunlar Cəhənnəmin qapıları deyil, əksinə Cəhənnəmin digər adlarıdır.

Başqa bir misal Yusif surəsinin 26-cı ayəsində bəhs olunan şahid haqqında söylənilənlərdir. Belə ki, həmin rəvayətdə, şahidin qadının bibisi oğlu olan kiçik bir uşaq olduğu bildirilir. Lakin bunu qəbul etmək mümkün deyildir. Çünki beşikdəki bir uşağın bu şəkildə şahidlik etməsi ağıla tərsdir. Həm də Həsən əl-Bəsri, İkrimə, Qəttadə, Dəhhak və Mücahid kimi alimlər, bu ayədki şahidin padişahın istişarə məsləhətləşdiyi hikmət sahibi bir vəzir olduğunu söyləmişlər.

Buna görə də mübhəmlərlə bağlı bizə gəlib çatan rəvayətlərin doğruluğuna çox diqqət etməliyik. Əks təqdirdə doğru olmayan rəvayətlər həm izah zənginliyinə mane olar, həm də Quranın beynəlmiləl hədəflərini zədələyər.

Bu mövzuda yazılmış əsərlər arasında ən məşhur olanı Süheylinin (vəfatı-581/1185) *"ət -Tərif vəl-ilam"* adlı əsəridir.

## I. Quranın müşkilləri

“Müşkil” kəlməsi lüğətdə “*qarışıq olmaq*” mənasına gələn “*əşkələ*” felinin ismi- failidir. Oxuyucuya ziddiyətli şəkildə görünən ayələrə müşkil ayələr deyilir. Əslində Quranda zidd mənada işlədilən ayələr yoxdur. Nisa surəsinin 82-ci ayəsində bu həqiqət belə dilə gətirilir:

*“Onlar Quran barəsində (onun Allah kəlamı olması haqqında) düşünməzlərmi? Əgər o, Allahdan qeyrisi tərəfindən olsaydı, əlbəttə, onda çoxlu ziddiyyət (ixtilaf, uyğunsuzluq) tapardılar.”*

Daha yaxşı incələdikdə görərik ki, bu ayələr eyni mövzudan bəhs etmirlər, eyni şərtlərə və eyni ehtiyaclara cavab vermirlər. Buna görə də fərqli zamanlarda ortaya çıxan, fərqli şəraitlərlə bağlı olan ifadələri tarixi və ictimai şərtlərə görə dəyərləndirmək lazımdır. Quranı cəmiyyətin və tarixin xaricindəki bir mətn kimi oxuyanlar onda zidd mənaların olduğu qənaətinə gəlirlər. Amma o iyirmi üç il ərzində müxtəlif ictimai hadisələri izləyərk meydana gələn bir mətndir. Quranın bu xüsusiyyətini diqqətdən qaçırmaq oxuyucunu belə yanlış bir qənaətə gəlməyə sövq edər.

Quranda var olduğu zənn edilən müşkillərin səbəbləri aşağıdakılardır:

### 1. Mövzu ixtilafı

Bəzən Quranda eyni mövzuyla bağlı ayələr arasında ixtilaf olduğu zənn edilir. Məsələn:

“*Elçi göndərilən kəsləri də, elçiləri də mütləq hesaba çəkəcəyik*”[143] ayəsi ilə “*Rəbbinə and olsun ki, mütləq onların hamısını hesaba çəkəcəyik*”[144] ayəsində insanların mütləq sorğu-suala tutulacağı bildirildiyi halda

143 Əraf, 7/6
144 Hicr, 15/92

başqa bir surədə *"O gün nə insanlar, nə də cinlər (etdiyi) günaha görə sorğuya çəkilməz"*[145] deyilərək hesaba çəkilmə mövzusunda Quranda bir-birinə zidd xəbərlərin olduğu fikrinə qapıla bilərik. Ancaq İbn Qüteybə və Suyuti ziddiyətli görünən bu ayələri belə yorumlayırlar: "Qiyamətdə fərqli səhnələr vardır. Bunların bəzisində insanlar hesaba çəkiləcək, bəzisində isə hesaba çəkilməyəcəklər. Yaxud da bu ayələr insanların etdikləri əməllərin bir hissəsindən sorğuya çəkilib bir hissəsindən də çəkilməyəcəklərini bildirir."[146]

**2. Həqiqi və məcazi mənada işlənməsi**

Quranda bəzi ayələr vardır ki, bunlar bəzən həqiqi, bəzən də məcazi mənalarda işlədilmişdir. Elə ayələr də vardır ki, onlar da eyni vaxtda həm həqiqi, həm də məcazi məna daşıyırlar. Məsələn,

وَتَرَى النَّاسَ سُكَارَى وَمَا هُم بِسُكَارَى

*"...İnsanlarını sərxoş olaraq görürsən, ancaq onlar sərxoş deyildirlər..."* [147] ayəsinə nəzər saldıqda ilk anda burada bir ziddiyətin var olduğu zənn edilə bilər. Ancaq ayədə qiyamətin dəhşətindən insanların məcazən sərxoş vəziyyətə düşəcəkləri ifadə edilmiş, ancaq sərxoşluğun səbəbi şərab olduğu üçün də həqiqətə nisbətlə də onların sərxoş olmadıqları bildirilmişdir.

**3. Felin isnadından qaynaqlanan ixtilaf**

*"Onları siz öldürmədiniz, ancaq Allah öldürdü onları"*[148] ayəsində öldürmə və atma hadisəsində "*kəsb*" qullara, "*xəlq və təqdir*" isə Allaha aiddir.

145 Rəhman, 55/39.
146 İbn Qüteybə, *Təvili müşkilil Quran*, s. 65; Suyuti, *əl-İtqan*, II, s. 76.
147 Həcc, 22/2.
148 Ənfal, 8/17.

Bildiyimiz kimi bu ayə Bədir döyüşündən bəhs edir. Qüreyş ordusu Bədir günü döyüş meydanına gəldikdə Hz. Peyğəmbər belə buyurur:" Budur Qüreyş, qürur və iftixar hissi ilə gəldi. Allahım bunlar sənin Rəsulunu inkar edirlər. Mənə verdiyin vədi Səndən istəyirəm ey Rəbbim!". Bu əsnada Cəbrail (ə.s.) gəldi və Rəsulullaha (s.ə.s.): "Bir ovuc torpaq götür və onlara at"-dedi. İki tərəf qarşı-qarşıya gəldikdə Hz. Peyğəmbər bir ovuc torpaq götürdü, düşmən əsgərlərinin üzünə atdı və "üzləri qurusun"-dedi. Bu sözlərdən sonra düşmən əsgərləri arasında gözlərini ovuşdurmayan heç bir müşrik qalmadı. Və düşmənlər qaçmağa başladı, möminlər də onları təqib edirdilər. Onlar düşmən əsgərlərini öldürür və ya əsir alırdılar. Döyüş başa çatdıqda müsəlmanlar " belə vurdum, elə əsir aldım" deyə danışmağa başladılar. Yuxarıdakı ayə məhz bu hadisəyə görə nazil olmuşdu. Bu rəvayət göstərir ki, hər nə qədər zahirdə bu işi görənlər möminlər zənn edilsə də, həqiqətdə isə Allahdır.

**4. Zidd mənadan qaynaqlanan ixtilaf**

قُلُوبُهُم بِذِكْرِ اللّهِ ِ الَّذِينَ آمَنُواْ وَتَطْمَئِنُّ

"*Bunlar, iman edənlər və könülləri Allahı zikr etməklə rahatlıq tapanlardır*..." [149] ayəsi ilə

قُلُوبُهُمْ إِنَّمَا الْمُؤْمِنُونَ الَّذِينَ إِذَا ذُكِرَ اللّهُ وَجِلَتْ

"*Möminlər o kəslərdir ki, Allah adı çəkiləndə qəlbləri titrəyər*..."[150] ayəsində keçən "*qəlblərin sükunəti*" ilə "*qəlblərin titrəməsi*" ifadələri arasında sanki bir ziddiyət olduğu zənn edilir. Ancaq burada Allah adının zikri ilə bir tərəfdən mömininin qəlbinin sükunətə qovuşması, digər tərəfdən də haqdan və həqiqətdən sapma qorxusu ilə onun qəlbinin titrəməsi nəzərdə tutulur.

149 Rəd, 13/28
150 Ənfal, 8/2

**5. Bir həqiqətin fərqli şəkillərdə gəlməsi**

Quran Hz. Adəmin yaradılışından bəhs edərkən fərqli-fərqli ifadələr işlədir. Belə ki bir ayədə insanın "*torpaqdan*"[151], başqa bir ayədə "*qurumuş palçıqdan*"[152], Saffat surəsinin 1-ci ayəsində isə "*yapışqan kimi palçıqdan*", Rəhman surəsinin 14-cü ayəsində "*qupquru palçıqdan*" yaratıldığı söylənir. Bu da ilk baxışda insanı çaşdırır. Quranın bu ayələri arasında təzad olduğu fikri oyanır. Ancaq burada Hz. Adəmin yaradılış səhnələri göstərilir. "*Hamə*", "*tin*" və "*salsal*" eyni şey deyildir, amma bunların hamısının mənşəyi torpaq olub bu ifadələr də torpağın fərqli şəkilləri üçün işlədilmişdir.

Ayələr arasında var olduğu zənn edilən müşkilatı ortadan qaldırmaq üçün bəzi elmi metodlardan istifadə etmək, ayələri daha doğru anlamğa çalışmaq lazımdır. Alimlər müşkilləri ortadan qaldırmaq üçün iki yoldan istifadə etmişlər:

1) Təvil və təlif yolu

Bu metoda dair məlumatlara müşkillərin səbəblərindən bəhs edərkən yer verdik.

2) Nəsx yolu

Nəsx mövzusundan bəhs edərkən müfəssirlərin və fəqihlərin ziddiyətli görünən bəzi ayələri uzlaşdıra bilmədikləri zaman nəsxə müraciət etdiklərini söyləmişdik. Nəsxi qəbul etməyənlər bu teoriyanın ortaya çıxmasında əsas səbəbin məhz müşkil ayələrlə bağlı olduğunu söyləyirlər.

İbn Qüteybənin (vəfatı-276/889) "*Təvilu Müşkili-Quran*" adlı əsəri bu sahədə yazılmış ən məşhur əsərdir. Bundan başqa Məkki b. Əbi Talib (vəfatı-437-1045) "*Müşkilatul-Quran*" və Məhəmməd

151 Ali İmran, 3/59
152 Hicr, 15/26

Abduh da "*Müşkilatul-Quranil-Kərim*" adlı əsərlərini bu mövzuya həsr etmişlər.

**J. Mücməl və mübəyyən**

"Mücməl" kəlməsi "*dağınıq halda olan şeyləri bir yerə toplamaq*", "*qısa şəkildə ifadə etmək*" mənasına gələn "*icmal*" məsdərindən törəyən ismi-məfuldur. Termin olaraq "*nə qəsd edildiyi başa düşülməyəcək dərəcədə qapalı olan, ancaq Allah tərəfindən izahı ilə anlaşılan söz və ya ayə*" deməkdir.

"Mübəyyən" kəlməsi isə "*açıqlamaq, izah etmək*" mənasına gələn "*bəyan*" kökündən törəmiş bir sözdür. "*Açıqlanmış və bəyan edilmiş*" demək olan mübəyyən, termin olaraq da "*Quran ayələrindəki mücməl və gizli olan mənaların açıqlanması*" deməkdir.

Mücməl bir ayəni açıqlayan söz və ya ifadə ya eyni ayədə, ya da başqa bir ayədə olur.

"*...Sübh çağı ağ sap qara sapdan seçilənə qədər yeyib-için...*" ayəsindəki "*minəl fəcr/sübh çağı*" ifadəsi deyilənə görə ilk endiyi vaxtlarda ayənin içərisində mövcud deyildi. Buna görə də bəzi *səhabələr* "*sübh çağı ağ sap qara sapdan seçilənə qədər*" ifadəsindəki "*sap*" sözünü həqiqi mənada anlayıb ağ sapla qara sapı yanaşdırır və onları bir-birindən ayırana qədər yeyib içirdilər. Bu yanlış anlamadan sonra "*minəl fəcr*" ifadəsi nazil oldu. Beləliklə də həmin səhabilər ayədəki sapın həqiqi mənada olmayıb gündüzün aydınlığı ilə gecənin qaranlığını məcazi olaraq anladan ifadə tərzi olduğunu bildilər.

"*And olsun göyə və gecə gələnə! (Gecə peyda olub gündüz qeyb olana!) (Ya Peyğəmbər!) Sən nə bilirsən (haradan bilirsən) ki, gecə gələn nədir?!*"[153] ayəsindəki "tariq" sözü də mücməldir. Ancaq eyni surənin üçüncü

153 Tariq, 86/1-2

ayəsi olan "(O, zülməti yaran) *parlaq ulduzdur*!" ayəsi bu mücməlliyi ortadan qaldırır.

Qurani-kərimdəki mücməllərin səbəblərini belə sıralamaq mümkündür:

**1. Bir sözün iki zidd məna ifadə etməsi**

"*Boşanan qadınlar üş təmizlənmə halını gözləyərlər...*"[154] ayəsindəki "*quru*" sözü müştərk mənada işlədilən bir söz olub həm aybaşı, həm də aybaşıdan təmizlənmə mənalarına gəlir.

**2. Əvəzliyin istinadından qaynaqlanan ixtilaf**

"*... Ona ancaq gözəl sözlər yüksəlir. Gözəl sözləri də gözəl əməllər yüksəldir...*"[155] ayəsindəki "*yərfəu*" felindəki əvəzliyin istinadında mücməllik vardır. Çünki bu əvəzliyin həm Allah kəliməsinə, həm də "*əl-kəlimut tayyib/ gözəl sözlər*" ifadəsinə istinad edilməsi mümkündür.

**3. Ətf və istinaf ehtimalının olması**

وَمَا يَعْلَمُ تَأْوِيلَهُ إِلاَّ اللّهُ وَالرَّاسِخُونَ فِي الْعِلْمِ يَقُولُونَ آمَنَّا بِهِ كُلٌّ مِّنْ عِندِ رَبِّنَا

"*...Allahdan başqa onun izahını heç kəs bilməz. Elmdə yüksək səviyyəyə çatanlar deyərlər: "Biz Ona inandıq, hamısı Rəbbimizdəndir" ...*"[156] ayəsindəki "*vər-rasixun*" kəlməsindəki "*vav*" hərfinin həm ətf, həm də istinaf olma ehtimalı vardır. Bu hərfi istinaf olaraq ələ alanlar ayəni belə tərcümə etmişlər:

"*...Mütəşabehlərin izahını yalnız Allah bilir. Elmdə yüksək səviyyəyə gələnlər isə deyərlər: "Biz Ona inandıq, hamısı Rəbbimizdəndir" ...*". Yəni onlara görə mütəşabehlərin mənasını yalnız Allah bilir, Onun xaricində heç kim bunları bilməz. "Vav" hərfini ətf hesab edənlər

154 Bəqərə, 2/228.
155 Fatir, 35/10.
156 Ali İmran, 3/7.

isə *"elmdə yüksək səviyyəyə gələnlərin"* də mütəşabihlərin mənasını biləcəyini söyləyirlər.

**4. Ləfzin qərib olması**

Buna misal olaraq *"Həqiqətən, insan (sərvətə) çox həris (tamahkar və kəmhövsələ) yaradılmışdır"*![157] ayəsindəki "həlu" sözünü göstərə bilərik. "Çox həris və səbirsiz" mənalarına gələn bu kəlmə sonrakı ayədə bu şəkildə açıqlanır: *"Ona bir pislik üz verdikdə fəryad qoparar. Ona bir xeyir nəsib olduqda isə xəsis olar"*[158]

Qurani-kərimdəki mücməllərin bir hissəsi Allah tərəfindən açıqlanmış, bir hissəsini sünnə açıqlamış, digər bir hissəsini də səhabilər ictihad yolu ilə izah etmişlər. Yuxarıdakı misallarda Allah tərəfindən açıqlanan mücməllərə yer verdik. Hz. Peyğəmbərin mücməlləri təfsirinə gəldikdə, "salat", "zəkat" və "həcc" kimi ifadələri buna misal vermək olar. Belə ki, ərəblər əvvəllər bu sözləri fərqli mənalarda işlədirdilər. Lakin İslam dini gəldikdən sonra bu kəlmələr xüsusi mənalarda işlənməyə başladı və bu kəlmələr həm qövli sünnə, həm də feli sünnə tərəfindən açıqlanaraq mücməllikləri ortadan qaldırıldı.

Yuxarıda mücməllərin bir hissəsinin də ictihadla izah edildiyini söylədik. Bu cür mücməllər Hz. Peyğəmbər tərəfindən açıqlanmayan mücməllərdir.

Nəticə olaraq deyə bilərik ki, əgər mücməl söz Allah tərəfindən açıqlanmışsa o alınmalıdır. Əgər bu kəlmə barədə verilən izah kifayət deyilsə və ya onun haqqında hər hansı bir izah yoxdursa, o zaman o sözdən nəyin qəsd olunduğu araşdırılmalıdır.

157 Məaric, 70/19.
158 Məaric, 70/20-21.

### K. Vücuh və nəzair

"Vücuh" sözü "*vəch*" kəlməsinin cəm formasıdır. "*Vəch*" lüğətdə "*bir şeyin ön tərəfi, üz, bir qövmün ağası, məqam, mövqe, cəhət, oxşar, qəlb, məzhəb, yol, şəkil, ruzi və bir məsələnin bilinən yönü*" kimi mənalara gəlir. Termin olaraq vücüh "*bir sözün Quranda fərqli mənalarda işlədilməsi*" deməkdir. Bu terminin dilimizdəki qarşılığı omonimdir. Buna misal olaraq "*əl-hüda*" sözünün Qurandakı fərqli mənalarda işlədilməsini verə bilərik. Zərkəşi, "Əl-Burhan fi ulumil-Quran" adlı əsərində bu kəlmənin Quranda 17 mənada işlədildiyini söyləyir. Belə ki, bu söz bəyan[159], din[160], iman[161], dəvətçi[162], peyğəmbər[163], yol tapmaq[164], Hz. Mühəmməd [165], Quran[166] və s. kimi mənalara da gəlir.

Görürük ki, bu kəlmələr arasında məna cəhətdən münasibət vardır. Buna görə də vücuha "əl-əlfəzul-müştərəkə/müştərək sözlər" də deyilir.

Vücuha misal olaraq "*ət-Tağut*" kəlməsini də verə bilərik. Çünki bu söz eyni zamanda şeytan,[167] büt,[168] hər bir pis şey deməkdir. Bundan başqa "*salat*", "*ruh*", "*zur*", "*ümmət*" və "*ayn*" kəlmələri də vücuh elmi çərçivəsində ələ alına bilər.

"Nəzair" sözü isə "*nəzirə*" kəlməsinin cəm forması olub "*şəkil, təbiət, davrnış və sözlərdəki oxşarlıq*" deməkdir. Temin olaraq da "*Qurandakı fərqli sözlərin eyni məna ifadə etməsinə*" deyilir. Məsələn

159 Bəqərə, 2/5.
160 Ali İmran, 3/73.
161 Məryəm, 19/76.
162 Rəd, 13/7.
163 Bəqərə, 2/38.
164 Nəhl, 16/16.
165 Bəqərə, 2/159.
166 Nəcm, 53/23.
167 Bəqərə, 2/256; Nisa, 4/76; Maidə, 5/60.
168 Nəhl, 16/36.

*“cəhənnəm”*, *“nar”*, *“səqar”*, *“hüdamə”* və *“cahim”* kəlmələri Quranda əzab mənasını bildirir.

Buraya qədər söylənənlərdən yola çıxıb deyə bilərik ki, vücuh da təaddüd/çox mənalılıq, nəzair də isə, təşabüh və ittifaq vardır. Başqa cür ifadə etsək, vücuh mənalarda, nəzair isə ləfzlərdə olur.

Bu sahədə Müqatil ibn Süleymanın (vəfatı-150/767) *“əl-Vücuh vən-nəzair”*, Yəhya ibn Səllamın (vəfatı-200/815) *“ət-Təsarif”*, Hakim ət-Tirmizinin (vəfatı-285/898) *“Təhsilu nəzairil-Quranil-Kərim”*, İbnul-Cövzinin (vəfatı-597/1200) *“Nüzhətul-ayunin-nəvazir fi ilmil-vücuh vən-nəzair”* adlı əsərləri vardır.

**L. Quran qissələri**

*“Qissə”* kəlməsi lüğətdə *“bir adamın izini addım addım təqib etmək”*, *“bir sözü bəyan etmək”*, *“anlatmaq, hekayə etmək”* kimi anlamlara gəlir.

Quranda keçmişdə yaşamış peyğəmbərlərdən və onların ümmətlərindən bəhs edən qissələr vardır. Bu qissələrin arxa planı və hikmətləri vardır. Tarixin dərinliklərində qeyb olmuş, unudulmuş və ya sadəcə bəzi izləri insanların hafizələrində qalmış, hər zaman üçün keçərli olan mütləq həqiqətləri, yüksək dini dəyərləri başqa qissələrdə olmayan bir üsulla anladan Quran qissələri, hadisələri sanki canlandırırmışcasına ortaya qoyur. Məhz Quranda bəhs olunan tarixi hadisələrə qissə deyilməsinin səbəbi də budur. Qissələr sadəcə rəvayət və nəql deyillər, onlar eyni zamanda ictimai dəyişikliklərə paralel olaraq ələ alınmalı və üzərində dərin şəkildə düşünülərək bəzi izahlar gətirilməlidir.

### 1. Qissələrin qayəsi

Qissələrin əsas məqsədi "*Quranın nüzul məqsədlərini həyata keçirməkdir*". Bundan başqa bu qissələrin başqa bir çox qayələri də vardır ki, bunları aşağıdakı kimi sıralaya bilərik:

**a. Hz. Mühəmmədin nübüvvətini isbat etmək.**

Bilirik ki, nə Hz. Peyğəmbər, nə də onun qövmü keçmiş peyğəmbərlər və millətlər haqqında çox şey bilmirdilər.

*"(Ya Rəsulum!) Bu, sənə vəhy etdiyimiz (vəhylə bildirdiyimiz) qeyb xəbərlərindəndir. Onlar (Yusifin qardaşları) hiylə quraraq əlbir iş gördükləri (Yusifi quyuya atdıqları) zaman sən ki onların yanında deyildin!"*[169]

*"(Ya Rəsulum!) Biz Musaya vəhy etdiyimiz (peyğəmbərlik bəxş edib Firon əhlinin yanına getməsini buyurduğumuz) zaman sən (Tur dağının) qərb tərəfində (Musanı gözləyənlər arasında) deyildin. Sən (buna) şahid olanlardan da deyildin! (Sənin yəhudilərə və ərəb müşriklərinə bu xəbərləri doğru söyləməyin yalnız Allahdan nazil olan vəhylərdir!)"*[170]

*"Lakin Biz (Musadan sonra) neçə-neçə nəsillər yaratdıq. Onlar uzun ömür sürdülər. (Vəhy kəsildi; bir çox xəbərlər unudulub getdi, şəriət təhrif olundu). Sən ayələrimizi onlara oxuyarkən Mədyən əhli arasında deyildin. (Sən Mədyəndə deyildin ki, onların əhvalını bilib Məkkə əhlinə xəbər verəsən. Buna görə də onlar sənin bu xəbərləri Mədyən camaatından öyrəndiyini deyə bilməzlər). Lakin Biz (bu əhvalatları onlara olduğu kimi xəbər vermək üçün səni) peyğəmbər göndərdik. [Və ya: Ancaq (bu xəbərləri sənə) göndərən Bizik]."*[171] ayələrində bu xüsusiyyət açıq şəkildə dilə gətirilmişdir. Hz. Mühəmmədin bu qisssələri bilmədiyi halda Quran vasitəsilə onları doğru şəkildə anlatması, onun Allahdan vəhy aldığının ən əsas dəlillərindəndir.

---

169 Yusuf, 12/102.
170 Qəsəs, 28/44.
171 Qəsəs, 28/45.

**b. Hz. Peyğəmbəri və mömінləri təsəlli etmək.**

Haqqa dəvət çətin bir işdir. Bütün peyğəmbərlər bu yolda müxtəlif problemlərlə qarşılaşmışlar. Hz. Mühəmməd də bəzən müxaliflərinin hücumlarına, işgəncələrinə və təxribatlarına məruz qalmışdır. Belə vəziyyətlərdə Allah-Təala əvvəlki peyğəmbərlərin qissələrini inzal edərək onların da bu cür problemlərlə qarşılaşdıqlarını bildirmiş, onlara təsəlli verərək iradəli olmağa çağırmışdır. Rəsulullaha (s.ə.s) təsəlli verən bu qissələr eyni zamanda yurdlarından qovulan möminlər üçün də təsəlli qaynağı olmuşdur.

**c. İnsanrı düşündürmək və onların ibrət almalarına vəsilə olmaq**

Qissələrin qayələrindən biri də insanların bu qissələr üzərində düşünüb ibrət almalarıdır.

Məsələn:

لَقَدْ كَانَ فِي قَصَصِهِمْ عِبْرَةٌ لِّأُوْلِي الأَلْبَ

*"And olsun, onların (keçmiş peyğəmbərlərin və ümmətlərinin) qissələrində ağıl sahibləri üçün bir çox ibrətlər vardır...."*[172] ayəsi də buna işarə edir. Hicr, 15/75, Həcc, 22/46 ayələrində də bu məsələyə təmas edilmişdir.

Quran qissələri əsasən yaxşı ilə pis arasındakı mübarizədən bəhs edir. Bu mübarizədə qissələr həm yaxşıların, həm də pislərin duyğu və düşüncələrini ortaya qoyaraq, yaxşının haqq, pisin isə batil olduğunu göstərir. Hər bir insan Quran qissələrindən özünə görə bir nümunə ala bilər.

172 Yusuf, 12/111.

**d. Bütün peyğəmbərlərin eyni şeyi təbliğ etdiklərini, İslamın beynəlmiləliyini göstərmək.**

Tarix boyu bütün peyğəmbərlər Allahın varlığını və birliyini təbliğ edib bəşəriyyəti şirkdən uzaqlaşdırmağa çalışmışlar. Ənbiya surəsinin 48-92-ci ayələri buna ən gözəl nümunədir. Bu ayələrdə Ona ortaq qoşulan tanrıların, başqa cür ifadə etsək, haqq və batilin mücadiləsinə yer verilmiş, son ayədə də bu bəhs olunan şeylərin qayəsinə toxunulmuşdur:

*"(Ey insanlar!) Həqiqətən, bu (tövhid dini olan islam) tək bir din olaraq sizin dininizdir. Mən də sizin Rəbbinizəm. Buna görə də yalnız Mənə ibadət edin!"*[173]

**e. Səmavi dinlərin əsasının bir olduğunu, hamısının bir Allahdan gəldiyini bəyan etmək.**

*Biz Nuhu öz tayfasına (peyğəmbər) göndərdik. O dedi: "Ey camaatım! Allaha ibadət edin. Sizin Ondan başqa heç bir tanrınız yoxdur. Mən (müsibəti) böyük günün (qiyamət gününün) sizə üz verəcək əzabından qorxuram!"*[174]

*Ad tayfasına da qardaşları Hudu (peyğəmbər göndərdik). O dedi: "Ey camaatım! Allaha ibadət edin. Sizin ondan başqa heç bir tanrınız yoxdur. Məgər (Allahın əzabından) qorxmursunuz?"*[175]

*"Səmud tayfasına da qardaşları Salehi (peyğəmbər göndərdik). O dedi: "Ey camaatım! Allaha ibadət edin. Sizin Ondan başqa heç bir tanrınız yoxdur. Rəbbinizdən sizə açıq-aydın bir dəlil gəldi. Allahın bu dişi (maya) dəvəsi sizin üçün (peyğəmbərliyimi təsdiq edən) bir möcüzədir. Buraxın*

173 Ənbiya, 21/92.
174 Əraf, 7/59.
175 Əraf, 7/65.

*Allahın torpağında otlasın, ona pislik etməyin, yoxsa çox şiddətli bir əzaba düçar olarsınız!"*[176]

**2. Qissələrin xüsusiyyətləri**

Qurani-kərim ilahi mesajı insanlara çatdırmaq üçün tarixi hadisələrdən vasitə kimi istifadə etmişdir. Buna görə də bu qissələr müəyyən xüsusiyyətləri özlərində cəmləşdirmişlər ki, onları belə sıralamaq olar:

a. Qurani-kərim hadisəlrin çox təfərrüatına girməmiş, şəxs, zaman və məkan adlarına çox yer verməmişdir.

b. "*Yusif*" qissəsi xaric digər heç bir qissə tam olaraq verilməmiş, digər bütün qissələr hissə-hissə qeyd olunmuşdur.

c. Quran qissədən hansı məqsədlə istifadə edirsə hadisənin sadəcə o məqsədlə bağlı olan hissəsini vermişdir.

ç. Quran ərəblər arasında bilinən qissələri zikr etmişdir. Çünki bilinən qissələr olmasaydı insanları qəsd olunan yola yönləndirmək çox çətin olardı.

d. Qissələr çox təkrar edilmişdir. Ancaq hər dəfə işləndiyi surələrin ümümi mətninə görə bəzi dəyişikliklər edilərək təkrarlanmışdır.

Qissələrin tarixdə baş verən həqiqi hadisələr olmadığını, bunlarin məsəllər olduğunu söyləyənlər olsa da Qurani-kərimin özü onların iddialarını rədd edərək belə buyurur:

وَقَالُوا أَسَاطِيرُ الْأَوَّلِينَ اكْتَتَبَهَا فَهِيَ تُمْلَى عَلَيْهِ بُكْرَةً وَأَصِيلًا. قُلْ أَنزَلَهُ الَّذِي يَعْلَمُ السِّرَّ فِي السَّمَاوَاتِ وَالْأَرْضِ إِنَّهُ كَانَ غَفُورًا رَّحِيمًا .

176 Əraf, 7/73.

*"Onlar dedilər:"Bu, əvvəlkilərin əfsanələridir. O isə onların üzünü köçürtmüş və onlar səhər-axşam onun üçün oxunur". De: "Onu göylərdə və yerdə olan sirləri bilən nazil etmişdir. O bağışlayandır, rəhmlidir."*[177] Bu ayələr sadəcə Quranın başqaları tərəfindən Hz. Peyğəmbərə yazdırıldığı iddiasını deyil, eyni zamanda onun "əvvəlkilərin əfsanələri" olması şəklindəki iddiaları da rədd edir.

## M. Qurandakı andlar (Əqsamul-Quran)

### 1. Andın mahiyyəti

"Qəsəm" kəlməsi, "*əqsamə*" felindən törəyən isim olub "*and, yəmin*" mənalarına gəlir. Dini bir termin olaraq and "*bir kəsin bir işi edib etməyəcəyi və ya bir hadisənin doğru olub olmaması haqqındakı sözünü Allahın adını ve ya sifətlərini zikr edərək qüvvətləndirməsidir.*"

Qurani-kərimdəki andların bir çoxu Allah-təalaya aid olmaqla yanaşı bəzi ayələrdə Hz. Peyğmbərə (s.ə.s.) də and içməsi əmr edilmişdir. Allah-təala bəzən öz adına, bəzən Qurana, mələklərə, qiyamət gününə, peyğəmbərlərə və kainatdakı günəş, ay, ulduz, gecə, gündüz və s. kimi şeylərə and içir.

Quranın bir çox surəsində andlar olmaqla bərabər onun on yeddi surəsi andla başlayır. Bu da xitab olunan insanların diqqətini cəlb etmək üçündür. Bu andları aşağıdakı kimi sistemləşdirmək olar:

**a. Tövhidə dair andlar:**

وَالصَّافَّاتِ صَفًّا. فَالزَّاجِرَاتِ زَجْرًا . فَالتَّالِيَاتِ ذِكْرًا . إِنَّ إِلَٰهَكُمْ لَوَاحِدٌ .

*"Cərgə-cərgə duranlara, qovduqca qovanlara və Quran oxuyanlara and olsun, həqiqətən sizn Rəbbiniz birdir."*[178]

**b. Quranın haqq bir kitab olduğuna dair andlar:**

177 Furqan, 25/5-6.
178 Saffat, 37/1-4.

وَالْكِتَابِ الْمُبِينِ . إِنَّا جَعَلْنَاهُ قُرْآنًا عَرَبِيًّا لَّعَلَّكُمْ تَعْقِلُونَ .

*"Açıq-aydın kitaba and olsun ki, Biz onu anlaya biləsiniz deyə ərəbcə Quran etdik."*[179]

**c. Peyğəmbərlərin haqq olduğuna dair andlar:**

يس. وَالْقُرْآنِ الْحَكِيمِ . إِنَّكَ لَمِنَ الْمُرْسَلِينَ .

*"Yasin. O hikmətli Qurana and içərəm ki, sən həqiqətən peyğəmbərlərdənsən."*[180]

**d. Axirətdə cəzanın varlığına dair andlar:**

وَالذَّارِيَاتِ ذَرْوًا . فَالْحَامِلَاتِ وِقْرًا . فَالْجَارِيَاتِ يُسْرًا . فَالْمُقَسِّمَاتِ أَمْرًا . إِنَّمَا تُوعَدُونَ لَصَادِقٌ .

*"And olsun (torpağı) sovurub-səpələyənlərə (küləklərə), yük daşıyanlara (buludlara), asanlıqla üzənlərə (gəmilərə), işləri bilənlərə (mələklərə)! Sizə vəd olunan həqiqətən doğrudur "*[181].

**2. Andın Quranda işlədilməsinin səbəbləri**

Allahın Quranda and içməsi insanları qane etmə vasitəsi demək deyildir. Bu andlara yer verilməsinin bəzi səbəbləri vardır ki, klassik mənbələr bizə bu mövzuda üç səbəbin olduğunu söyləyirlər.

a. İslam meydana çıxmadan əvvəl də ərəblərin içtimai həyatında andların böyük rolu var idi. Daha çox "*insan həyatı*", "*şərəf*", "*qüvvə*", "*qəbilə*", "*əcdad*" kimi müqəddəs dəyələrə və "*mizraq*" kimi güc-qüdrət əlaməti olan əşyalara and içilirdi. Qurani-kərimdə də andlara yer verilməklə ərəblərin bu üslub tərzi qorunub saxlanmışdır.

b. Bu andlar söylənilən şeyləri təkid etmək üçün işlənmişdir. Bir çox ayədə Allah təala nazil etdiyi nəsslərini, varlığının dəlillərini, bəşəriyyətin hidayətinə vəsilə olması üçün göndərmiş ol-

179 Zuxruf, 43/2-3.
180 Yasin, 36/ 1-3.
181 Zariyat, 51/1-5.

duğu peyğəmbərlərini, bu andlar vasitəsi ilə təyid etmişdir (dəstəkləmişdir).

c. Qurandakı andların hikmətlərindən biri də, and içilən şeyin qiymətini, dəyərini və əhəmiyyətini göstərməkdir.

**3. Qəsəm felinin əvvəlində nəfy ədatının işlənməsi**

Qurandakı andlarla əlaqədar üzərində durulması lazım olan əsas məsələlərdən biri də, qəsəm felinin əvvəlində nəfy ədatı "lə"nin gəlməsidir. Bu cür and içmənin İslamdan əvvəlki ərəblər arasında da mövcud olduğu söylənilir. Müfəssirlər "lə uqsimu" şəklində işlənən andın bu növü barədə müxtəlif fikirlər səsləndirmişlər ki, bunlar aşağıdakılardır:

a. Bu ifadədəki "lə" ədatı kəlamın ahəngini gözəlləşdirmək üçün işlənmişdir. Bu nəfy ədatı olmayıb ziyadə hərfdir. Lakin Razi bu görüşə qarşı çıxmışdır.

b. Qəsəm felinin əvvəlindəki bu ədat təkid üçün yazılmışdır. Yəni andı qüvvətləndirmək üçün buraya qoyulmuşdur.

c. Bu ədat nəfy ədatıdır. Lakin bu iki mənada işlənə bilər. Bu ədat ya, özündən əvvəlki kəlama inkar mənası verir. Məsələn, Qiyamə surəsinin ilk aysəindəki "lə" ədatı, müşriklərin öldükdən sonra dirilmə haqqındakı inkarlarını rədd edərək, "*Xeyr! Məsələ heç də sizin söylədiyiniz kimi deyil, qiyamət gününə və özünü qınayan nəfsə and içirəm ki, insan onun sümüklərini bir yerə toplayamayacağımızımı zənn edir*?" şəklində bir məna ortaya qoyur. Və yaxud da bu nəfy ədatı, önündə gəldiyi qəsəmə (and) inkar mənası verir. Bu görüş Əbu Müslim İsfəhaninin görüşüdür. Ona görə yuxarıdakı ayənin mənası belə olur: "*Qiyamət gününə və özünü qınayan nəfsə and içməyə belə ehtiyac olmadan deyirəm ki, əgər insan onun sümüklərini bir yerə*

*toplamayacağımızı zənn edirsə, bilsin ki, biz bunu etməyə qadirk."* Razi də bu fikri dəstəkləmişdir.

### N. Quranda məcazlar

Qurani-kərim ədəbi sənətlər baxımından çox zəngin bir kitabdır. Məcaz elminin bu ədəbi sənətlər içərisində özünə məxsus yeri vardır.

"Məcaz" kəlməsi, bir sözün öz mənasının xaricində bir məna ifadə etməsidir. Bildiyimiz kimi məcazi ifadələr hər dildə vardır. Bu ifadələr dilin həm ədəbi dəyərini, həm də təsir gücünü artırır. Qurani-kərimdə məcaz olub olmamasına dair İslam alimləri arasında yekdil bir fikir yoxdur. Alimlərin bir çoxu Quranda məcazın varlığını qəbul etsələr də, bəziləri bunu qəbul etməməkdədirlər. Quranda məcazın olmadığı qənaətində olanlara misal olaraq zahiri məzhəbinin qurucusu Davud əz-Zahirini (vəfatı-270/883), mötəzili müfəssir Əbu Müslim Məhəmməd ibn Bəhr əs-İsfəhani (vəfatı-322/934), şafei alimi Əhməd ibn Əhməd ət-Təbəri (vəfatı-355/946) və maliki İbn Huveyzmənzazı (vəfatı-400/1009) göstərə bilərik. Onlara görə məcaz yalanın qardaşıdır. İnsanlar danışdıqları zaman çətinliyə düşərlərsə o zaman məcaza əl atarlar. Allah üçün bunu düşünmək isə mümkün deyildir. Quranda məcazın olduğunu söyləmək Allahda nöqsan axtarmaq mənasına gəlir və Qurandakı hər ifadə həqiqi mənada işlədilmişdir. Ancaq məcazlar Qurana gözəllik qatır. Quranda məcazın olmadığını iddia etmək onun bu gözəlliyini ortadan qaldırmaqdan başqa bir şey deyildir.

Qurandakı məcazlar iki yerə ayrılır: əqli və lüğəvi məcazlar.

#### 1. Əqli məcaz (əl-Məcazul-əqli)

Hər hansı bir hərəkətin o hərəkəti edənə deyil, başqasına istinad edlməsinə əqli məcaz deyilir.

فَمَا رَبِحَت تِّجَارَتُهُمْ وَمَا كَانُواْ مُهْتَدِينَ

*"... Onların bu alış-verişi xeyir gətirmədi və onlar doğru yol tutan olmadılar"*[182] ayəsində məcazın bu növü vardır. Burada fail (iş görən) *"ticarətdir"*. Ancaq ticarətin xeyir gətirib-gətirməməsi ticarətlə məşğul olan insanla bağlıdır. *"Onların bu alış-verişi xeyir gətirmədi"* ifadəsindən məqsəd *"onlar, bu alış-verişlərindən xeyir götürmədilər "* deməkdir.

وَقَالَ فِرْعَوْنُ يَا هَامَانُ ابْنِ لِي صَرْحًا لَعَلِّي اَبْلُغُ الْاَسْبَابَ

اَسْبَابَ السَّمٰوَاتِ فَاَطَّلِعَ اِلٰى اِلٰهِ مُوسٰى وَاِنِّي لَاَظُنُّهُ كَاذِبًا

*"Firon (istehza ilə) dedi: "Ey Haman! Mənim üçün bir uca qəsr tik ki, bəlkə, yollara yetişim. Göylərin yollarına (yetişim) və Musanın Allahını görüm (Ona vaqif olum). Doğrusu, mən onu yalançı sayıram!....."*[183] ayəsində də məcazın bu növündən istifadə olunmuşdur. Çünki, *"Ey Haman! Mənim üçün bir uca qəsr tik"* sözü həqiqi mənada işlənsəydi o zaman Hamanın sanki bu qəsri öz əlləri ilə tikməsi başa düşülür. Halbuki bu belə deyildir. Buradakı ifadə məcazi məna da olub, qəsd olunan həqiqi məna belədir: *"Ey Haman! Mənim üçün bir uca qəsr tikdir."*

### 2. Lüğəvi məcaz

Bütün zikr olunaraq cüz, cüz zikr olunaraq da bütünün qəsd edilməsinə lüğəvi məcaz deyilir.

... يَجْعَلُونَ أَصْابِعَهُمْ فِي آذَانِهِم مِّنَ الصَّوَاعِقِ حَذَرَ الْمَوْتِ ...

*"... O münafiqlər ildırımlardan gələcək ölüm qorxusu ilə barmaqlarını qulaqlarına tıxarlar..."*[184] ayəsində bütün zikr edilmiş, ancaq cüz qəsd

182 Bəqərə, 2/16.
183 Mömin, 40/36-37.
184 Bəqərə, 2/19.

edilmişdir. Çünki ayədə *"barmaq ucları/ənamil"* kəlməsinin yerinə *"barmaq*/əsabi" kəlməsi işlədilmişdir.

Cüzün zikr edilib bütünün qəsd edilməsinə gəlincə buna da

... فَتَحْرِيرُ رَقَبَةٍ...

*"... Bir boyunu hürr etmək lazımdır..."*[185] ayəsini misal verə bilərik. Buradakı *"rəqabəh"* sözündən məqsəd kölənin şəxsidir və burada köləyə hürriyətinin verilməsi nəzərdə tutulmuşdur.

Bu sahədə Əbu Übeydə Mamər ibn əl-Müsənnanın (vəfatı 210/825) *"Məcazu -Quran"* və Əbdüləziz ibn Əbdissəlamın (vəfatı 660/1262) *"əl-İşarə iləl icaz fi bədi ənvail məcaz"* adlı əsərləri vardır.

**O. Quranda təkrarlar**

Quranda bəzən bir kəlmənin, bəzən də bir ayənin təkrar olunduğunu görürük. Ərəb dilinin ruhunu anlamayan və bu dili öz dilləri ilə müqayisə edən bəzi Avropalı şərqşünaslar Qurandakı bu təkrarların lüzumsuz və darıxdırıcı olduğunu söyləmişlər.

Məkkədə müşriklərin müsəlmanlara olan ədavətini hər kəs bilir. Onların bütpərəstlik və şirkdəki israrlarına cavab olaraq verilən tənbehlərin əhəmiyyətini və ifadə tərzinin qüvvəsini artırmaq üçün kəlmə və ayələrin təkrarlanmasından daha təbii heç bir şey olmazdı. O dövrdə ərəb dilində də belə təkrarlar mövcud idi. Quran da ərəblərin bu üslubunu daha cazibəli şəkildə davam etdirmişdir. Bu təkrarlara misal olaraq *"Mənim əzabım və tənbehlərim necədir (düşünün)?"* ayəsini verə bilərik. Bu ayə Qəmər surəsində dörd dəfə təkrar edilmişdir. Yenə *"Rəbbinizin hansı nemətlərini yalanlaya bilərsiniz?"* ayəsi Rəhman surəsində otuz bir dəfə təkrar olunmuşdur.

185 Mücadələ, 58/3.

Qissələrin təkrar edilməsi məsələsinə gəlincə burada əsas məqsəd insanların bu qissələrdən ibrət almasını təmin etməkdir. Bu qissələrdəki hadisələri insanlara müxtəlif vəsilələrlə göstərmək üçün onların təkrar edilməsinə ehtiyac vardır. Hz. Adəm qissəsi Bəqərə, Əraf, Hicr, İsra, Kəhf və Taha surələrində təkrar edilmişdir. Bu qissə Bəqərə surəsində Allahın nemətlərini, Əraf surəsində Allahın bu nemətlərinə qarşı insanların az şükür etməsini, Hicr surəsində Allahın insanı torpaqdan, cinləri isə atəşdən xəlq etdiyini və bu iki maddənin bir-birindən üstün olmadığını, İblisin özünü Adəmdən üstün görməsinin cəhalət və aldanma olduğunu, İsra surəsində insanların fitnələrini, Kəhf surəsində isə insanın düşməni olan İblis və onun cinsindən olanlarla dost olmanın necə yanlış olduğunu, Taha surəsində də insanın zəif nöqtələrini və bu zəifliyinə görə hər zaman Allahın yardımına möhtac olduğunu xatırladır.

**P. Quranda məsəllər (Əmsəlul-Quran)**

Quranda çox müraciət olunan anlatma metodlarından biri də məsəllərdir. Quran vermək istədiyi mesajı çox dəfə diqqət çəkici misallar və ya hadisələr mənasına gələn məsəllər vasitəsi ilə çatdırmışdır.

"Məsəl" kəlməsi, lüğətdə "*dəlil , hüccət , bir şeyin sifəti, xalq arasında yayılan və məşhur olan sözlər*" mənalarını daşıyır. Cəmi "*əmsal* " sözüdür.

Qurana nəzər saldıqda məsəllərin qayələri ortaya çıxır. Belə ki, Allah-təala Həşr surəsinin 21-ci ayəsində belə buyurur:

وَتِلْكَ الْأَمْثَالُ نَضْرِبُهَا لِلنَّاسِ لَعَلَّهُمْ يَتَفَكَّرُونَ .

" *Bu misalları insanlar onları düşünsünlər deyə veririk* "

Yenə Zümər surəsinin 27-ci ayəsində belə buyurulur:

وَلَقَدْ ضَرَبْنَا لِلنَّاسِ فِي هَذَا الْقُرْآنِ مِن كُلِّ مَثَلٍ لَّعَلَّهُمْ يَتَذَكَّرُونَ .

*"Biz bu Quranda insanlara hər cür misal gətirdik ki , bəlkə onlar bir düşünüb-daşınalar ".*

Qurandakı məsəlləri iki yerə ayırmaq olar :

**1. Sarih (açıq) və zahir məsəllər**

**2. Kamin (gizli), rəmzi məsəllər**

Sarih (açıq) məsəllərə misal olaraq Rəd surəsinin 17-ci ayəsini verə bilərik :

أَنزَلَ مِنَ السَّمَاء مَاء فَسَالَتْ أَوْدِيَةٌ بِقَدَرِهَا فَاحْتَمَلَ السَّيْلُ زَبَدًا رَّابِيًا وَمِمَّا يُوقِدُونَ عَلَيْهِ فِي النَّارِ ابْتِغَاء حِلْيَةٍ أَوْ مَتَاعٍ زَبَدٌ مِّثْلُهُ كَذَلِكَ يَضْرِبُ اللّهُ الْحَقَّ وَالْبَاطِلَ فَأَمَّا الزَّبَدُ فَيَذْهَبُ جُفَاء وَأَمَّا مَا يَنفَعُ النَّاسَ فَيَمْكُثُ فِي الأَرْضِ كَذَلِكَ يَضْرِبُ اللّهُ الأَمْثَالَ .

*"O, səmadan su endirdi. Su quru vadiləri qədərincə doldurub axdı, sel də qabarmış köpükləri alıb apardı. Bəzək-düzək və qab-qaşıq düzəltmək üçün od üstündə qaynadılan şeylərin (mis, gümüş və s.) də buna bənzər köpüyü olur. Allah haqqı və batili belə misal göstərir. Köpük dağılıb gedir, insanlara fayda verən şeylər isə yerdə qalır. Allah misalları belə çəkər."* Bu ayədə Haqq-təala haqqı və haqq sahiblərini səmadan yağan və yerə bir çox faydası toxunan sulara, batil və batil olanları da haqqın üstünə çıxan, ancaq çox qısa bir müddətdə də yox olan köpüklərə bənzətmişdir.

Kamin (gizli) məsəllərə misal olaraq isə bu ayəni verə bilərik :

وَالْبَلَدُ الطَّيِّبُ يَخْرُجُ نَبَاتُهُ بِإِذْنِ رَبِّهِ وَالَّذِي خَبُثَ لاَ يَخْرُجُ إِلاَّ نَكِدًا ...

*"Yaxşı torpağın məhsulu, Allahın izni ilə (yaxşı) çıxar. Pis (məhsulsuz) torpaqdan isə pis (qıt) məhsul çıxar."*[186] İbn Abbas bu ayədəki məsəlin mömin və kafir üçün çəkildiyini söyləmişdir. Yaxşı torpa-

186 Əraf, 7/58.

ğın məhsulu yaxşı olduğu kimi yaxşı mömünün də əməli yaxşıdır. Məhsulsuz torpağın məhsulu qıt və pis olduğu kimi kafirin də əməli pisdir.

Qurandakı məsəlləri ələ alan bir çox müstəqil əsər qələmə alınmışdır ki, bunlardan bir neçəsi aşağıdakılardır:

ət-Tirmizi (vəfatı-279/892), *əl-Əmsal minəl-Kitab və Sünnə*

İbnul-Qayyim əl-Cəvziyyə (vəfatı-751/1350), *əl-Əmsal Fir Quranil-Kərim*

Abdürrəhman Həsən əl-Meydani, *əl-Əmsalul-Quraniyyə*

**Q. Xəlqul-Quran məsələsi**

Əhli-sünnə alimləri Qurani-kərmin Allahın kəlamı olduğu üçün məxluq olmadığı görüşünü mənimsəmişlər. İslam dininin meydana çıxdığı ilk əsrdə Quranın məxluq olub-olmadığı məsələsi yox idi. Lakin hicri II əsrdə başlayan bu məsələ ilə bağlı mübahisələr, hicri III əsrdə daha da artdı. Mötəzili məzhəbinin təsiri altında qalan xəlifə Məmun (h.198-218) Quranın məxluq olduğunu rəsmi olaraq elan etdi. O bu görüşə qarşı çıxan alimlərə müxtəlif işgəncələr verdirmiş və bu işgəncələr nəticəsində də onların bir çoxu vəfat etmişdi. Bu alimlər arasında dövrün böyük alimi hesab olunan Əhməd İbn Hənbəl də vardı. "*Xəlqul-Quran*" məsələsi xəlifə Mötəsim (h.218-227) və əl-Vasiq (h.227-232) zamanında da davam etmiş, Mütəvəkkilin (232-247) hakimiyyətə gəlməsi ilə isə bu məsələ qadağan edilərək əhli-sünnə alimlərinin görüşü əsas alınmışdır.

Mənbələr "*xəlqul-Quran*" məsələsinin əslində daha əvvəlki dövrlərdə ortaya çıxdığını göstərir. Tədqiqatçı-alim Zəhəbi qeyd edir ki, Cad ibn Dirhəm adlı bir nəfərin "Allah İbrahimi dost seçmədi və Musa ilə danışmadı" fikrini irəli sürdüyü üçün qətl edilmişdir.

Mötəzili alimlər Quranın məxluq olduğunu söyləsə də, bu məsələnin bəzi yönləri ilə əlaqədar onlar arasında da ixtilaflar olmuşdu. Belə ki, onların bir hissəsi Quranın cism olduğunu söylərkən, digər bir hissəsi isə onun cism olmadığı qənaətində idilər. Həmçinin onların bəzisi Quranın baqi olduğu, bəzisi isə baqi olmadığı fikrini irəli sürmüşlərdi. Ancaq əvvəllər mötəzili olan Əşərinin Quranın qeyri-məxluq olduğu görüşünü müdafiə etməsi ilə mötəzili məzhəbinin görüşü tədricən ortadan qalxdı.

**R. Quranda xitablar**

Ümumiyyətlə Qurani-kərimdəki xitablar əsasən üç yerə ayrılır:

1. Hz. Peyğəmbərə olan xitablar.

2. Hz. Peyğəmbərin xaricindəkilərə olan xitablar.

3. Həm Hz. Peyğəmbərə, həm də onun xaricindəkilərə olan xitablar.

Bu xitabları otuz üç başlıq altında ələ almaq olar:

1) Xitab ümumidir və qəsd olunan da ümumidir.

*"Şübhəsiz Allah insanlara heç bir şeylə zülm etməz ..."*[187]

2) Xitab xüsusudir və bu xitabdan da xüsusilik qəsd olunur.

*"Ey Peyğəmbər! Rəbbindən sənə nazil olanı təbliğ et"*[188]

3) Xitab xüsusidir, ancaq ondan ümumilik qəsd olunur.

*"Ey Peyğəmbər! Qadınları boşadıqda...."*[189]

Burada xitab Hz. Peyğəmbərə olsa da, bu xitab eyni zamanda boşanan hər kəsə şamildir.

4) Xitab ümumidir, ancaq ondan xüsusilik qəsd olunur.

187 Yunus, 10/44.
188 Maidə, 5/67.
189 Talaq, 65/1.

*"Onlara, insanların inandığı kimi inanın deyildikdə..."*[190]

Burada *"insanlardan"* muradın Abdullah İbn Salam olduğuna dair rəvayətlər vardır.

5) Cinsə xitab

*"Ey insanlar!"* xitabı Quranda bir çox yerdə keçməkdədir və bu xitabla insan cinsi nəzərdə tutulur.

6) Növə xitab

*"Ey İsrail oğulları!"*[191] xitabı ilə Yaqub oğulları qəsd olunmuşdur.

7) Zata xitab

*"Ey İsa!"*, *" Ey Musa!"*, *"Ey İbrahim!"* və s. kimi xitablar buna misal verilə bilər.

8) Mədh xitabı

*"Ey iman edənlər!"* xitabı əksər hallarda məkkəlilərdən mədinəli mühacir və ənsarları ayırmaq üçün işlədilmişdir.

9) Zəmm xitabı

*"Ey kafirlər!"* xitabı kimi.

10) Üstünlük və kəramət bildirən xitab

*"Ey Adəm! Sən zövcənlə bərabər Cənnətə yerləş..."*[192] ayəsində olduğu kimi.

11) Alçaltma xitabı (Xiabul-ihanə)

*"Allah dedi: "Onda rədd ol buradan! Sən, daşqalaq olunasısan. Qiyamət gününə qədər sənə lənətlər olacaqdır."*[193] Bu ayədə Allah şeytanın pis xislətlərini bildirir.

12) Qarşıdakını ələ salma xitabı (Xitabut-təhəkküm)

190 Bəqərə, 2/13.
191 Bəqərə, 2/40.
192 Əraf, 7/19.
193 Hicr, 15/34-35.

*"Dad, axı sən (iddiana görə) qüdrətli, kəramətli idin*!"[194] Bu ayədəki xitab Əbu Cəhilədir. Çünki o, mövqe və zənginliyinə güvənərək özünün çox şərəfli və qüdrətl olduğunu söləyirdi. Allah-təala da onun bu sözlərinə istehza ilə o zaman əzabı dad deyir.

13) Təkdə işlənən kəlmə ilə cəmə olan xitab (Xitabul-cəm bilafzil-vahid)

*"Ey insan, səni öz səxavətli Rəbbinə qarşı tvlayıb aldadan nədir?"*[195] Burada insan kəlməsi təkdə işlədilsədə bütün insanlara şamildir.

14) Cəmdə işlənən kəlmə ilə təkə olan xitab (Xitabul-vahid bilafzil-cəm)

*"Ey peyğəmbərlər! Yaxşı nemətlərdən yeyin və əməlisaleh olun*..."[196] Buradakı xitab Hz. Peyğəmbərədir. Çünki onun zamanında onunla bərabər başqa bir peyğəmbər olmamışdır.

15) Təsniyə ilə təkə olan xitab (Xitabul-vahid bilafzil-isnəyni)

(Əmr olunacaq): "*Atın cəhənnəmə hər cür tərs kafiri*"[197]

16) Təkdə işlənən kəlmə ilə təsniyəyə olan xitab (Xitabul-isnəyni bilafzil-vahid)

*"Firon dedi: "SizinRəbbiniz kimdir, ey Musa?"*[198] Burada Hz.Musa ilə yanaşı Harun da qəsd olunmuşdur.

17) Təkdən sonra cəmə olan xitab (Xitabul-cəm bədəl-vahid)

*"Sən hansı bir vəziyyətdə olsan, Qurandan nəyi oxusan, siz hansı işi görsəniz, başınız bunlara qarışan zaman (bilin ki) Biz sizə şahidik*" (Yunus 10/61). Ayədəki ilk fellər təkdə işlədilmişkən, üçüncü fel cəm

194 Duxan, 44/49.
195 İnfitar, 82/6.
196 Müminun, 23/51.
197 Qaf, 50/24.
198 Taha, 20/49.

formasında işlədilmişdir. Burada xitab Hz. Peğəmbərədir. Üçüncü felin cəm formasında işlədilməsinə gəldikdə İbnül-Ənbari bunun Hz. Peyğəmbəri ucaltmaq üçün belə işlədildiyini söyləyir.

18) Xitab zatadır, ancaq qəsd olunan başqasıdır (Xitabul-ayn vəl-muradu ğayruhu)

*"Ey Peyğəmbər, Allahdan qorx, kafirlərə və münafiqlərə itaət etmə!..."*[199] Burada da xitab Hz. Peyğəmbərədir. Ancaq qəsd olunan möminlərdir. Çünki Hz. Peyğəmbər onsuz da bu kimi şeylərdən uzaq dururdu.

19) Öyüd-nəsihət və ibrət xitabı (Xitabul-etibar)

*"(Saleh) onlardan üz döndərdi və dedi: "Ey mənim camaatım, artıq mən öz Rəbbimin risalələrini sizə çatdırdım və sizə öyüd-nəsihət etdim. Lakin siz nəsihət verənləri sevmirsiniz"*[200]

20) Şəxsə xitabdan sonra başqasına yönəlmək (Xitabuş-şəxs summəl-udulu ilə ğayrihi)

*"Əgər onlar (köməyə çağırdığınızda) sizə hay verməsələr.."*[201] ayəsində xitab Hz. Peyəmbərədir. Ayənin davamındakı "*...onda bilin ki, o (Quran), Allahın bilgisi ilə nazil olbdu və Ondan başqa heç bir Tanr yoxdur! Artıq siz təslim (müsəman) olarsınızmı?*" ifadələri kafirlərə olan xitabdır.

21) İltifat xitabı (Xitabut-təlvin)

*"Artırmaq məqsədilə insanlara sələmlə verdiyiniz malın faizi..."*[202] ifadəsindəki xitab ikinci şəxsə olduğu halda, ayənin sonundakı "*belələri (öz mükafatlarını qat-qat artırmış olurlar*" ifadəsi ilə üçüncü şəxsə xitab olunmuşdur.

199 Əhzab, 33/1.
200 Əraf, 7/79.
201 Hud, 11/14.
202 Rum, 30/39.

22) Ağıl sahiblərinə xitab edərcəsinə cansızlara olan xitab (Xitabul-cəmadət xitabu mən yəqilu)

*"...Ey dağlar və quşlar! onunla birlikdə (Allaha) təriflər deyin!..."*[203]

23) Təhrik xitabı (Xitabut-təhyic)

*"Ey iman gətirənlər! Allahdan qorxun və iman gətirənsinizsə sələm alacaqlarınızın qalanından əl çəkin"*[204] Bu ayədə Allah-təala onları əvvəlcə imanla vəsfləndirir, daha sonra isə "iman gətirənsinizsə" ifadəsi ilə onları faizi tərk etməyə çağırır.

24) Qəzəb və təhdid xitabı (Xitabul-ğadab )

*"... Doğrudanmı siz onlar sizə düşmən olduğu halda Məni qoyub onu və ondan törəyənləri özünüzə himayəçilər götürürsünüz? Bu haqsızlar üçün nə pis bir dəyişdüyüşdür!"*[205]

25) Qəhrəmanlığa çağıran xitab (Xitabut-təşci vət-təhriz)

*"Allah sıx hörülmüş divar kimi səf bağlayaraq, Onun yolunda vuruşanları sevir"*[206] Burada birlikdə hərəkət etməyə və qəhrəmanlığa çağırış vardr.

26) Nifrət xitabı (Xitabut-tənfir)

*"... Bir-birinizi güdməyin və biriniz o birinizin qeybətini etməsin. Məgər sizlərdən biri qardaşı ölərsə, onun ətini yemək istəyərmi? Siz ki buna ikrah etdiniz. Allahdan qorxun, axı Allah tövbələri qəbul edəndir, rəhmlidir"*[207]

27) Meyl və istək xitabı (Xitabut-təhənnün vəl-istidaf)

---

203 Səba, 34/10.
204 Bəqərə, 2/278.
205 Kəhf, 18/50.
206 Saff, 61/4.
207 Hucurat, 49/12.

*"De:"Ey özlərinə qarşı həddini aşmış bəndələrim, Allahın mərhəmətindən əlinizi üzməyin..."*[208]

28) Məhəbbət, sevgi xitabı (Xitabut-təhbib)

*"O zaman İbrahim öz atasına dedi: "Ata, sən nə üçün qulağı eşitməyən, gözü görməyən və səni heç bir şeydən qurtara bilməyənə ibadət edirsən?"*[209]

29) Aciz qoyma xitabı (Xitabut-taciz)

*"Əgər bəndəmizə nazi etdiyimizə sizin bir şübhəniz varsa, onda ona bənzər bir surə gətirin..."*[210]

30) Yalanlama xitabı (Xitabut-təkzib)

*"...De: "Əgər siz düz danışırsınızsa Tövratı gətirib oxuyun!"*[211]

31) Heyfslənmə bildirən xitab (Xitabut-təhsir vət-tələhhüf)

*"De: "Hikkənizdən gəbərin! "*[212]

32) Şərəfləndirmə xitabı (Xitabut-təşrif)

Bu xitab növü Quranda "*qul*" sözü ilə işlədilmişdir.

33) Mövcud olmayana xitab (Xitabul-mədum)

"*Ey Adəm övladı*"[213] xitabı indiki və gələcək nəsillərə şamildir.

**S. Quranda sual və cavablar**

Qurani-kərimdə müxtəlif suallar və bunlara verilən müxtəlif cavablar vardır ki, bunları on üç başlıq altında toplamaq olar:

1) Sualın arxasınca dərhal verilən cavab

208 Zumər, 39/53.
209 Məryəm, 19/42.
210 Bəqərə, 2/23.
211 Ali-İmran, 3/93.
212 Ali-İmran, 3/119.
213 Əraf, 7/26.

*"Səndən nəyi infaq edəcəklərini soruşsalar, de: "Artıq qalanı" ..."*[214]

2) Munfasıl cavab. Bu da iki cür olur.

a) Sualla cavab eyni surədə olur. Məsələn , *"Onlar dedilər: "Bu necə peyğəmbərdir ki, yemək yeyir, bazarları gəzib dolaşır..."*[215] sualına yenə həmin surənin iyirminci ayəsində belə cavab verilir : *"Səndən əvvəl də ancaq yemək yeyən və bazarlarda gəzib dolaşan peyğəmbərlər göndərmişdik..."*

b) Sualla cavab ayrı-ayrı surələrdə olur. Məsələn "... *"Mərhəmətli nə olan şeydir..."*[216] sualının cavabı Rəhman surəsinin 1-3 ayələrində verilmişdir: *"Mərhəmətli (Allah) Quranı öyrətdi, insanı xəlq etdi"*.

3) Sualın cavabı gizli olur

*"Əgər Quranla dağlarhərəkətə gətirilsəydi, yaxud yer parça-parça kəsilsəydi və onunla ölülər dilə gətirilsəydilər belə..."*[217] ayəsinin cavabı gizlidir. Bu gizli cavab da belədir: *"o ancaq Quran idi"*.

4) Sual zikr olunmadan verilən mücərrəd cavab

*"... Axı Allah sizin imanınızı itirməz..."*[218] Bu, qiblə dəyişdirilmədən əvvəl Betytül-məqdisə yönəlib namaz qılanların namazılarının qəbul olunub-olunmaması barədə verilən sualın cavabıdır.

5) Bir suala iki cavab

*"Onlar dedilər: "Barı bu Quran iki şəhərdən birində olan böyük bir adama nazil ediləydi!"*[219] Bu sulaın iki cavabı vardır:

a. *"Onlar sənin Rəbbinin mərhəmətini bölürlər?"*[220]

214 Bəqərə, 2/219.
215 Furqan, 25/7.
216 Furqan, 25/60.
217 Rəd, 13/31.
218 Bəqərə, 2/143.
219 Zuxruf, 43/31.
220 Zuxruf, 43/32.

b. "*Sənin Rəbbin istədiyini xəlq edir və seçir...*"[221]

6) İki suala bir cavab

"*Əgər sizə Allahın lütfü və mərhəməti olmasaydı, Allah şəfqətli və rəhimli olmasaydı, (onda işiniz necə olardı?*)"[222] Bu sualların cavabı "*ifq hadisəsi*" ayəsidir.

7) Məhzuf cavab

"*Məgər öz Rəbbindən aydın dəlilə malik olanın .... halı bəd əməlləri özü üçün bəzədilmiş, öz həva-həvəslərinə uymuş kəslərin halı kimidir?*"[223] Bu ayənin cavabı məhfuzdur, yəni cavab yazılmasada qəsd olunmuşdur.

8) Cavab sualla əlaqəsi olmayan başqa bir fəsildə olur

"*İbrahimi də (peyğəmbər göndərdik). O zaman o, öz camaatına dedi: "Allaha ibadət edin və Ondan qorxun! Əgər bilsəniz, bu, sizin üü daha xeyirlidir.*"[224] Bu ayənin cavabı yenə eyni surənin iyirmi dördüncü ayəsində verilmişdir:

"*Onun (İbrahimin) camaatının cavabı ancaq:"Onu öldürün və ya yandırın"-demələri oldu ...*"

9) Kəlamın içərisində olan cavab

"*Sad.Öyüd-nəsihətli Qurana and olsun!...*"[225]

Kafirlər Hz. Mühəmmədin haqq bir peyğəmbər olmadığını zənn edirdilər. Bu ayələr isə Hz. Mühmmədin risalətinin doğru olduğunu bildir.

10) Kəlamın sonunda olan cavab

221 Qəsəs, 28/68.
222 Nur, 24/20.
223 Mühəmməd, 47/14.
224 Ənkəbut, 29/16.
225 Sad, 38/1-4.

*"Onlar qeyb barəsində ehtimallar quraraq deyəcəklər: "Üçdürlər, dördüncüsü onların itidir"..."*[226] Bunun cavabı isə yenə eyni ayədə verilmişdir: *"De: Mənim Rəbbim onların sayını daha yaxşı bilir..."*

11) Sualın içərisində olan cavab

*"Onlar isə bunlara üz tutaraq soruşdular: "Nə itirmisiniz?" Dedilər: Biz hakimin piyaləsini itirmişik..."*[227]

12) Vaxta mövquf cavab

*"Rəbbiniz dedi: "Məni çağırın. Mən də avab verim..."*[228]

Səhabilər duaya icabətin vaxtını Hz. Peyğəmbərdən soruşurlar. Onların bu sualına cavab olaraq Allah-təala bu ayəni nazil etdi:

*"Bəndələrim səndən Mənim haqqımda soruşsalar, Mən yaxındayam, məni çağıranın səsinə cavab verərəm. Qoy onlar da Mənə cavab versinlər və Mənə iman gətirsinlər ki, bəlkə düz yola qovuşalar"*[229]

13) Nəhy cavabı

*"... Siz əgər müttəqisinizsə, sözdə yumuşaqləq (işvə-naz) göstərməyin ki, ürəyində mərəz olan tamah salmasın..."*[230]

**T. Ayələr və surələr arasındakı münasibət** (Münasəbətul-Quran)

"Münasibət" kəlməsi lüğətdə "*yaxınlıq və oxşarlıq*" mənalarına gəlir. Termin olaraq "*bir- birinin ardınca gələn söz və cümlələr və ya ard-arda anladılan hadisələr arasındakı əlaqə*" deməkdir. "*Münasəbətul-Quran*" da ayə və surələr arasındakı məna baxımdan əlaqəni ortaya çıxardan bir Quran elmidir.

226 Kəhf, 18/22.
227 Yusuf, 12/71-72.
228 Mömin, 40/60.
229 Bəqərə, 2/186.
230 Əhzab, 33/32.

Bilindiyi kimi Quran ayələri fasilələrlə müxtəlif səbəblərə görə nazil olmuşdur. Ancaq ayələrin fərqli-fərqli zamanlarda nazil olması onlar arasında hər hansı bir əlaqənin olmaması demək deyildir. Həm ayələr və surələr, həm də ayələrin və surələrin əvvəli ilə axırları arsında elə bir əlaqə vardır ki, onlardan hər hansı birinin yerini dəyişdirmək mümkün deyildir. Çünki bu Quranın tərtibi ilə bağlıdır. Tərtib isə Quranın möcüzəvi yönlərindən biridir.

Fəxrəddin ər-Razi (vəfatı-606/1209) Bəqərə surəsinin əvvəli ilə axırı arasında əlaqə olduğunu söyləmişdir. Ona görə Allah-təala Bəqərə surəsinə qeybə iman edən, namaz qılan və Allahın verdiyi ruzini başqalarına da infaq edən möminləri öyərək başlamış, surənin sonunda da həmin möminlərin Hz. Mühəmmədin (s.ə.s) ümməti olduğunu bildirmişdir.

Bundan başqa Vaqiə surəsinin sonu ilə Hədid surəsinin əvvəli arasında da əlaqə olduğu söylənmişdir. Vaqiə surəsinin son ayəsi

فَسَبِّحْ بِاسْمِ رَبِّكَ الْعَظِيمِ .

"*Elə isə Uca Rəbbinin şəninə təriflər de*!" ayəsidir. Bu ayənin ardından gələn Hədid surəsinin birinci ayəsində də sanki Allahın şəninə təriflər deməsinə dəlil olsun deyə belə buyurulur:

سَبَّحَ لِلَّهِ مَا فِي السَّمَاوَاتِ وَالْأَرْضِ وَهُوَ الْعَزِيزُ الْحَكِيمُ .

"*Göylərdə və yerdə olanların hamısı Allaha təriflər deyir. O, qüdrət, hökm və hikmət sahibidir*".

Quranın ilk surəsi ilə son surəsi arasında da digər surələrdə olduğu kimi əlaqə vardır. Belə ki, Fatihədə Allahın sifətləri sayıldıqdan sonra hidayətdən bəhs olunmuş, Nəs surəsində də hidayətə çatmanın ancaq şeytanın şərrindən Allaha sığınmaqla mümkün olacağı bildirilmişdir.

Ayələr və surələr arasındakı əlaqə barədə müstəqil əsərlərin sayı olduqca azdır. əz-Zərkəşi bunun səbəbini bəlağət elmi sayılan münasəbətul-Quran elminin çətinliyinə bağlayır.

Mənbələr Quran ayələri və surələri arasındakı münasibətdən bəhs edən ilk İslam aliminin Əbu Bəkir ən-Nisaburi (vəfatı-324/936) olduğunu bildirir. Lakin onun bu sahəyə aid yazılı bir əsəri yoxdur. Fikirləri şifahi halda nəql olunmuşdur.

Bu sahənin bir Quran elmi kimi formalaşmasında Fəxrəddin ər-Razinin rolu çox böyükdür. "Quranın hamısı tək bir surə, hətta tək bir ayədir" prinsipindən hərəkət edən ər-Razi, ayə və surələr arasındakı münasibətə toxunaraq Qurandakı məna bütünlüyünü ortaya çıxarmağa çalışmışdır. O, Bəqərə surəsini təfsir edərkən belə deyir: " Kim bu surənin nəzm və tərtibindəki gözəllikləri düşünərsə, Quran kəlmələrinin fəsahət və məna üstünlüyü baxımından möcüzəvi olduğunu qısa bir zamanda idrak edər. Çünki o, tərtibi və ayələrinin nəzmi cəhətdən möcüzəvi bir kitabdır. Üslub baxımından Quranın möcüzə olduğunu söyləyənlərin məqsədi də elə bu olmalıdır."

Razidən başqa Haralli, Mursi, Əbu Həyyan, Məqdisi və digər müfəssirlər də öz təfsirlərində bu mövzuya geniş yer vermişlər.

Hicri VIII əsrdə məşhur müfəssir Əbu Həyyanın müəllimi olan Əbu Cəfər Əhməd b. İbrahim əl-Qirnati (vəfatı-708/1344) "*əl-Burhan fi tərtibil-Quran*" adlı bu mövzuda ilk müstəqil əsər qələmə almışdır. Daha sonrakı əsrlərdə Bürhanəddin İbrahim b. Ömər əl-Bikai (vəfatı-885-1480) "*Nəzmud-dürər fi tənasübül ay vəs-suvər*" adlı təfsir əsərini yazmış və bu əsərdə münəsəbətul-Quran mövzusuna geniş yer ayırmışdır. Bu əsər bu sahədə yazılmış ən önəmli əsər qəbul olunur.

## U. Quranın fəzilətləri

Fəzilət "*üstünlük*" və " *şərəf*" mənalarına gəlir. Quranın fəzilətləri deyildikdə onun üstünlüyü və ucalığı nəzərdə tutulur. Quranın fəzilətləri haqqındakı məlumatları təfsir kitablarından, hədis məcmualarından və digər müstəqil əsərlərdən almaq mümkündür.

### 1. Quranın fəzilətinə dair hədislər

Hz. Peyğəmbər (s.ə.s.) bir çox hədisində Quranın həm üstünlüyünə, həm də onu öyrənməyin, öyrətməyin və oxumanın fəzilətlərinə işarə etmişdir:

a. "*Sözlərin ən xeyirlisi Allahın Kitabıdır.*"[231]

b. "*Sizin ən xeyirliniz Quranı öyrənən və öyrədəndir.*"[232]

c. " *Quranı öyrənin. O, qiyamət günü əhlinə necə də gözəl şəfaətçidir.*"[233]

d. "*Hafizəsində Qurandan heç bir şey olmayan insan xaraba qalmış bir ev kimidir.*"[234]

Yuxarıda keçən bu hədislər səhih hədis qaynaqlarında mövcuddur və onların səhihliyinə heç bir şübhə yoxdur.

### 2. Surələrin fəzilətinə dair hədislər və onların incələnməsi

Surələrin fəzilətinə dair bir çox hədis vardır. Bunların böyük bir hissəsi təfsir kitablarında keçir. Bunlardan bəziləri bunlardır:

1."*Kim cümə günü Ali-İmran surəsini oxuyarsa, Allah və mələklər günəş batana qədər ona salat (rəhmət və istiğfar) edərlər.*"[235]

---

231 Buxari, Ədəb, 70.
232 Buxari, Fazlül Bəqərə, 21.
233 Darimi, Fəzailil-Quran, 1.
234 Tirmizi, Səvabul Quran, 18.
235 Zəməzşəri, *əl-Kəşşaf*, I, 460.

2. “*Kim Ənam surəsini oxusa, hər ayəsinə qarşılıq yetmiş min mələk gecə və gündüz o insanın bağışlanması üçün dua edər.*”[236]

3. “*Kim Yunus surəsini oxusa, Yunusa (ə.s.) inanan və onu yalanlayanların, eyni zamanda Fironla birlikdə suda boğulanların hər birinin əvəzinə o şəxsə on savab yazılar.*”[237]

4. “*Kim Hud surəsini oxusa, o insana, Nuh, Hud, Saleh, Şüeyib, Lüt, İbrahim və Musanı təsdiq və təkzib edənlərin, qiyamətə qədər gələcək müttəqilərin hər birinə qarşılıq on savab vardır.*”[238]

Surələrin fəziləti haqqındakı rəvayətlərə gəlincə bu rəvayətlərin bir çoxu Zəməxşəri, Beyzavi və Əbus Süud Əfəndinin təfsirlərində keçir. Burada diqqəti çəkən məqam bu üç müfəssirin də eyni hədisləri nəql etmələridir. Mənbələrin bildirdiyinə görə hər üç müfəssir bu hədisləri, Quranın fəzilətinə dair uydurma hədis nəql etmədə məşhur olan əs-Sələbi (vəfatı-427/1035) və Vahidi (vəfatı-468/1075) kanalı ilə rəvayət etmələridir. Müfəssir əş-Şirbini də (vəfatı-977/1569) “*əs-Siracul-munir*” adlə təfsirində Zəməxşəri və ona tabe olaraq eyni hədisləri nəql edən Beyzavinin bir çox uydurma hədisləri kitablarına aldıqlarını qeyd etmişdir. Şirbiniyə görə bu iki müfəssir Bəqərə, Nəhl, Kəhf, Səcdə, Yasin, Duxan, Vaqiə, Zilzal, Təkasur və Nəs surələri xaric, digər 104 surənin fəziləti haqqında uydurma hədislər nəql etmişlər.

Quran surələrinin fəziləti haqqında bir çox hədisin uydurulduğuna dair açıq etiraflar da vardır. Məsələn, Nuh b. Əbi Məryəmdən (vəfatı- 173/789) Quranın bir çox surəsinin fəziləti haqqında İbn Abbas təriqi ilə gələn bu xəbərlər sənə hardan çatıb deyə soruşulduqda belə cavab vermişdir: “Mən insanları Qurandan üz çevirib

236 Zəməxşəri, *Kəşşaf*, II/85.
237 Zəməxşəri, *Kəşşaf*, II/376, Beydavi, *Ənvarut-Tənzil*, I/552.
238 Zəməxşəri, *Kəşşaf*, II/429, Beydavi, *Ənvarut-Tənzil*, I/523.

Əbu Hənifənin fiqhi və İbn İshaqın məğazisi ilə məşğul olduqlarını gördüm və səvabını ümid edərək bu hədisləri uydurdum."[239]

İbn Hibbanın bildirdiyinə görə eyni sual Meysərə b. Abdi Rabbihə verilmiş, o da insanları Quran oxumağa həvəsləndirmək üçün bir çox fəzilət hədisi uydurduğunu bildirmişdir.

Buraya qədər yazılanlardan belə nəticəyə gəlmək olar ki, bu rəvayətlərin bir çoxu uydurma hədislərdir. Hər nə qədər bu rəvayətlərin Quran oxumağa həvəsləndirmə mahiyyətində uydurulduğu söylənilsə də İslam alimlərinin əksəriyyəti bu fikrə qarşı çıxmışlar. Həm də surələrin fəzilətiə dair uydurulan hədislər müsəlmanları daha çox Quranın ləfzinə yönəldərək onları əsl məqsəddən uzaqlaşdırmışdır.

239 Zərkəşi, *Burhan*, I/432.

## I. ÜMUMİ MƏLUMAT

Quranın anlaşılması istiqamətindəki fəaliyətlər əsri-səadət dövrü ilə birlikdə başlamışdır. Bu fəaliyətlər əvvəlcə şifahi olaraq başlamış, hicri II əsrin ikinci yarısından etibarən isə yazılı şəkildə davam etmişdir. Girişdə təfsir və onunla bağlı olan məfhumlara yer vermişdik. Burada da təfsir tarixi mövzusundan bəhs etməyə çalışacağıq.

### A. Quranın təfsir edilməsinin zəruriliyi

Quran insanları pis şeylərdən uzaqlaşdırmaq və onlara yaxşı şeyləri göstərmək üçün göndərilən bir mesajdır. Onun bu yönünü insanlara anlatma fəaliyyətlərinə təfsir deyilir. Quranın insanlara anlatılmasında ilk müfəssirlik vəzifəsini yerinə yetirən Hz. Peyğəmbərdir. Belə ki, Qurani-kərimin ilk təfsiri

يَا أَيُّهَا الرَّسُولُ بَلِّغْ مَا أُنزِلَ إِلَيْكَ مِن رَّبِّكَ وَإِن لَّمْ تَفْعَلْ فَمَا بَلَّغْتَ رِسَالَتَهُ ...

*"Ey Peyğəmbər! Sənə Rəbbindən göndəriləni təbliğ et. Əgər bunu yerinə yetirməsən Onun risalətini (insanlara) çatdırmamış olarsan..."*[240] məalındakı ayəsi ilə

... وَأَنزَلْنَا إِلَيْكَ الذِّكْرَ لِتُبَيِّنَ لِلنَّاسِ مَا نُزِّلَ إِلَيْهِمْ...

*"Sənə Quranı nazil edik ki, insanlara endirilən (şeyi) onlara açıqlayasan"*[241] şəklindəki ayəsinin ifadə etdikləri kimi Hz. Peyğəmbərlə

240 Maidə, 5/67.
241 Nəhl, 16/44.

başlamışdır. O, Quranda təfsirə ehtiyacı olan nəssləri izah etmişdir. Buna görə də səhabilər Quranı şərh etməyə çox da ehtiyac hiss etməmişlər. Ancaq Hz. Peyğəmbərin vəfat etməsi və İslam dinini geniş bir əraziyə yayılması nəticəsində əvvəllər mövcud olmayan problemlər ortaya çıxmış və insanlar mənsub olduqları mədəniyyətlərdən təsirlənərək bəzi fikirlərini Quranla təməlləndirmək istəmişlər. Bunu görən səhabilər Quranı təfsir etməyə başlamışlar və sonrakı dövrlərdə də bu təfsir fəaliyyətləri inkişaf edərək davam etmişdir.

Quranın təfsir edilməsinin bəzi səbəbləri vardır ki, bunları belə sadalamaq olar:

1. Yuxarıdakı ayələrdən[242] gördüyümüz kimi Quranın özü özünün təfsir edilməsini istəyir.

2. Quran *"səlat"*, *"zəkat"*, *"həcc"* və bunlara bənzər terminlərə yeni mənalar yükləmişdir ki, bu mənaların təfsir olunmağa ehtiyacı vardır.

3. Quranda mübhəm, müşkil, mütəşabeh, mücməl və mütləq ayələr vardır ki, bunların izah edilməsi lazımdır.

4. Quranın fərdi və ictimai həyata dair qoymuş olduğu hökmlərin ortaya çıxarılması və təfsir edilməsi lazımdır.

5. Qurandakı məcaz, kinayə, istişarə və təşbeh kimi ədəbi sənətlər mütəxəssislər tərəfindən izah edilməlidir.

6. Quranda eyni zamanda elmi həqiqətlərdən bəhs edən ayələr vardır ki, bunların təfsirinə ehtiyac vardır.

242 Maidə, 5/67; Nəhl, 16/44.

**B. Təfsirdə fərqlilik səbəbləri**

Hz. Peyğəmbər vəfat etdikdən sonra səhabilər hər hansı bir ayəni təfsir etmək istədikdə öncə Qurana, onda tapmasalar Rəsulullahın (s.ə.s) sünnəsinə, onda da tapmasalar özlərinin rəy və ictihadlarına müraciət edirdilər. Ancaq səhabilər zamanında Quran başdan sona qədər təfsir edilməmişdir. Onlar daha çox mənası gizli olan ayələri təfsir etmişlər. Sonrakı dövrlərdə isə təfsir fəaliyyətləri bir xeyli genişləndi və bunun nəticəsində də fərqli-fərqli təfsir və izahlar çoxaldı. Bu fərqliliyin səbəblərini aşağıdakı kimi açıqlamaq olar:

**1. Qiraət ixtilafları**

Nisə surəsinin 43-cü ayəsində keçən "*ləməstum*" sözünü buna misal vermək olar. Həmzə və Kisayi bu sözü əlifsiz sülasi fel kimi, digər qiraət imamları isə bu feli "*müfaalə*" babına görə oxumuşlar. Birinci qiraət şəklinə görə ayədəki bu sözün mənası "*toxunmaq*" deməkdir. İkinci qiraət tərzinə görə isə bu fel "*cinsi əlaqə*" mənasına gəlir. İmam Şafei birinci qiraəti əsas alaraq naməhrəm qadınlara toxunmanın dəstəmazı pozacağı haqqında hökm çıxarmışdır. İmam Əbu Həhifə isə ikinci qiraəti əsas alaraq naməhrəm qadınlara əl ilə toxunmanın dəstəmazı pozmayacağı və burada "*cinsi əlaqənin*" qəsd olunduğuna dair hökm vermişdir.

**2. Çox mənalılıq**

Quranda bəzi kəlmələr vardır ki, bunlar birdən çox mənaya gələ bilirlər. Fərqli mənalar daşıyan bu kəlmələr fərqli təfsir şəkiilərinin ortaya çıxmasına səbəb olur.

فَأَصْبَحَتْ كَالصَّرِيمِ .

*"Və bağ yanıb qapqara oldu"*[243] ayəsindəki *"əs-sarim"* kəlməsini buna misal verə bilərik. Çünki bu kəlmə *"barsız bağ, biçilmiş tarla, gecənin bir hissəsi, heç bir şey bitməyən qumlu ərazi"* kimi mənalar daşıyır.

### 3. İtlaq və təqyid

Quranda bəzi ayələr vardır ki, onlar həm mütləq məna, həm də təqyidi məna daşıma qabiliyyətindədirlər. Məsələn,

لاَ يُؤَاخِذُكُمُ اللّهُ بِاللَّغْوِ فِيَ أَيْمَانِكُمْ وَلَـكِن يُؤَاخِذُكُم بِمَا عَقَّدتُّمُ الأَيْمَانَ فَكَفَّارَتُهُ إِطْعَامُ عَشَرَةِ مَسَاكِينَ مِنْ أَوْسَطِ مَا تُطْعِمُونَ أَهْلِيكُمْ أَوْ كِسْوَتُهُمْ أَوْ تَحْرِيرُ رَقَبَةٍ فَمَن لَّمْ يَجِدْ فَصِيَامُ ثَلاَثَةِ أَيَّامٍ ذَلِكَ كَفَّارَةُ أَيْمَانِكُمْ إِذَا حَلَفْتُمْ وَاحْفَظُواْ أَيْمَانَكُمْ كَذَلِكَ يُبَيِّنُ اللّهُ لَكُمْ آيَاتِهِ لَعَلَّكُمْ تَشْكُرُونَ .

*"Bilmədən and içmənizə görə Allah sizi günahlandırmaz. Lakin bilə-bilə and-aman etsəniz sizi günahlandırar. Bunun kəffarəsi (əvəzi) isə-ailənizin orta yeməyindən on yoxsulu yedirtmək və ya onları geyindirmək, yaxud bir köləni azad etməkdir; (bunları) tapmayan üç gün oruc tutmalıdır. And içsəniz, andnızın kəffarəsi budur. Andlarınızı qoruyun! Allah öz ayələrini sizə belə aydınlaşdırır ki, bəlkə şükr edəsiniz"*[244] ayəsindəki üç gün oruc tutma hökmü Əbu Hənifə, əs-Səvri və onların tərəfdarlarına görə mütləq hökm deyildir. Yəni bu oruc üç gün dalbadal tutulmalıdır. Bu alimlər bu görüşlərinə dəlil olaraq Übeyy İbn Kəb və İbn Məsudun müshəflərindəki *"mütətəbiat"* sözünü almışlar.

Ancaq Şafei Übeyy ibn Kəb və İbn Məsudun müshəflərindəki *"mütətəbiat"* kəlməsini mütəvatir qiraət olmadığını söyləyərək bunun bir dəlil olmayacağı qənaətinə gəlmişdir. Buna görə də o, üç günlük orucun dalbadal deyil, müxtəlif günlərdə də tutula biləcəyinə hökm vermişdir.

243 Qələm, 68/20.
244 Maidə, 5/89.

### 4. Ümumulik və xüsusilik ixtilafı

Bəzən də ixtilaflar hər hansı bir kəlmənin xüsusi və ya ümumi mənalar daşıması ətrafında cərəyan edir. Məsələn,

أَمْ يَحْسُدُونَ النَّاسَ عَلَى مَا آتَاهُمُ اللّهُ مِن فَضْلِهِ ...

*"Yoxsa onlar Allahın Öz mərhəmətindən insanlara bəxş etdiyi şeylərə görə həsəd aparırlar*?..."[245] ayəsində keçən "*ən-nəs*" kəlməsi buna misal veril bilər. Çünki bu söz ilə həm Hz. Peyğəmbərin, həm onun ailə fərdlərinin və səhabilərinin qəsd edildiyi bildirilir. Bəlkə də "*ən-nəs*" sözünün cəm ifadə etməsindən yola çıxaraq onunla sadəcə Hz. Peyəmbərin qəsd olunmadığını deyə bilərik. Ancaq digər tərəfdən görürük ki, Quranda Hz. İbrahim üçün "*ümmət*"[246] ifadəsi işlədilməkdədir. Buna görə də "*ən-nəs*" sözü ilə sadəcə Hz. Peyğəmbərin nəzərdə tutulduğunu demək mümkündür.

### 5. Mənsux və möhkəm olma ehtimalı

İxtilafın bu növü həm Quranda nəsxin varlığını qəbul etməyənlər, həm də nəsxi qəbul etdikləri halda bir ayənin nəsxi mövzusunda ittifaq etməyənlər arasında cərəyan edir. Məsələn,

يَا أَيُّهَا الَّذِينَ آمَنُواْ اتَّقُواْ اللّهَ حَقَّ تُقَاتِهِ ...

"*Ey iman gətirənlər! Allahdan lazımınca qorxun*..."[247] aysəini bəzi müfəssirlərmənsux,bəziləriisəmöhkəmkimiqiymətləndirmişlərdir. Bu ayənin mənsux olduğunu söyləyənlərə görə "*Allahdan lazımınca qorxmaq*" bir müsəlmanın bütün varlığı ilə Allahın əmrlərini yerinə yetirməsi və qadağalarından da uzaqlaşması deməkdir ki, buna insanların gücü çatmaz. Buna görə də Allah-təala

245 Nisa, 4/54.
246 Nəhl, 16/120.
247 Ali İmran, 3/102.

فَاتَّقُوا اللَّهَ مَا اسْتَطَعْتُمْ ...

*"O zaman gücünüz çatdığı qədər Alahdan qorxun..."*[248] ayəsini endirərək Ali-İmran surəsinin 102-ci ayəsini nəsx etmişdir. Ancaq müfəssirlərin əksəriyyətinə görə burada heç bir nəsx hadisəsindən söhbət gedə bilməz. Hər iki ayə də eyni mənanı ifadə edir.

**6. Sələfdən gələn fərqli rəvayətlər**

Hər hansı bir mövzuda sələfdən gələn fərqli rəvayətlər də müfəssirlərin fərqli nəticələrə gəlməsinə səbəb olmuşdur. Məsələn,

هَذَانِ خَصْمَانِ اخْتَصَمُوا فِي رَبِّهِمْ ...

*"Bunlar öz Rəbbi barəsində (bir-birilə) münaqişədə olan iki düşməndir..."*[249] ayəsində keçən iki qrupun kimliyi barəsində sələf alimlərinin fərqli rəvayətləri vardır. İbn Abbasdan gələn bir rəvayətdə ayədəki iki zümrədən "*mömin və kafirlərin*" qəsd olunduğu bildirilir. Başqa bir rəvayətdə isə bu ayənin "*müsəmanlarla əhli-kitab*" arasındakı Allaha onlardan hansının daha çox qul olmağa layiq olması barədəki münaqişəyə dair endiyi zikr olunur. Həmçinin Əbu Hüreyrə və İkrimə ayədəki iki qrupdan məqsədin "*cənnət*" və "*cəhənnəm*" olduğunu söyləmişlər.

## II. TƏFSİRİN MEYDANA ÇIXMASI VƏ TƏDVİNİ

Hz. Peyğəmbər, bir tərəfdən ona vəhy olunan Quran ayələrini təbliğ edir, digər tərəfdən də mənası başa düşülməyən mövzuları açıqlayırdı. Hər nə qədər ilk dövrdəki müsəlmanlar ərəb dilini bildikləri üçün Quranı ümumi mənada anlama imkanına sahib olsalar da, eyni zamanda "ümmi" bir cəmiyyət olduqları üçün mütəşabeh ayələri və bəzi məsələləri başa düşmədə çətinlik

248 Təğabun, 64/16.
249 Həcc, 22/19.

çəkirdilər. Onlar bu cür şeylərlə qarşılaşdıqda Hz. Peyğəmbərə müraciət edirdilər.

Təfsirin bu ilkin mərhələsini Peyğəmbər mərhələsi, yaxud təfsirin əzbərdən ötürülməsi mərhələsi adlandırmaq olar. Bu mərhələ Hz. Peyğəmbərin vəfatına qədər davam etmişdir. Bu vaxt təfsir şifahi şəkildə olmuş, dildən-dilə ötürülmüşdür. Əs-Süyuti müxtəlif hədis və təfsir kitablarında Hz. Peyğəmbərə aid edilən təfsir rəvayətlərini toplamış, onların Quran surələrinin tərtibi əsasında yerləşdirmiş və təqribən 250 belə hədis olduğunu göstərmişdir.[250]

Hz. Peyğəmbər vəfat etdikdən sonra isə səhabilər Quranı anlamada çətinlik çəkdikləri zaman, təfsir sahəsində şöhrət tapmış şəxslərə üz tuturdular. Ancaq bu dövrdə təfsir fəaliyyətləri əsasən şifahi şəkildə idi və bu fəaliyyətlər də Qurandakı bəzi qərib kəlmələrin izahından ibarət idi. Təfsirin təbliği mərhələsi adlanan bu mərhələ təqribən hicrətin II əsrinin əvvəllərinə qədər davam etmişdir.

Təfsirin təşəkkülündə üçüncü mərhələ yazılı təfsir topluları (əl-müsənnəfat əl-camiə) mərhələsi adlandırıla bilər. Buna "təfsirin tədvini dövrü" də deyilir. Bu mərhələdən daha sonra bəhs edəcəyik.

Əlbəttə təfsirə aid bütün bu fəaliyyətlərin təməlində Hz. Peyğəmbərin təfsiri dururdu. Buna görə də təfsirin meydana çıxmasından bəhs edərkən əvvəlcə onun təfsirini ələ almamız lazımdır.

250 Süyuti, *əl-İtqan*, IV/214-257; Şeyxülislam Allahşükür Paşazadə, *Quranın Təfsiri və Tərcüməsi Tarixi*, s. 167.

## A. Təfsirin Meydana Çıxması

### 1. Hz. Peyğəmbərin təfsiri

Hz. Peyğəmbərin Quranı insanların ehtiyacına görə təfsir etdiyini daha öncə qeyd etmişdik. Bu təfsirlərə hədis məcmuələrində və Rəsulullaha (s. ə. s) qədər gedib çıxan rəvayətlərdə rastlamaq olar. Onun səhabilərə açıqladığı Quran həqiqətləri onları irşad etmək məqsədi daşıyırdı. Rəsulullah (s.ə.s) ya hər hansı bir ayəni oxuyaraq təfsir edər, yaxud da səhabilərin verdiyi suallar əsasında ayələri təfsir edərdi. Bəzən də o öz sözünü dəlilləndirmək üçün bir ayəni oxuyub onu izah edərdi. Ancaq Hz. Peyğəmbərin təfsirinin funksiyasını, hansı şərtlərdə təfsir etməsini və onun təfsirinin miqdarını təsbit etmək lazımdır.

#### a. Sünnənin Quran təfsirindəki rolu

Qurani-kərimin təfsirinin inkişafı sünnənin təşəkkülü ilə bağlıdır. "Sünnə Quranı təfsir edir" prinsipi öz təcəssümünü miladı VIII əsrin ikinci yarısında Quranın mətninin təfsiri ilə bağlı hədis toplularında, məsələn, "*əs-Səhih əl-Buxari*"də xüsusi fəsillərin meydana çıxmasında tapır.

Qurtubi (vəfatı-671/1273) sünnənin Quran təfsirində iki funksiyanı yerinə yetirdiyini bildirir. Bunlardan biri izah edilməsi lazım olan Quran nəsslərini təfsir etməsidir ki, buna "*bəyan*" deyilir. Digər funksiyaya gəlincə bu da Quranda olmayan bir hökmü gətirməsidir ki, buna da "*təşri*" (hökm qoyma) deyilir. Sünnənin Quranı təfsiri etməsi deyildikdə onun Qurandakı mütləqi təqyid, mübhəmi bəyan, mücməli təfsil, müşkili təvzih və ümumi olanı xüsusiləşdirməsi qəsd olunur. "*Təşri*" (hökm qoyma) funksiyası Hz. Peyğəmbərə Allah tərəfindən verilmişdir. Yəni mütləq mənada şari (hökm qoyan) Allahdır, Hz. Peyğəmbər də məcazi mənada şaridir. Quran bu haqda belə deyir :

...فَإِن تَنَازَعْتُمْ فِي شَيْءٍ فَرُدُّوهُ إِلَى اللّهِ وَالرَّسُولِ إِن كُنتُمْ تُؤْمِنُونَ بِاللّهِ وَالْيَوْمِ الآخِرِ ...

*" ... Əgər siz Allaha və axirət gününə inanırsınızsa, bir şey haqda mübahisə etsəniz , onu Allaha və Rəsuluna həvalə edin...."*[251]

Hz. Peyğəmbərə təşri vəzifəsinin verildiyini bu hədis-i şərif də dəstəkləyir : "*Rəsulullahın haram etdiyi şeyin Allahın haram etdiyi şey kimi olduğunu bilin*"[252] Onun hökm qoymasına misal olaraq beş namazın vaxtının təyin olunmasını, vitr namazının vaciblyini, orucu pozan və pozmayan şeylərin nələr olmasını, aybaşı olan qadının namaz qılmaması və oruc tutmamasını və s. kimi hökmləri verə bilərik.

**b. Hz. Peyğəmbərin Quranı təfsir şəkilləri**

Hz. Peyğəmbərə gələn vəhy, əshab tərəfindən anlaşıldığı üçün ayələrin izahına çox da ehtiyac qalmırdı. Ancaq gələn hər mesajın əslinə uyğun olaraq anlaşıldığını söyləmək də doğru olmazdı. Belə bir vəziyyətdə Hz. Peyğəmbər ya əshabın suallarına cavab olaraq, ya da heç bir suala ehtiyac olmadan bəzi açıqlamalar vermişdir. Bu açıqlamalarda Hz. Peyğəmbrin istifadə etdiyi metodlardan bəziləri bunlardır:

*a) Mücməli təbyin etməsi (açıqlaması)*

Bilindiyi kimi mücməl, nə qəsd edildiyi anlaşılmayan nəss deməkdir. Bu cür ayələrin bir qismi Allah, bir qismi də Rəsulullah(s.ə.s) tərəfindən açıqlanmışdır. Hz. Peyğəmbərin açıqladığı ayələrin başında əhkam, qeyb, yaradılış, qədər, qiyamət və əxlaqi mövzuları əhatə edən ayələr gəlir:

...وَلاَ تَقْتُلُواْ النَّفْسَ الَّتِي حَرَّمَ اللّهُ ...

251 Nisa, 4/59.
252 İbn Macə , Müqəddimə, 2

*"Haqlı olmadıqca Allahın haram etdiyi cana qıymayın..."*[253] ayəsindəki mücməlliyi Hz. Peyğəmbərin bu hədis-i şərifi açıqlamışdır: *"Allahdan başqa tanrı olmadığına və mənim Allahın Rəsulu olduğuma iman eden heç bir müsəlmanın qanı halal deyildir. Ancaq bu üç şeydən birini edərsə (o zaman halal olur) : Adam öldürmək , evliykən zina etmək və dindən çıxaraq müsəlmanlaradn ayrılmaq."*[254]

*b) Mübhəmi təfsil etməsi*

Ulumul-Quran bəhsində də ifadə edildiyi kimi mübhəm, bəzi varlıqların açıq olaraq deyil, ismi-işarə, ismi-məvsul, zamir, cins ismi, bilinməyən zaman zərfi və bilinməyən məkan zərfləri ilə zikr edilməsi mənasına gəlir. Mübhəm ifadədə qeyri-müəyyənlik və anlaşılmazlıq vardır. Quranda yer alan mübhəm ifadələr Hz. Peyğəmbər tərəfindən açıqlanmışdır.

حَافِظُواْ عَلَى الصَّلَوَاتِ والصَّلاَةِ الْوُسْطَى وَقُومُواْ لِلّهِ قَانِتِينَ

*"Namazları (xüsusilə də) orta namazı hifz edin və Allaha itaətdə durun"* [255] ayəsində orta namazdan nəyin qəsd olunduğu aydın deyildir. Burda "*əs-salat əl-vusta*" (*orta namaz*) sözü mübhəmdir. Lakin Hz. Peyğəmbərin "*orta namaz ikindi namazıdır* "[256] hədisi bu mübhəm ifadəni təfsil etmişdir (açıqlamışdır).

*c) Mütləqi təqyid etməsi*

Mütləq məna və məfhum baxımından hər hansı bir məhdudiyyəti olmayan kəlmə deməkdir. Bu cür kəlmələrin mənasının təsbit edilməsi onların təqyid edilməsini zəruriləşdirir. Hz. Peyğəmbər Quranın mütləq şəkildə ortaya qoyduğu ayələri başa düşüləcək vəziyyətə gətirmək üçün onları təqyid etmişdir:

---

253 Ənam, 6/151.
254 Buxari, əl-Qasamə, 6.
255 Bəqərə, 2/238.
256 Tirmizi, ət-Təfsir, surə, 2.

وَالسَّارِقُ وَالسَّارِقَةُ فَاقْطَعُواْ أَيْدِيَهُمَا جَزَاء بِمَا كَسَبَا نَكَالاً مِّنَ اللّهِ وَاللّهُ عَزِيزٌ حَكِيمٌ .

*"Tutduqları əməlin cəzası olaraq Allah tərəfindən bir ibrət olsun deyə, oğru kişi və qadının hər ikisinin əlini kəsin! Allah qüdrət və hikmət sahibidir "*[257] ayəsindəki mütləq hökmü Hz. Peyğəmbər (s.ə.s) *"əlin biləkdən kəsiləcəyini"* bildirərək məhdudlaşdırmışdır.[258]

*d) Müşkili təvzih etməsi*

Təfsir üsulunda aralarında ziddiyət (problem) varmış kimi görünən ayələrə müşkil ayələr deyilir. Halbuki, Quran ayələri arasında belə bir ziddiyətin olması mümkün deyildir. Buna görə də Hz. Peyğəmbər bu cür ayələrin anlaşılması üçün bəzi açıqlamalar gətirmişdir:

وَإِن مِّنكُمْ إِلَّا وَارِدُهَا كَانَ عَلَى رَبِّكَ حَتْمًا مَّقْضِيًّا .

*"Sizlərdən oraya girməyəni olmayacaqdır. Bu, sənin Rəbbin tərəfindən artıq həll olunmuş bir hökmdür "*[259] ayəsində hər kəsin cəhənnəmə girəcəyi bildirilir. Başqa ayələrdə isə

إِنَّ اللَّهَ يُدْخِلُ الَّذِينَ آمَنُوا وَعَمِلُوا الصَّالِحَاتِ جَنَّاتٍ تَجْرِي مِن تَحْتِهَا الْأَنْهَارُ ...

*"Allah, inananvə əməlisaleh olanları dibindən çaylar axan cənnət bağlarına daxil edər..."*[260] buyurulur. Zahirən biz bu ayələrin bir-birinə zidd olduğunu görürük. Lakin Hz. Peyğəmbərin aşağıdakı hədisi bu ziddiyəti ortadan qaldırır: "(Ayədəki ) vürud sözü girmək deməkdir. İstər günahsız olsun və istərsə də günahkar, cəhənnəmə girməyən heç kəs qalmayacaqdır. Ancaq cəhənnəm möminlərə Hz. İbrahimə olduğu kimi sərin və səlamətli olcaq. Hətta cəhənnəm atəşi

257 Maidə, 5/38.
258 Şafei, ər-Risalə, s. 104.
259 Məryəm, 19/71.
260 Həcc, 22/14, 23.

onların sərinliyindən fəryad edəcəkdir. Sonra Allah müttəqiləri xilas edəcək, zalımları isə diz üstə çökmüş halda qoyacaqdır "[261].

### c. Rəsulullahın etdiyi təfsirin miqdarı

Müsəlman alimləri Hz. Peyğəmbərin (s.ə.s) səhabilərə açıqladığı təfsirin miqdarı barədə müxtəlif fikirlər söyləmişlər. Onlardan bəziləri iddia etmişlər ki, Hz. Peyğəmbər (s.ə.s) öz səhabilərinə olduqca məhdud miqdarda ayə təfsir etmişdir, bəziləri isə göstərmişlər ki, Hz. Peyğəmbər (s.ə.s) Quranın bütün mənalarını və sözlərini səhabilərə bəyan etmişdir. Bəzi alimlərə görə isə, Peyğəmbər (s.ə.s.) Quran ayələrini səhabilərə şifahi şəkildə izah etməklə yanaşı, həm də Quranın şəriət məsələləri, halal-haramla bağlı hökmlərini əməli olaraq, öz işlərində, davranış və hərəkətlərində onlara açıqlamışdır. Məsələn, Abdurrəhman əs-Süləmi yazırdı: "Bizə Quranı oxutduranlar rəvayət edirdilər ki Allahın Rəsulu (s.ə.s.) onlara on ayə oxutdurarmış və onlar bu ayələrə dair əməli öyrənməmiş ikinci on ayəyə keçməzlərmiş. Beləliklə onlar, bütün Quranı və əməli öyrənmişlər". [262]Bu mövzudakı görüşləri iki başlıq altında ələ ala bilərik:

#### 1) Rəsulullahın Quranın bir hissəsini təfsir etdiyi iddiası

Bu fikri ilk dəfə əl-Qəzzali (vəfatı-505/1111) səsləndirmişdir. Suyuti (vəfatı- 911/1505) də bu görüşü mənimsəmişdir. Bu alimlərin əsas aldığı dəlillərdən bir neçəsi belədir :

a. Hz. Aişə belə rəvayət edir : "Hz. Peyğəmbər Cəbrayılın ona öyrətdiyi müəyyən ayələr istisna Qurandan heç bir şey təfsir etməzdi."[263]

---

261 Əhməd İbn Hənbəl, *əl-Müsnəd*, III , 328-329
262 Paşazadə, *e.a.ə.* s. 168
263 İbn Kəsir, *Təfsir*, I, 6.

b. Hz. Peyğəmbərin Quran haqqındakı bəyanları sadəcə mənası anlaşılmayan ayələrlə bağlıdır. Mənaları başa düşülən ayələrin Hz. Peyğəmbər tərəfindən təfsir edilməsinin heç bir mənası yoxdur.

c. Günümüzə qədər gəlib çatan hədis kitablarında Hz. Peyğəmbərdən Quranın ancaq bir hissəsini təfsir edən rəvayətlərə rastlamaq mümkündür.

**2) Rəsulullahın Quranı başdan sona qədər təfsir etdiyi iddiası**

Bu iddianı ilk dəfə ortaya atan İbn Teymiyyədir (vəfatı-728/1328). Onun və tərəfdarlarının dəlilləri bunlardır:

a. *"...İnsanlara nə nazil edildiyini onlara izah edəsən deyə sənə Quranı endirdik..."*[264] ayəsi Hz. Peyğəmbərin Quranı başdan sona qədər təfsir etməkdən məsul olduğunu göstərir.

b. Səhabilərin Rəsulullahdan (s.ə.s) on ayə öyrəndikdən sonra o ayələrin mənalarını yaxşı qavrayıb əməl etmədikcə başqa ayələri öyrənmədikləri barədəki rəvayətlər də Hz. Peyğəmbərin Quranın bütün ayələrini səhabilərə izah etdiyini göstərir.

c. Onlar bəşəriyyətə dünyada və axirətdə xoşbəxt olmanın yollarını göstərən bir kitabın başdan sona qədər təfsir edilməməsini qeyri-mümkün hesab edirlər.

Lakin bir çox İslam aliminin də həmrəy olduğu kimi Hz. Peyğəmbərin Quranın bir hissəsini təfsir etdiyini söyləmək daha doğru olar. Çünki hədis kitablarına nəzər saldıqda görürük ki, Hz. Peyğəmbər daha çox şəriət məsələlərini və nisbətən çətin anlaşılan, yaxud müxtəlif mənalarda yozula bilən kəlamları təfsir etmişdir.

264 Nəhl , 16/44.

## 2. Səhabi təfsiri

Təfsirin təşəkkülündə ikinci mərhələ səhabilər dövrünü əhatə edir. Səhabilər ərəb olduqları üçün ərəb dilinin üslubunu və incəliklərini yaxşı bilirdilər. Onlar Quranı bilavasitə Hz. Peyğəmbərin özündən almış, ona yaxın olmuş, onun işlərində iştirak etmiş, davranış və hərəkətlərinin şahidi olmuş, təfsirlərini eşitmişdilər. Odur ki, onlar Quranı başqalarına nisbətən daha yaxşı bilirdilər.

Ancaq bu da bir həqiqətdir ki, səhabilərin hamısı Quranı eyni səviyyədə anlamamışdılar. Çünki onlar həm zəka, həm də elmə yiyələnmə imkanları baxımından bir- birindən fərqlənirdilər.

### a. Səhabilərin təfsir metodu

Səhabilər hər hansı bir ayəni təfsir edərkən əvvəlcə Qurana, sonra da sünnəyə müraciət edirdilər. Bu mənbələrdə heç nəyə rast gəlmədikdə isə özləri ictihad edirdilər. İctihadi təfsirlərində də ya dilə, ya da dinə çox əhəmiyyət verirdilər. Onlar etdikləri qarmmatik təhlillərlə sonrakı nəsillərə işıq tutmuşlar.

Səhabilər eyni zamanda nüzul səbəblərinə yer vermiş, Quranın nasix və mənsux ayələrini izah etmişlər. Onlar ayələri bəzən təxsis (xüsusiləşdirmə) yolu ilə, bəzən də tarixi metodla təfsir etməyə çalışmışlar. Məsələn, *"(Ya Rəsulum!) Məgər Allahın nemətini küfrə dəyişənləri (Allaha nankor olan Qüreyş kafirlərini) və ümmətini ölüm yurduna sövq edənləri görmürsənmi*?" ayəsini İbn Abbas, "Onlar Məkkə kafirləridir"-deyə təxsis etmişdir.

Əhzab surəsinin 10-cu ayəsi barədə Hz. Aişə: "Bu Xəndək günündə baş vermişdir" -deyərək ayədə bəhs olunan o şiddətli və qorxunc hadisənin baş verdiyi tarixi göstərərək ayəni açıqlamışdır.

Səhabilər arasındakı zəka, anlayış, elm və dünya görüşü kimi fərqliliklər, eyni zamanda onların bir hissəsinin daim Hz.

Peyğəmbərin yanında olması, nüzul səbəblərini, adət-ənənəni yaxşı bilənlərlə bilməyənlər arasındakı fərqlər, onlar arasında bəzi ixtilaflara səbəb olmuş və ayələrlə bağlı müxtəlif fikirlər səsləndirmələrinə gətirib çıxarmışdır.

**b. Səhabi təfsirinin dəlil olması**

Səhabilərin təfsirə dair söylədikləri sözlərin bizi nə dərəcədə əlaqədar etdiyini ortaya qoymaq üçün əvvəlcə bu sözlərin hədis üsulu baxımından dəyərini incələməliyik. Hədis elminə görə səhabi sözləri ya mərfu hədis hökmündədir, ya da mövquf xəbər sayılır. Əgər səhabilərin təfsiri, nüzul səbəbləri, mübhəmətul-Quran, nasix, mənsux və müğəyyəbatla əlaqəli olub, ictihad etmə və müstəqil düşüncə yürütmə sahəsinə aid deyilsə, bunlar mərfu hökmündə qəbul olunur. Fikir yürüdülməsi və ictihad olunması mümkün olan sahələrlə bağlı olan, lakin sadəcə səhabilərin öz elminə əsaslanan xəbərlərə isə "mövquf hədis" deyilir. Buna görə də səhabilərdən nəql olunan mərfu rəvayətlərin sonrakı nəsillər üçün mütləq dəlil olması məsələsində ixtilaf yoxdur. İslam alimlərinin əksəriyyəti bu cür rəvayətləri hüccət olaraq qəbul etmişlər. Bu cür rəvayətləri sonrakı nəsillərin əsas alması həm vacibdir, həm də bu xəbərlər onlar üçün dəlil sayılır.

Mövquf rəvayətlərə gəldikdə isə, bu mövzuda alimlər müxtləf görüşlərə sahibdirlər. Bəzi İslam alimlərinə görə səhabilərdən gələn mövquf xəbərləri almaq vacib deyildir. Çünki onların bu rəvayətləri ictihada əsaslanır. Müctəhid də doğru söyləyə biləcəyi kimi, xəta da edə bilər. Lakin bəzi alimlər mövquf xəbərlərin təfsirdə istifadəsini zəruri saymışlar. Onlara görə səhabilərin bu xəbərləri Hz. Peyğəmbərdən eşitmə və ya soruşub öyrənmə ehtimalı çoxdur. Həm də bu rəvayətlər səhabinin öz görüşünə əsaslansa belə, onların doğru söyləmə şansları yüksəkdir. Çünki Quran onların dilində

nazil olmuş və onlar 23 il ərzində Hz. Peyğəmbərdən məlumat və feyz almışlar. Buna görə də Hz. Peyğəmbərdən sonra Quranı ən yaxşı bilənlər onlardır.

Nəticə olaraq alimlər, ictihad etmədikləri mövzularda səhabi təfsirini dəlil saymışlar, onların ictihad etdikləri məsələlərdə isə Əbu Hənifə başda olmaqla əksər alimlər onun sonrakı nəsillər üçün mütləq dəlil olmadığını söyləmişlər.

**c. Səhabi təfsirinin xüsusiyyətləri**

Səhabilərin təfsir metodlarını maddələr halında belə sıralamaq olar:

1. Səhabilərin təfsirdəki ən əsas xüsusiyyəti, ayəni ayə, nüzul səbəbləri və Hz. Peyğəmbərdən eşitdikləri açıqlamalar ilə təfsir etmələridir.

2. Onlar Quranı başdan-ayağa qədər təfsir etməmişlər. Çünki onlar Quranı başdan-ayağa təfsir etməyə ehtiyac hiss etmirdilər. Buna görə də daha çox mənası gizli olan və çətin başa düşülən sözləri izah edirdilər.

3. Aralarında bəzən ihtilaflar çıxsa da, bu ixtilaflar bir-birinə təzad təşkil etməyib, təfsirdə müxtəliflik (zənginlik) sayılan fərqli rəylərdir.

4. Əhkam ayələrini çox təfərrüatı ilə şərh etmirdilər.

5. Bu dövrdə təfsir hələ şifahi şəkildə idi.

**d. Təfsirdə məşhur olan səhabilər**

Suyutinin göstərdiyinə görə, Hz. Peyğəmbərə ən yaxın səhabilərdən on nəfəri Qurani-kərimin təfsir sahəsində məşhur olmuşlar: Əbu Bəkr, Ömər ibn əl-Xəttab, Osman ibn Əfvan, Əli ibn Əbi Talib,

Abdullah ibn Məsud, ibn Abbas, Übeyy ibn Kəb, Zeyd ibn Sabit, Əbu Musa əl-Əşəri və Abdullah ibn əz-Zübeyr.

Rəşidi xəlifələr arasında təfsir sahəsində ən çox şöhrət tapan Hz. Əli olmuşdur. Onun bu sahədə nə qədər biliyə sahib olduğunu görmək üçün bu sözləri kifayətdir: " Məndən Allahın kitab barədə soruşun. Allah and olsun ki, Qurandakı hər bir ayənin harda nazil olduğunu, gecəmi, gündüzmü, ovalıqdamı, dağdamı endiyini bilirəm".

Səhabilər arasında təfsir elmində məşhur olanlardan biri də Abdullah ibn Abbas olmuşdur. İbn Məsud ona "Tərcümanul-Quran" adını vermişdir. Hz. Ömər də ondan bir ayə barəsində soruşan Əmr b. Həbəşə: "Allahın Peyğəmbərinə endirdiyi Quranı ən yaxşı bilən İbn Abbasdır"-deyərək ondan soruşmağı tövsiyə etmişdir. İbn Abbasdan sonra təfsirdə ən məşhur səhabilər İbn Məsud və Übeyy ibn Kəb hesab olunur.

### 3. Tabeun təfsiri

Bildiyimiz kimi Hz. Peyğəmbər Mədinədə İslam dövlətinin təməlini qoymuş və bu dövlətin sərhədləri onun zamanında artıq Ərəbistan yarımadasının xarcinə çıxmışdı. Peyğəmbərin vəfatından sonra fəthlər sayəsində bu dövlətin sərhədləri bir xeyli genişlənmişdi. Yeni fəth edilən ölkələrdə yaşayan insanların İslamı yaxşı bilən məmurlara, qazılara və müəllimlərə ehtiyacı vardı. Bu ehtiyac nəzərə alınaraq fəth olunan ölkələrə İslamı öyrətmək üçün müəllimlər və asayişi təmin etmək üçün məmurlar göndərilirdi. Bu ölkələrə gedən səhabilər tədris mərkəzləri qurur və burada Quranı və Hz. Peyğəmbərdən öyrəndikləri digər bilgiləri insanlara öyrədirdilər. Onların bu fəaliyyətləri nəticəsində getdikləri ölkə və şəhərlərdə müxtəlif məktəblər yarandı. Bu məktəblərin müəllimləri səhabilər, tələbələri isə tabeilər idi. Ancaq bu ölkələrdə ortaya çıxan

ixtilafalar, bu ixtilafları haqlı göstərmək üçün hər qrupun Qurana sarılması və bəzən də səhv təvillər etməsi nəticəsində Quranın doğru şəkildə təfsir edilməsinə çox ehtiyac duyulurdu. Buna görə də bu məktəblərin bəziləri Quran təfsirinə geniş yer verirdilər. Bunlar arasında üç məktəb daha sonralar çox məşhur oldu. İndi isə bu təfsir məktəblərindən bəhs edək.

### a. Təfsir məktəbləri

Məşhur səhabilərin qurduğu və məşhur tabii alimlərinin yetişdiyi bu məktəblər aşağıdakılardır:

#### 1) Məkkə məktəbi

Bu məktəbin banisi "*tərcümanu-l Quran*" adını daşıyan Abdullah ibn Abbas (vəfatı-68/687) sayılır. Mücahid (vəfatı-103/721), İkrimə (vəfatı-104/722), Tavus ibn Kisan (vəfatı-106/724), Səid ibn Cübeyr (vəfatı-95/714), Ata ibn Əbi Rəbbah (vəfatı- 114/732) kimi alimlər bu məktəbdə yetişmişdilər. Onlar İbn Abbasdan aldıqları biliklərlə kifayətlənmir, özləri də Qurani-kərimə təfsirlər yazırdılar. Erkən Məkkə müfəssirlərindən yalnız Mücahidin təfsiri zəmanəmizədək gəlib çatmışdır. Bu təfsir Abdullah İbn Əbi Nəcihin (vəfatı-131) ötürməsi əsasında əs-Sərvəti tərəfindən 1396/1976-cı ildə çap edilmişdir.

Mücahidin təfsirində Quranın bütün ayələrinin yox, yalnız sıra ardıcıllığı ilə surələrdəki çətin sözlərin izahı verilir. Mücahid bəzən ayələrin nazil olması səbəblərini göstərir, bu ayələrlə bağlı hekayətləri açıqlayır, fiqh məsələlərinə, nasix və mənsux ayələrin müəyyən edilməsinə, qiraətlər arasındakı fərqlərə az yer ayırır.

#### 2) Mədinə məktəbi

Bu məktəbin banisi Übeyy ibn Kəb (vəfatı-30/650) sayılır. Onun şagirdləri arasında ən məşhurları Zeyd ibn Əsləmə (vəfatı-136/753),

Əbu-l Aliyə ər-Riyahi (vəfatı- 90/709), Məhəmməd ibn Kəəb əl-Qurazi (vəfatı-118/736) olmuşlar. Zeyd ibn Əsləmə Peyğəmbərin (s.ə.s) məscidində elmi dərnəyə başçılıq etmışdır. O, əhli-fiqh və əhli-elm arasında nüfuz sahibi sayılmış, Quranın təfsirini yaxşı bilmiş və "*ət-Təfsir*" adlı kitab yazmışdır. Bu kitabı onun oğlu Abdurrəhman ibn Zeyd ötürmüşdür.

Mədinə təfsir məktəbindən danışarkən imam Cəfər əs-Sadiqin (vəfatı-148/765) də Quran təfsiri sahəsində məqamı açıqlanmalıdır. O dövr Mədinə alimlərinin əksəriyyəti, xüsusilə müfəssirlər imam Cəfər əs-Sadiqin şagirdləri olmuşlar. Hənəfi məzhəbinin qurucusu olan Əbu Hənifə imam Cəfər əs-Sadiqin elm məclislərində iki il dərs almış və demişdi : "O iki il olmasaydı, Nüman həlak olardı ".

**3) İraq** (Kufə) **məktəbi.**

Bu məktəbin qurucusu isə Abdullah ibn Məsud (vəfatı-32/652) olmuşdur. Mənbələrin bildirdiyinə görə bu məktəb daha çox rasional təməl üzərində qurulmuşdur. Buna görə də İslam alimləri İbn Məsudun qurduğu bu məktəbi ictihadi hərəkətlərin ilk nüvəsi kimi qəbul etmiş və onu "*İraq rəy məktəbi*" adlandırmışlar. İbn Məsudun şagirdləri arasında Əlqəmə ibn Qeys (vəfatı-61/681), Məsruq ibn əl-Əcda (vəfatı-63/682), Əsvəd ibn Yezid ən-Nəxəi (vəfatı-74/693) və Übeydə ibn Əmr əs-Səlmani daha məşhur olmuşlar .

**b. Tabeilərin metodu və tabeun təfsirinin dəlil olması məsələsi**

Tabeunun təfsir metodları əsasən bunlardır.

1. Tabeun dövründə Quran başdan-sona qədər təfsir edilmişdir.

2. Tabeun təfsirində kəlmə açıqlamalrı ilə yanaşı geniş fiqhi izahalara da yer verilmişdir.

3. Bəzi kəlmələri izah etmək üçün şeirlərdən istifadə olunmuşdur.

4. Tabeun alimləri Qurandakı qissələr haqqında əhli-kitab alimlərindən soruşmuş və israiliyyat adlanan bu bilgilərə öz təfsirlərində geniş yer vermişlər.

5. O dövrdə təfsir yazıya alınmamışdı (tədvin edilməmişdi). Təfsirə dair bilgilər şifahi yolla nəql edilmişdir.

İslam alimləri tabeun təfsirinin dəlil olub-olmadığı mövzusunda müxtəlif rəylər irəli sürümüşlər. Bəzi alimlər tabeun təfsirinin dəlil olmayacağını iddia etmişlər. Onlara görə tabeun alimləri təfsirə dair bilgiləri Hz. Peyğəmbərdən almamışlar. Ona görə də onların təfsiri səhabi təfsiri kimi dəlil ola bilməz. Bundan başqa tabeun alimləri ayələrin nüzul səbəblərinin də şahidi olmamışlar. Buna görə də onların yanılmaları mümkündür. Əbu Hənifə bu haqda belə deyir: *"Rəsulullahdan (s.ə.s) gələn baş-göz üstə, səhabidən gələndə sərbəstik (uyğun olanı seçə bilərik ) , tabeundan nəql olunana gəlincə isə onlar da bizim kimi adamlardır "*.

Müfəssirlərin əksəriyyəti isə tabeun təfsirinin dəlil ola biləcəyini müdafiə etmişlər. Onlara görə tabeun alimləri hər nə qədər Rəsulullahı (s.ə.s) görməmiş və ayələrin nüzul səbəblərinin şahidi olmamışlarsa da təfsirlərini səhabilərdən almışlar. Məsələn, Mücahid Quranı başdan-sona qədər üç dəfə Abdullah İbn Abbasa ərz etdiyini söyləmişdir.

Bəzi alimlər də sadəcə tabeun alimlərinin ittifaq etdiyi (həmrəy olduğu) təfsirlərin dəlil ola biləcəyi fikrini səsləndirmişlər.

Nəticə olaraq deyə bilərik ki, nüzul səbəbləri, nasix-mənsux, mübahəmətul-Quran və s. kimi ictihad etməyin mümkün olmadı-

ğı mövzularda siqa (mötəbər) tabeun müfəssirlərindən nəql edilən rəvayətləri dəlil saya bilərik.

**B. Təfsirin tədvini** (yazılması)

Tədvin kəlməsi, lüğətdə "*bir yerə yığmaq, toplamaq və cəm etmək*" mənarına gəlir. Termin olaraq isə tədvin, "*ilk dövrlərdən nəql olunan sözlü rəvayətləri düzgün şəkildə kitablarda toplamaq*" deməkdir.

Xəlifə Ömər ibn Əbd əl-Əziz hicri 101-ci ildə Xilafətin bütün yerlərinə Hz. Peyğəmbərin hədislərinin toplanması barədə fərmanlar göndərir. Hədislər cəm edilir, qaydaya salınır, isnadları dəqiqləşdirilir. Bu vaxt təfsir də hədisin bir fəsli (bab) kimi toplanır və öyrənilir.

Əvvəllər hədis elmnin bir qolu kimi tədvin edilən təfsir, çox keçmədən müstəqil bir elm kimi formalaşdı. Tabeun dövrünün sonlarına qədər sözlü olaraq nəql edilən təfsir rəvayətləri ilə yanaşı, insan təfəkkürünün inkişafı və bəzi yeniliklərin ortaya çıxması nəticəsində əqli (ictihadi) təfsir ortaya çıxdı.

Tədvin dövründə, əvvəllər şifahi yolla nəql olunan rəvayətlər toplanmış, qərib kəlmələrlə yanaşı, əsbabün-nüzul, nasix-mənsux və Quranın ecazkarlığı ilə əlaqədar rəvayətlərə yer verilmişdir.

Bu dövrdə rəvayət təfsiri ilə yanaşı dirayət təfsiri də ortaya çıxmış, xüsusilə fiqhi və kəlami məzhəblərin ortaya çıxması ilə daha da inkişaf etmişdir. Beləliklə də, Quranın nüzulu ilə başlayan təfsir fəaliyyətləri, tədvin dövründə yeni bir yola girmiş, şifahi dövrdə üzərində durulmayan bəzi mövzulara yer verilərək, həm rəvayət təfsirində, həm də dirayət təfsirndə canlanma baş vermişdir.

Mənbələr bizə Quran haqqındakı nəqlləri bir yerə toplayaraq onu başdan-sona qədər bir bütün olaraq təfsir edən ilk şəxsin Müqatil b. Süleyman (150/767) olduğunu bildirir.

İlk müstəqil təfsirlərdən olduğu söylənilən bir digər təfsir də Əbu Zəkəriyyə Yəhya b. Ziyad əl-Fərranın (207/822) *Məanil-Quran* adlı əsəridir. Ancaq bu əsəri tədvin dövrünün ilk əsəri saymaq geyri-mümkündür. Çünki, Müqatil b. Süleyman Fərradan yarım əsr əvvəl yaşamışdır. Bu mövzuda fərqli fikirlər səslənsə də, ümumiyyətlə qəbul edilən görüşə görə ilk tədvin edilən təfsir Müqatil b. Süleymanın qələmə aldığı təfsirdir. O dövrün ilk müfəssirləri və onların yazmış olduğu təfsirlər bunlardır:

Müqatil b. Süleyman, *ət-Təfsirul-Kəbir*

Süfyan əs-Sevri, *Təfsirus-Sevri*

Yəhya b. Səllam, *Təfsiru Yəhya*

əl-Fərra, *Məanil-Quran*

Əbu Übeydə, *Məcazul-Quran*

Abdurrəzzaq b. Həmmam, *Təfsir*

## III. TƏFSİRİN MƏNBƏLƏRİ VƏ NÖVLƏRİ

Təfsiri, insanın vəhyə əsaslanaraq vəhyi anlama cəhdi kimi də tərif edə bilərik. Tarixə nəzər saldıqda görürük ki, fərqli anlayış və bilgi dərəcəsinə sahib olan insanlar özlərinə görə müxtəlif metodlar ortaya qoyaraq Quranı anlamağa çalışmışlar. Bununla yanaşı bütün müfəssirlərin əsas məqsədi Allahın muradını təsbit etməkdir. Onların bu ortaq məqsədə yönələrək fərqli metodlarla Quranı anlama cəhdləri zamanla bir-birindən fərqli təfsir növlərinin ortaya çıxmasına səbəb olmuşdur. Bu təfsir növləri aşağıdakı kimi təsnif oluna bilər:

**A. Məvzii təfsir (Ayə-ayə təfsir)**

Quran ayələrinin müshəfin tərtibinə görə ayə-ayə və surə-surə təfsir edilməsinə "*məvzii təfsir*" (təfsirul-məvzii) deyilir. Bu təfsir növündə ayələrin müshəfdki tərtibi əsas alınır. Hər ayənin müəyyən yeri olduğu üçün bu təfsir məvzii təfsir adlandırılmışdır. Bu təfsir növünü əsas alan müfəssir Fatihə surəsindən başlayaraq Nəs surəsinə qədər Quranın bütün ayələrini bir-bir təfsir edər. Məvzii təfsir də təhlili və icmali təfsir deyə iki yerə bölünür.

**1. İcmali təfsir**

Quran ayələrinin qısa şəkildə təfsir edilməsinə "*İcmali təfsir*" deyilir. Müfəssir bu təfsir növündə qısa, ancaq açıq bir şəkildə ayələri təfsir edir. Cəlaleyn təfsirini icmali təfsir nümunəsi saymaq olar. Bundan başqa daha çox radio və televizor verilişlərindəki Quran haqqındakı söhbətləri də bu metodun işləndiyi təfsirlərə misal olaraq verə bilərik.

**2. Təhlili təfsir**

Quran ayələrinin müshəfin tərtibinə görə ayə-ayə və surə-surə təfsir edilib ayələrin bütün yönləri ilə incələnib ortaya çıxarılmasına "*Təhlili təfsir*" deyilir. Bu təfsir növündə müfəssir ayələrdə keçən qərib kəlimələri və ifadələri açıqlayır, onlar arasındakı münasibəti, varsa nüzul səbəblərini, ayə haqqında Hz. Peyğəmbər, səhabi və tabeundan gələn rəvayətləri zikr edir və intellektual səviyyəsindən də istifadə edərək ayə haqqındakı görüşünü bildirir.

Bu təfsir növü də rəvayət və dirayət təfsirləri deyə iki yerə ayrılır.

**a. Rəvayət təfsiri (Ənənəvi təfsir)**

Bu təfsir növü, Qurani-kərimin, Quranın özünün mübarək ayələrindən irəli gələn mənalar, habelə Hz. Peyğəmbərin, səhabilərin

və tabeilərin dedikləri əsasında təfsirini nəzərdə tutur. Rəvayət təfsirinin qaynaqları Quran, sünnə, səhabə və tabeun sözləri, ərəb dili və cahiliyyə şerləridir. Quranın ilk təfsirləri məhz ənənəvi təfsirlər olmuşdur. Bu cür təfsirlər səhabilər və tabeilər dövründə şifahi rəvayətlər şəklində mövcud olmuş, şifahi olaraq ötürülmüş, hicrətin ikinci əsrindən etibarən isə, xüsusilə də təfsirin tədricən hədis elmindən ayrılması ilə əlaqədar olaraq yazıya alınmışdır.

Allah-təala: "*Sonra onu (sənə) bəyan etmək də Bizə aiddir*! [265] buyuraraq, Quranın bəzi ayələrinin digər bəzi ayələri təfsir etdiyini bildirir. Belə ki, bəzi ayələrdə mütləq, mücməl və ümumi olan xüsusiyyətlər, digər ayələrdə təqyid, təfsil və təxsis olunmuşdur. Məsələn, "*Bu gün dininizi sizin üçün kamil etdim, sizə olan nemətimi tamamladım və sizin üçün din olaraq islamı bəyənib seçdim*"[266]ayəsində qandan bəhs olunmuş, lakin başqa bir ayədə "axıdılmılış qan"[267] ifadəsinə yer verilərək o ayədəki qanın axıdılmış qan olduğu açıqlanmışdır.

Fatihə suərsinin 3-cü ayəsində "din günü" ifadəsi mücməl ifadədir. İnfitar surəsinin 19-cu ayəsi bu mücməl ifadəni mübəyyən etmişdir (açıqlamışıdır): "*O gün heç kəs heç kəsin karına gələ bilməz. O gün hökm ancaq Allahındır!*"

Bəzi hallarda isə Qurandakı bir ayə başqa bir ayə tərəfindən təxsis olunur (xüsusiləşdirilir). Məsələn, Maidə surəsinin 3-cü ayəsindəki "məytə" sözü ümumi mənada işlənmişdir. Lakin bu ifadə, "*Sizin üçün bir dolanacaq vasitəsi olsun deyə, (ehramda ikən) dəniz ovu və onu yemək sizə də, yolçulara (səfərdə olanlara) da halal edildi*" [268]ayəsi ilə təxsis olunmuşdur.

265 Qiyamə, 75/19.
266 Maidə, 5/3.
267 Ənam, 6/145.
268 Maidə, 3/96.

Yuxarıda da qeyd etdiyimiz kimi rəvayət təfsirinin əsas qaynaqlarından biri də ərəb dilidir. Çünki Quran ərəb dilində nazil olmuşdur. Buan görə də müfəssir hər hansı bir ayənin üzərində durarkən ərəb dilinin qrammatikasına mütləq müraciət etməlidir.

Ərəb şerinin də Quran təfsirində böyük əhəmiyyəti vardır. Bu şeir ərəblərin sosial və əxlaqi davranışlarını, etiqad və dünya görüşlərini ortaya qoyur. Onalrın dünya təsəvvürünü dərk etməyə yardım edir. İbn Abbas: "Quranın qərib kəlmələri barədə məndən soruşduqlarınızı şeridə axtarın. Çünki şeir ərəbin divanıdır" demiş və ona Quranın hər hansı bir ayəsi haqqında soruşulduqda ehtiyac varsa şeirə müracət etmişdi.

**1) Rəvayət təfsirinin ümumi xüsusiyyətləri**

Rəvayət təfsirinin xüsusiyyətlərini belə sadalaya bilərik:

a. Təfsirdə əsas olan rəvayətdir. Rəvayət olmdan dirayət olmaz. Rəvayət təfsiri daha öncə gəlir və bu təfsir dirayət təfsirinin meydana çıxması üçün təməl olmuşdur.

b. Rəvayət təfsirinin mənbələri Quran, sünnə və mərfu xəbər hökmündə olan səhabi sözləridir.

c. Rəvayət təfsirində bəzən zəif və uydurma xəbərlərlə qarşılaşmaq mümkündür.

**2) Rəvayət təfsirinin zəif nöqtələri**

Rəvayət təfsir metodunda Quranın Quranla və ya səhih hədislərlə, və yaxud da "*mərfu*" sayılan səhabi sözləri ilə təfsirlərində heç bir şübhəyə yer yoxdur. Lakin sənəd zənciri nəzərə alınmadan səhabilərdən və tabiilərdən gələn rəvayətlərə və ya israiliyyat adlanan bəzi uydurma xəbərlərə əsaslanan təfsirləri doğru saymaq qeyri-mümkündür. İndi isə rəvayət təfsirinin zəif nöqtələrini bir-bir nəzərdən keçirək.

**a) Uydurma rəvayətlər**

Mənbələrin bildirdiyinə görə bəzi məzhəb mənsubları öz fikirlərini sünnəyə əsaslandırmaq məqsədi ilə bəzən hədis uydurmuşlar. Xüsusilə də Abbasilərə yaltaqlanmaq məqsədi ilə uydurulan bu sözlər Abbasilərin cəddi olan Abdullah ibn Abbasa isnad edilmişdir. Bundan başqa insanları Quran oxumağa həvəsləndirmək üçün Quranın fəzilətləri haqqında da hədislər uydurulmuşdur. Bəzi başqa dinlərə mənsub insanlar da İslama zərbə vurmaq üçün heç bir əsli olmayan xəbərləri təfsirlərə daxil etmişlər.

**b) Rəvayətlərin təhqiq olunmadan və sənədsiz nəqli**

Rəvayət təfsirinin əsas zəif nöqtələrindən biri də nəqlləri təhqiq etmədən verməkdir. Alimlərin bir qismi Quranı təfsir edərkən etdikləri nəqlləri araşdırmamış və bunun nəticəsində də təfsirlərə bir çox uydurma rəvayətlər girmişdir. Düzdür, İbn Cərir ət-Təbəri (vəfatı-311/923) kimi rəvayətləri cərh və tədil yönlərini araşdıraraq ələ alan müfəssirlər olmuşsa da, bunların sayı həddindən azdır.

**c) İsrailiyyat**

Rəvayətlərə görə İsrail, Hz. Yaqubun adı və ya ləqəbidir. Yaqub (ə.s.) da Quranda keçən məşhur on iki yəhudi boyunun (əsbat) atasıdır. İbrani dilində olan israil kəlməsi, isra (qul) və il (Allah) sözlərdən törəyib "Allahın qulu" deməkdir.

Rəvayət təfsirlərinin zəif nöqtələrindən birisi də israiliyyatdır. İsrailiyyat kəlməsi "*israiliyyə*" sözünün cəmidir. İsrail rəvayətləri yəhudi, xristian və digər dinlərə əsaslanan rəvayətlərdir. Bu rəvayətlərdə yəhudi ünsürü xristian ünsürünə nisbətən güclüdür, çünki müsəlmanlar yəhudilərlə daha çox ünsiyyətdə olmuş, Mədinədə onlarla bir icma daxilində yaşamışlar.

İsrailiyyat xəbərləri İslama uyğun olub-olmama baxımından iki yerə ayrılırlar. Birincisi Hz. Peyğəmbərin: ".. *Əhli-kitabdan heç nə soruşmayın. Özləri yoldan çıxan insanlar sizi əsla doğru yola çəkməzlər...*"[269] sözləri ilə nəqlinə icazə verilməyən, ikincisi isə "... *Bəni-İsraildən nəql edin. Bunda problem yoxdur...*"[270] hədisi ilə nəqlinə icazə verilən rəvayətlərdir.

İsrail rəvayətlərinin Qurani-kərimə yol tapmasının əsas səbəbi ondandır ki, Tövrat və İncildə öz əksini tapmış bəzi mövzulara, məsələn, Hz. Adəmin ilkin günaha bataraq Həvva ilə və onları bu işə sövq edən İblislə birlikdə cənnətdən qovulması və yerə endirilməsinə, Hz. Musanın Misir torpağında Fironla, sonra yəhudi qövmi ilə əlaqədar başına gələn əhvalatlara, Hz. İsa və anası Hz. Məryəmlə bağlı vaqiələrə və digər hadisələrə Quranda da toxunulmuşdur. Qurani-kərimdə bu məsələlərə yalnız ötəri toxunulur, onlar barəsində qısa və müxtəsər şəkildə, ibrətamizlik məqsədi ilə xəbər verilir, hadisələrin təfərrüatı təfsilatı ilə açıqlanmır və bu təbiidir: Qurani-kərim ilahi vəhyin nazil edilməsində varislik əlaqələrini daima qeyd etmiş və özündən əvvəlki kitabların doğruluğunu təsdiq etmişdir. Lakin sonralar müsəlman alimləri bu mövzuların təfsilatını əhli-kitab rəvayətlərində tapmış, bu rəvayətlərin Qurani-kərimdə verilən xəbərlərlə səsləşdiyini görmüş və heç bir təhlil aparmadan, həmin rəvayətlərin dürüstlüyünü, Quranın xəbərlərinə müvafiqliyini qətiyyən yoxlamadan onların çoxunu əxz edərək təfsirlərə daxil etmişlər.

Buna görə də tədqiqatçılar israil rəvayətlərini üç qismə ayırırlar: məqbul, məskut ənhu və mərfuz rəvayətlər.

"*Məqbul*" rəvayətlər o rəvayətlər sayılır ki, onların səhihliyi Hz. Peyğəmbərdən ötürülmüş düzgün xəbərlər əsasında sübuta yeti-

269 Əhməd. b. Hənbəl, *Müsnəd*, III, 378.
270 Buxari, Ənbiya, 50; Müslüm, Zühd, 72.

rilmişdir, məsələn, Hz. Xızırın adının müəyyən edilməsin barədə səhih hədis vardır, yaxud şəriətdə həmin rəvayətlərin səhihliyinə şahid-sübut vardır.

Səhihliyi və ya qeyri-səhihliyi məlum olmayan rəvayətlərə "*məskut ənhu*" (üstündən sükutla keçilmiş) deyilir. Bu cür rəvayətlərin ibrətamizliyinə görə hekayət edilməsi və yaxud təfsirlərdə verilməsi caiz sayılır, lakin onların səhihliyinə, habelə qeyri-səhihliyinə iman gətirmək düzgün hesab edilmir. Onlar barəsində susmağa üstünlük verilir.

"*Mərfuz*" (rədd edilmiş) rəvayətlər o rəvayətıərdir ki, onların islam şəriətinə, yaxud əqlin hökmlərinə müvafiq olmadığı müəyyən edilmişdir. Məsələn, Hüzeyfə ibn əl-Yəman Hz. Peyğəmbərin belə dediyini rəvayət etmişdir: "İsrailoğulları yolunu azdıqları zaman Allah onlara fars hökmdarı Buhtünnəsri göndərdi. Allah Buhtünəsrə 700 illik hökmdarlıq nəsib etdi..."[271] Bu xəbər tamamilə uydurmadır. Hz. Peyğəmbər qətiyyən belə bir söz deməmişdir.

İsrailiyyat rəvayətləri mövzu baxımından da üç qismə ayrılır:

1) Etiqad haqqındakı rəvayətlər.

2) İbadət və dini əhkamla bağlı olan rəvayətlər.

3) Vəz və nəsihətlə bağlı olan rəvayətlər.

İsrailiyyat, təfsirdə ən çox tənqid olunan mövzulardan biridir. Çünki israiliyyat adı altında lüzumsuz bir çox bilgi təfsir kitablarında özünə yer tapmış, Quranın ibrət məqsədi ilə yer verdiyi qısa mövzular belə çox geniş şəkildə ələ alınmışdır. Bu cür rəvayətlər isə insanları Quranın ruhundan və onun vermək istədiyi ilahi mesajdan uzaqlaşdırmışdır.

271 Təbəri, *əl-Camiul-Bəyan*, XV/22.

Mənbələrin xəbər verdiyinə görə israil ravayətlər Quran təfsirinə ilk dəfə Abdullah ibn Səlam, Kəb əl-Əxbar, Vəhb ibn Münəbbih və İbn Cüreyc kimi bəzi alimlər vasitəsi ilə daxil olmuşdur. Bunların hamısı yəhudi və xristian əsilli olub sonradan müsəlman olmuşlar. Onlar Tövrat və İncili çox yaxşı bilirdilər. Bunlardan başqa Abdullah ibn Abbas, Əbu Hüreyrə, Abdullah ibn Əmr ibnul-As, Təmim əd-Dari kimi səhabilər tərəfindən də bir çox israiliyyat xəbərləri nəql olunmuşdur.

**Məşhur rəvayət təfsirləri bunlardır:**

1. İbn Cərir ət-Təbəri (vəfatı-310/922) , *Camiu-l-bəyan an təvili-l Quran.*

2. Əbu Leys əs-Səmərqəndi (vəfatı-383/993), *Təfsiru-l Qurani-l əzim.*

3. əl-Bəğavi (vəfatı-516/1122), *Məalimu-t tənzil.*

4. İbn Atiyyə əl-Əndəlusi (vəfatı-546/1151), *əl-Müharrərü-l vəciz fi təfsiri- kitabil- əziz.*

5. İbn Kəsir (vəfatı-774/1372), *Təfsirul- Quranil-əzim.*

6. əs-Süyuti (vəfatı-911/1505), *əd-Dürrü-l mənsur fi-t təfsir bi-l məsur.*

**b. Dirayət təfsiri**

Rəvayətlərlə kifayətlənməyib ərəb dili və ədəbiyyatı, dini, fəlsəfi və müsbət elmlərə əsaslanan təfsirə dirayət təfsiri deyilir. Bu təfsir növünə "*rəy təfsiri*" və ya "*əqli təfsir*" də deyilir.

İslam coğrafiyası genişləndikdən sonra yeni fəlsəfi fikirlərin və məzhəblərin ortaya çıxması və nübüvvət əsrindən uzaqlaşdıqca müsəlmanların bilgi və məlumatlarının zəifləməsi nəticəsində həm əvvəllər üzərində durulmayan nəsslərin, həm də yenidən ələ

alınması lazım olan ayələrin təfsirinə ehtiyac vardı. Belə bir dövrə təsadüf edən bu təfsirin rəvayət mənbələri ilə yanaşı ictihaddan da istifadə etməsi zəruri idi. Bütün bunların bir nəticəsi olaraq dirayət təfsiri ortaya çıxdı.

Dirayət təfsirini rəvayət təfsirindən ayıran əsas cəhət, müfəssirin hər hansı bir məsələdə öz görüşünə yer verməsidir. Ancaq bu onun rəvayət təfsirindən hem istifadə etmədiyi mənasına da gəlmir. Bu təfsir növündə izlənən metod, əvvəlcə rəvayət təfsirində istifadə olunan mənbələrə müraciət etmək və o mənbələrdən əldə olunan bilgiləri ağıl süzgəcindən keçirməkdir.

Dirayət metodu ilə yazılan ilk təfsir nümunələri Mötəzilə alimlərinə məxsusdur. VIII əsrdə yazılmağa başlayan lüğəvi təfisrlər də dirayət metodu ilə yazılan təfsirlərədn hesab olunur.

**1) Dirayət təfsirinin məqbulluğu məsələsi**

Dirayət təfsirinin məqbulluğu mövzusunda alimlər iki qrupa ayrılır: Dirayət təfsirini məqbul sayanlar və məqbul saymayanlar. İlk əvvəl **bu təfsir növünü məqbul saymayanların dəlillərini** sadalayaq:

a. Təfsirdə ictihad zənn ifadə edər. Zənn isə qəti bilgi deyildir. Dirayət təfsiri də qəti bilgi olmadan Allahın yerinə danışmaqdır ki, bu da haramdır. Belə ki,

قُلْ إِنَّمَا حَرَّمَ رَبِّيَ الْفَوَاحِشَ مَا ظَهَرَ مِنْهَا ...

*"De: Rəbbim ... bir də Allah haqqında bilmədiyiniz şeyləri söyləmənizi haram etmişdir"*[272] ayəsi bu təfsirin hökmünü ortaya qoyur. Bundan başqa;

وَلاَ تَقْفُ مَا لَيْسَ لَكَ بِهِ عِلْمٌ ...

272 Əraf, 7/33.

*"Bilmədiyin şeyin ardınca getmə..."*[273] ayəsi də dirayət təfsirinin məqbul olmadığını göstərir.

b. Dirayət təfsirini ayələrlə yanaşı bəzi hədislər də qadağan etmşdir. Məsələn, Rəsulullah (s.ə.s) belə buyurmuşdur: *"Kim bilmədən Quran barəsində bir şey desə cəhənnəmdəki yerinə hazır olsun"*.[274] Yenə başqa bir hədisdə belə buyurulur: *"Kim öz ictihadı ilə Quran barəsində bir şey desə dediyi doğru olsa belə səhvdir"*.[275]

c. Bir çox səhabilərin Quranı öz ictihadları ilə təfsir etməkdən çəkinmələri də dirayət təfsirinin qadağan olduğunu göstərən başqa bir dəlildir. Hz. Əbu Bəkir bu məsələylə balı olaraq belə demişdir: "Quran haqqına öz rəyimlə və ya bilmədən bir şey söyləsəm, hansı yer məni üstündə daşıyar, hansı göy məni kölgəsində saxlayar?"[276]

d. Mənbələrin bildirdiynə görə tabeun alimlərinin də bir çoxu dirayət təfsirini məqbul saymamışlar. Məsələn, İbn Sirin belə deyir: "Übeydə əs-Səlmanidən Quranın bir ayəsi barədə soruşdum. O dedi: "Quranın hansı məsələlər haqqında nazil olduğunu bilənlər getdi. Allahdan qorx və doğru ol".[277] Məsruqun isə belə dediyi nəql olunur: "Quranı təfsir etməkdən uzaq durun, çünki o, Allahın nəqlidir".[278]

**Bu təfsir janrını məqbul sayanların dəlillərinə gəldikdə onlar aşağıdakılardır**:

a. Dirayət təfsirini qadağan edtiyi iddia edilən ayələr, hədislər və sələf alimlərindən gələn rəvayətlər Quran ayələri haqqında

273 İsra, 17/36.
274 Tirmizi, Təfsirul-Quran, 1.
275 Tirmizi, Təfsirul-Quran, 1.
276 Təbəri, *Camiul-Bəyan*, I/27.
277 Təbəri, *Camiul-Bəyan*, I/29.
278 İbn Kəsir, *Təfsir*, I/17.

heç bir bilgisi olmadan danışanlarla əlaqədərdır. Lüğəvi və dini biliklərə əsaslanan təfsirlərdə heç bir problem yoxdur.

b. Əgər bu təfsir növü qadağan olunsaydı o zaman səhabilər Quran təfsirində ictihad etməzdilər. Halbuki başda rəşidi xəlifələr olmaqla İbn Abbas kimi bəzi səhabilər ictihad etmişlər. İbn Məsud İraqda qurduğu təfsir məktəbini rəy/ictihad təməli üzərində qurmuşdur. Hz. Peyğəmbər Quranı başdan-sona qədər təfsir etməmişdi. Buna görə də o vəfat etdikdən sonra səhabilər bəzən özləri də ictihad etmişlər. Məsələn, Hz. Əbu Bəkir, Nisa surəsinin 176-cı ayəsindəki "kəlalə" kəlməsini öz fikrinə görə açıqlamış və belə demişdir: "Onu öz rəyimlə təfsir edirəm. Əgər doğrudursa Allahdan, səhvdirsə məndəndir. Kəlalə, uşaq və ata xaricindəki (mirasçılardır)".[279]

c. Hz. Peyğəmbər Muaz ibn Cəbəli Yəmənə vali olaraq göndərdikdə ona Allahın kitabı və Rəsulullahın (s.ə.s) sünnəsində tapmadığı bir mövzuda özünün ictihad etməsinə izn vermişdir.

d. Hər hansı bir mövzuda şəri nəss və qəti bilgi varsa o mövzuda zənn ilə əməl etmək doğru deyildir. Ancaq bunlar yoxsa o zaman zənn ilə əməl oluna bilər. Çünki zənn də, ictihad yolu ilə əldə olunan bilgi növüdür.

e. Tabeun alimlərinin bir hissəsi dirayət təfsirini məqbul saymasalar da, onların əksəriyyəti Quranı rəylə təfsir etmişlər. Hətta ictihad və rəylə təfsir tabeun dövründə sistemləşmişdir. Mücahid, İkrimə və s. müfəssirlər bir çox ictihadlar etmişlər.

Nəticə olaraq deyə bilərik ki, dirayət təfsiri təfsirin ənənəvi metodlarından bir qədər uzaqlaşsa da, heç də müfəssirin öz yaradıcılıq fəaliyyətində tam sərbəstliyini nəzərdə tutmur. Təfsirin bu janrın-

279 İbn Küteybə, *Təvilu-müxtəlifil-hədis*, s.29.

da yazan müfəssirlər Quran ayələrini istədikləri kimi, sıxılmadan, müstəqil mənalandıra bilməzlər.

**2) Dirayət təfsirində yanılma səbəbləri**

Dirayət təfsirindəki yanılma səbəblərini belə sadalaya bilərik:

a. Bu təfsir janrını işlədənlərin dil, sərf, nəhv, bəyan, bədi, məani, qiraət, kəlam, fiqh üsulu, səbəbi-nüzul, nəsx kimi elmləri bilmələri vacibdir. Əks halda Allahın qəsd etdiyi mənanı başqa tərzdə ifadə etmələri mümkündür.

b. Müfəssir hər hansı bir ayəni təfsir edərkən araşdırmadan o ayə barəsində əvvəlcədən hökm verərsə bu da onum səhv etməsi ilə nəticələnə bilər. Çünki bir müfəssirin öncədən hökm verməsinin təməlində həm keçmişdən gələn öz mədəniyyətinin, həm də sonradan idxal olunan fikirlərin təsiri var.

c. Dirayət təfsirində yanılmanın səbəblərindən biri də müfəssirin Quranı təfsir edərkən onun nazil olduğu dövrün dilini nəzərə almadan, müasir ərəb dili ilə təfsir etməyə cəhd etməsidir. Düzdür, ərəb dili dirayət təfsirinin mənbələrindən biridir. Lakin unutmamaq lazımdır ki, ərəb dili də Quranın nüzul dövrü ilə yaxından əlaqəlidir. Belə ki, Quranın ilk nazil olduğu vaxtlarda qazanmış olduğu mənalar, daha sonra ona yüklənəcək mənalar üçün təməl olmuşdur.

ç. Səhih rəvayətləri nəzərə almadan şəxsi arzu və istəklərə görə təfsir etmək də dirayət təfsirində yanılma səbəblərindən biridir.

d. Qiyamətin vaxtı, ruh, sur, dəbbətul-ərz və qəza-qədər kimi mahiyyəti tam olaraq bilinməyən mövzularda Allahın nə qəsd etdiyini aydınlaşdırmağa çalışmaq da yanılmaya aparıb çıxardır.

**Ən önəmli dirayət təfsirləri bunlardır**:

1. əz-Zəməxşəri (vəfatı-538/949), *əl-Kəşşaf an həqaiqit-tənzil*.

2. ər-Razi (vəfatı-606/1209), *Məfatihul-qeyb*.

3. əl-Beydavi (vəfatı-685/1286), *Ənvarut-tənzil və əsrarut-təvil*.

4. ən-Nəsəfi (vəfatı-710/1300), *Mədarukut-tənzil və həqaiqut-təvil*.

5. əl-Xazin (vəfatı-741/1340), *Lübabut-təvil fi məanit-tənzil*.

6. əl-Əlusi (vəfatı-1270/1853), *Ruhul-məani fi təfsiril-Quranil-əzim vəs-səbil məsani.*

7. Rəşid Rza (vəfatı-1354/1935), *Təfsirul-mənar*.

8. Əlmalılı Həmdi Yazır (vəfatı-1362/1942), *Haq dini Quran dili*.

9. Əbul-Əla əl-Məvdudi, *Təfhimul-Quran*.

**B. Mövzui (Mövzulara görə) təfsir**

“*Mövzu*” kəlməsi “*tərk etdi, atdı, doğdu, iftira etdi, yaratdı, iflas etdi, qoydu* ” və s. kimi mənalar daşıyan “*vədaə*” sözündən törəyən mimli məsdərdir. Mövzui təfsir “*hər hansı bir mövzunun Quran və ya surə bütünlüyü içərisində ələ alınıb həmin mövzu ilə əlaqəli məkki və mədəni ayələrin toplanması, bu ayələrin nüzul sırasına görə sıralanması və elmi metodlarla incələnərək Allahın o mövzudakı muradının ortaya çıxarılması*” kimi tərif edilmişdir.

Mövzui təfsir metodunun harda və nə zaman ortaya çıxdığı barədə dəqiq məlumat yoxdur. Bəzi alimlər bu təfsir janrının XX əsrdə Misirdə, bəziləri isə Hz. Peyğəmbər dövründə meydana çıxdığını iddia edirlər.

Bu təfsir janrı bir metod kimi ilk dəfə XX əsrdə ortaya çıxıb sürətlə yayılsa da, əslində bir çox təfsir janrları kimi mövzui təfsir janrı nümunələrinə də Hz. Peyğəmbərin dövründə rast gəlirik. Quranın

Quranla təfsiri metodunda olduğu kimi mövzuyla əlaqəli ayələrin toplanması mövzui təfsirin ilk mərhələsi sayıla bilər. Səhabilərdən bəzilərinin, xüsusilə də İbn Abbasın ondan soruşulan suallara verdiyi cavablar mövzui təfsirin ilk nümunələrindəndir.

Mövzui təfsir, Quranın bütünlüyünü əsas alan və surə bütünlüyü ilə kifayətlənən təfsir olmaq üzrə iki yerə ayrılır:

**1. Quranın bütünlüyünü əsas alan mözui təfsir**

Quranın bütünlüyünü əsas alan müfəssir əvvəlcə Quranın müxtəlf şəkillərdə bəhs və analiz etməsi barədə qənaətə gəldiyi bir mövzu müəyyənləşdirir. Sonar isə bu mövzu ilə əlaqəli ayələri Quran surələri içərisindən seçir. Daha sonra o mövzunun əsasını təşkil edən maddələri ayələr işığında müəyyən etməyə çalışır və bu maddələri nizamlayır. Bundan sonra mövzunu fəsillərə ayırır və bütün görüşlərinə Quran ayələri ilə dəlil gətirir. Müfəssir mövzunu incələrkən onu cəmiyyətin həqiqət və problemləri ilə əlaqələndirərək onları Quran işığı ilə işıqlandırmağa çalışır.

**2. Surə bütünlüyü ilə kifayətlənən mövzui təfsir**

Bu tərz mövzui təfsir birinci tərz mövzui təfsirə bənzəsə də bunun çərçivəsi daha dardır. Çünki, mövzui təfsirin birinci növündə mövzu Quran çərçivəsində ələ alınarkən, ikinci növdə isə sadəcə bir surədəki əsas məqsəd araşdırılır. Yəni surə bütünlüyü içərisində ələ alınan mövzui təfsir janrında surənin xüsusi və ümumi hədəfləri, məqsədləri və onun əhatə etdiyi mövzuların bir-biri ilə olan əlaqələri açıqlanır.

Müfəssirlər mövzui təfsir janrı üçün bəzi qaydalar qoymuşdurlar ki, Quranı bu təfsir janrına görə təfsir edən hər bir müfəssirin bu qaydaları bilməsi lazımdır. Həmin qaydalar aşağıdakılardır:

a. Qurani-kərimdən bir mövzu seçərək onun müəyyən bir adla adlandırması. Məsələn, "*Quranda ədalət*", "*Qurana görə qadın*" və s.

b. Mövzu ilə əlaqəli bütün ayələri toplamaq.

c. Həmin ayələrin nüzul sırasına görə düzülməsi və ya ən azından bu ayələrdən məkki-mədəni olanları təsbit etmək.

ç. Toplanan ayələri təfsirlərdən araşdırmaq.

d. Ayələrin ilk olaraq nazil olduğu dövrün şəraiti çərçivəsində ələ almaq.

e. Hər hansı bir hökmə varmadan öncə ayələrin ciddi olaraq araşdırılması.

ə. Elmi metodlara riayət etmək.

i. Kəlmə və məfhumları təfsir etmək.

## IV. BAŞLANĞICDAN GÜNÜMÜZƏ QƏDƏR TƏFSİR CƏRƏYANLARI

Təfsirin tədvin edilməsinə paralel olaraq onun inkişafı zaman keçdikcə bir-birindən fərqli cərəyanların ortaya çıxmasına zəmin hazırladı. Bunlar insanların ehtiyaclarına görə fiqhi, etiqadi, elmi, ictimai vs. təfsir anlayışları şəklində ortaya çıxdı. Bu şəkildə meydana çıxan təfsir cərəyanlarından bəzilərini aşağıdakı kimi qruplaşdırmaq olar:

### A. Filoloji (Lüğəvi) təfsir

Fəthlərdən sonra müxtəlif irqlərə, dinlərə, dillərə və mədəniyyətlərə mənsub insanlar İslam dövlətinin tərkibinə qatıldı. Bu da özü ilə bərabər müxtəlif problemlər gətirirdi ki, bu problemlərədən biri də İslam dinini yeni qəbul edən bu insanların Quranı oxuyub anlama ehtiyaclarının qarşılanması idi. Bu dövrdə

ərəb ədəbiyyatı fars, hind və yunan ədəiyyatlarının təsiri altında idi. Bütün bunların nəticəsində ərəb dili və ədəbiyyatı qaydalarının təsbit edilməsi, o cümlədən Quranın filoloji təhlili məsələsi ortaya çıxdı. Quran mətni ərəb dili qaydaları üçün vazkeçilməz bir mənbə idi. Bununla yanaşı ərəb şeri də Qurandakı bəzi ifadələri anlamada müraciət olunan mənbələrdən biri idi.

Hicri ikinci əsrdən etibarən dil sahəsindəki fəaliyyətlər daha da canlandı. Sibəveyh (vəfatı-180/796), Əxfəş (vəfatı-177/793) və Xəlil İbn Əhməd (vəfatı-170/786) kimi dilçilər bu sahədə əsərlər meydana gətirdilər.

Quranı, filoloji yöndən təfsir edən alimlər öz əsərlərinə "*Məanil-Quran*", "*Erabul-Quran*", "*Qəribul-Quran*" və "*Məcazul-Quran*" kimi adlar verirdilər. Dil baxımdan edilən təfsirlərə misal olaraq Fərranın (vəfatı-207/822) "*Məanil-Quran*", əl-Müsənnanın (vəfatı-210-825) "*Məcazul-Quran*" adlı əsərlərini verə bilərik. Sadəcə dilçi müfəssirlər deyil, eyni zamanda bir çox müfəssir də Quranı təfsir edərkən filoloji təhlillərə yer vermişlər. Məsələn, Zəməxşəri "*Kəşşaf*" adlı təfsirində çoxlu filoloji təhlillərdən istifadə etmiş, Quranın ecazkarlığını və bəlağətini ortaya qoymağa çalışmışdır. Başqa bir müfəssir olan Beydavi öz təfsirində filoloji açıqlamalara və ədəbi izahlara geniş yer vermişdir. Nəsəfi və Əbu Həyyan kimi müfəssirlər də Quranı filoloji yöndən açıqlayan müfəssirlər arasında xüsusi yerə sahibdirlər.

### B. Məzhəbi təfsirlər

Bilindiyi kimi İslam dininin meydana çıxdığı ilk əsrlərdən etibarən müxtəlif din anlayışları ortaya çıxmışdır. Bu müxtəlif anlayışlar ayrı-ayrı məzhəblərin zühur etməsinə səbəb olmuşdur. Bu məzhəblər, mənimsədikləri fikirləri əsaslandırmaq üçün ilk növbədə Qurani-kərimə müraciət edirdilər. Quranı təfsir edən alim-

lər mənimsədikləri məzhəblərin din anlayışını təfsirlərində əks etdirirdilər. Bu alimlərin bir hissəsi öz məzhəblərini ön plana çıxarmadığı halda, digər bir hissəsi isə əksinə təfsirlərində öz məzhəblərinin görüşlərinə daha çox yer vermişlər.

Əhli-sünnə təfsiri deyə tək anlayışa sahib təfsir məktəbindən bəhs etmək çox çətindir. Əhli-sünnə məzhəbinə mənsub bir çox təfsir məktəbləri vardır. Əslində biz "Təfsirin Mənbələri və Növləri" mövzusunda bəhs etdiyimiz məsələlər əsasən əhli-sünnə məzhəbinin ümumi təfsir anlayışını da ortaya qoyur. İndi isə digər məzhəblərin təfsir anlayışlarına yer verək:

### 1. Mötəzili təfsirləri

"*Ayrılanlar*" mənasına gələn Mötəzili məzhəbinin qurucusu Hişam ibn Abdulməlik zamanında yaşayan Vasıl ibn Atadır (vəfatı-80/131). Bu məzhəb Əməvilər dövründə ortaya çıxsa da, daha çox Abbasilər zamanında islam düşüncəsi fəaliyyətində öz yerini almışdır.

Mötəzili məzhəbi Quranı təfsir edərkən hər şeydən öncə ağıla böyük əhəmiyyət vermişdir. Onlara görə ağıl ilə nəql bir-birinə zidd olarsa bu zaman ağıl əsas alınar. Onlar mütaəşabeh ayələri təvil edərkən də ağıla çox önəm vermişlər.

Mötəzilə məzhəbinə görə Qurandakı bəzi ayələrdə simvolik ifadələr mövcuddur. Bu cür ayələrə həqiqi məna vermək tamamilə səhvdir. Məsələn, onlar

وَإِذْ أَخَذَ رَبُّكَ مِن بَنِي آدَمَ مِن ظُهُورِهِمْ ذُرِّيَّتَهُمْ وَأَشْهَدَهُمْ عَلَى أَنفُسِهِمْ أَلَسْتَ بِرَبِّكُمْ قَالُواْ بَلَى شَهِدْنَا أَن تَقُولُواْ يَوْمَ الْقِيَامَةِ إِنَّا كُنَّا عَنْ هَذَا غَافِلِينَ .

*"O zaman sənin Rəbbin Adəm oğullarının belindən zürriyyətlərini çıxardı və onların özlərini şahid tutaraq: "Mən sizin Rəbbiniz deyiləmmi?"-*

*demişdi. Onlar: "Bəli, biz şəhadət veririrk."- demişdilər. (Bu ona görə idi ki,) siz qiyamət günü: "Bizim bundan xəbərimiz yox idi"- deməyəsiniz"*[280] ayəsini simvolik olaraq təfsir etmişlər. Onlara görə Allah Adəm oğlunun soyunu onların sülbündən çıxararaq onunla danışması tamamilə təmsil və təsvirdən ibarətdir. Burada qəsd olunan Allahın insana rübubiyyətinin və üluhiyyətinin dəlillərini təqdim etməsi və insanların özlərinə nəzarət etmə mexanizmi olan ağılı da bu hadisəyə şahid tutmalarıdır.

Bəzən mötəzili müfəssirləri ortaya qoyduqları qaydalara əks olan səhih hədisləri inkar etmişlər. Bəzən də, "*xəbəri-vahidə*" qarşı çıxaraq onu qəbul etməmişlər. Onlar ağıla çox əhəmiyyət verdikləri üçün bəzi şeyləri inkar etmişlər. Məsələn, bu məzhəbə görə "*sehr*" və "*cadu*" əslində cahil insanlara təsir etmək üçün bir vasitədir. Fələq surəsindəki "*düyümlərə üfürən qadınlar*" ifadəsindən qəsd olunan sehr edən qadınlar deyil, əksinə hiyləgər, nazları ilə kişiləri fitnətyə salan qadınlardır. Mötəzili məzhəbinə mənsub alimlərin bir çoxu eyni zamanda cinlərin varlığını da inkar etmişlər. Bundan başqa onlar "*xəlqul-Quran*", "*rüyətullah*", "*şəfaət*" və "*kəramət*" kimi mövzularda da bir çox məzhəblərədən fərqli düşünmüşlərdir.

**Məşhur mötəzili təfsirlərə gəlincə bunlar aşağıdakılardır:**

1. Əbu Müslim əl-İsfəhani (vəfatı-322/934), *Camiut-təvil li muhkəmit-tənzil.*

2. Qazı Əbdülcəbbar (vəfatı-415/1024), *Tənzihul-Quran anil-mətain.*

3. Əbul-Qasim əl-Mürtəza (vəfatı- 436/1044), *Ğurəful-fəvaid və dürərül-qəlaid*.

4. əz-Zəməxşəri (vəfatı-538/1143), *əl-Kəşşaf*.

280 Əraf, 7/172.

**2. Şiə təfsirləri**

Şiəlik Hz. Peyğəmbərin vəfatından sonra xəlifəliyə Hz. Əli və onun əhli-beytinin daha layiq olduğunu müdafiə edən qrupa verilən addır. Bu məzhəbi digər məzhəblərdən ayıran əsas nöqtə "*imamət*" məsələsidir. Bu məzhəb öz içərisində Zeydiyyə, İsmailiyyə, İmamiyyə kimi bir çox qollara ayrılır. Lakin şiə məzhəbləri arasında ən böyük məzhəb İmamiyyə (Cəfəri) məzhəbidir. Buna görə də biz bu məzhəbin təfsir anlayışını ələ alacağıq.

İmamiyyə məzhəbinin təfsir anlayışını açıqlamadan əvvəl onun inanc əsasları üzərində durmaq lazımdır. Əhli-sünnə və şiə məzhəbləri tövhid, nübüvvət və məad kimi inanc əsaslarında eyni görüşlərə sahibdirlər. Lakin bu məzhəblər arasında bəzi fərqli cəhətlər də vardır ki, bunların da başında imamət inancı gəlir. İmamət inancı ilə əlaqədar daha dörd məsələ vardır. Bunlar ismət, mehdilik, ricət və təqiyyədir.

a. İmamət: İmam dini və dünyəvi liderdir. Şəriətin qorunması məsələsində Hz. Peyğəmbərin vəkilidir.

b. İsmət: İmam Peyğəmbər (s.ə.s) kimi zahirdə və batində doğuluşundan vəfatına qədər bütün pis şeylərdən məsumdur.

c. Mehdilik: Yerüzünə zülm və ədalətsizlik hakim olduqdan sonra Mehdi zühur edəcək və dünyaya ədalət gətirəcəkdir.

d. Ricət: Gözlənən imam gəldikdən sonra Allah-təala ölənlərin bir hissəsini öldükləri şəkildə yenidən dirildəcək, onların bəzilərini yüksəldəcək, bəzilərini isə alçaldacaqdır. Kimin haqlı, kimin də haqsız olduğunu ortaya çıxaracaqdır.

e.Təqiyyə: Cəmiyyətdən və ya hər hansı bir fərddən müxtəlif şəkillərdə qorunmaq, mənsub olduğu məzhəbi, o məzhəbin ma-

lını, öz canını və inancını gələcək zərər və ziyanlardan mühafizə etməkdir.

İmamiyyə məzhəbinə görə Quran təfsirində əsas alınacaq rəvayətlər imamalardan nəql olunan rəvayətlərdir. Quranın həm zahiri, həm də batini mənası vardır. Quranın zahiri tövhid, nübüvvət və risalətə dəvət, batini isə imamət, vəlayət və bunlarla əlaqədar şeylərdir. Zahir və batin məsələsində imamiyyə məzhəbi sufilərlə eyni düşünməkdədir. Ancaq sufilərə görə batini mənanı rüsux sahibləri, imamiyyə məzhəbinə görə isə imamlar və onlardan feyz alanlar anlayar.

Bu məzhəbə mənsub müfəssirlər Quranda imam Mehdinin zühur edəcəyinə işarə edildiyini və

...لَتُؤْمِنُنَّ بِهِ وَلَتَنصُرُنَّهُ ...

"...*Əlbətdə ona inanacaqsınız və ona yardım edəcəksiniz...*"[281] ayəsindən də bunun qəsd edildiyini söyləmişlər.

Kəlam mövzularında İmamiyyə məzhəbi Mötəzili məzhəbinə daha yaxındır. Məsələn, bu məzhəb alimləri

لاَّ تُدْرِكُهُ الأَبْصَارُ وَهُوَ يُدْرِكُ الأَبْصَارَ

"*Gözlər Onu idrak etməz, O gözləri idrak edər*"[282] ayəsini əsas alaraq "*rüyətullah*" (Allahın görülməsi) məsələsini qəbul etməmişlər. Bundan başqa imamiyyə müfəssirləri إِلَى رَبِّهَا نَاظِرَةٌ "*... öz Rəbbinə baxacaqlar*"[283] ayəsini isə"*Rəbbinin savabını gözləyirlər*" deyə təfsir etmişlər.

Həmçinin İmamiyyə müfəssirləri Nisə surəsinin

281 Ali İmran, 3/81.
282 Ənam, 6/103.
283 Qiyamə, 75/22-23.

فَآتُوهُنَّ أُجُورَهُنَّ مِنْهُنَّ فَمَا اسْتَمْتَعْتُم بِهِ

*" ... Onlardan faydalandığınıza görə mehrlərini qayda üzrə özlərinə verin..."*[284] ayəsini mütə nikahına dəlil saymışlar. Bundan başqa bu məzhəbə görə dəstəmazda ayaqlar məsh edilməlidir. Bəqərə surəsinin وَلاَ تَنكِحُواْ الْمُشْرِكَاتِ حَتَّى يُؤْمِنَّ "*...iman etmədikcə bütpərəst qadınlarla evlənmyin*[285]..." ayəsinə əsaslanaraq müşriklərlə və əhli-kitabdan olanlarla evlənməyin haram olduğu qənaətinə gəlmişlər.

**İmamiyyə məzhəbinin əsas təfsirləri bunlardır:**

1. Hicri III əsrin sonu və IV əsrin əvvəllərində yaşayan Əli İbn İbrahim əl-Qumminin təfsiri.

2. Əbu Cəfər Məhəmməd İbn Həsən İbn Əli ət-Tusi (vəfatı-460/1068), *ət-Tibyan*.

Şiə fəqihi olan Tusinin qələmə aldığı bu əsər ilk şiə təfsirlərindən hesab olunur. Təfsirdə rəvayət və dirayət metodundan istifadə olunmuşdur. Bu əsər 10 cilddən ibarətdir.

3.Əbu Əli əl-Fəzl İbn Həsən ət-Təbrəssi (vəfatı-538/1153), *Məcməul-bəyan fi təfsiril-Quran*.

Bu təfsirin müqəddiməsində oxuyucuya bəzi Quran elmləri barədə məlumatlar verilmişdir. Şiə təfsirləri arasında ən mükəmməl təfsirlərdən biri hesab olunur. Qrammatik qaydalara ciddi əməl olunmuş, bəlağətə geniş yer ayrılmışdır.

4. Məhəmməd İbn Mürtəza (vəfatı-1091/1680), *əs-Safi*.

5. Məhəmməd Hüseyn ət-Təbatəbai, *əl-Mizan fi təfsiril-Quran*.

Bu əsər 20 cilddən ibarətdir. Bu təfsir də ən məhşur təfsirlərdən hesab olunur.

284 Nisa, 4/24.
285 Bəqərə, 2/221.

6. Mir Məhəmməd Kərim Bakuvi, *Kəşfül-Həqayiq an Nükətil Ayəti vəd Dəqayyiq*

Daha əvvəl də bəhs etdiyimiz bu əsər üç cilddən ibarət olub həmyerlimiz Məhəmməd Kərim Bakuvi tərəfindən yazılmışdır.

**3. Xaricilərin təfsiri**

Əvvəlcə Hz. Əliyə yardım edən, daha sonra isə "*təhkim hadisəsində*" Əbu Musa əl-Əşərini hakim təyin etdiyi üçün küfrə düşdüyü qənaətinə gələrək ona müxalif olan qrupa "*Xaricilər*" deyilmşdir.

Xaricilər Quranın zahirini əsas almışlar. Quran ifadələrindəki əsas məqsədləri gözardı etmişlər. Məsələn, onlara görə bir adam bir yetimin malından az miqdarda yesə belə Nisə surəsinin 10-cu ayəsində buyurulduğu kimi onun cəhənnəmdə yanması vacib olar. Ancaq o adam yetimi öldürər və ya qarnını yarasrsa o cəhənnəmdə yanmaz. Çünki bu barədə nəss yoxdur. Bundan başqa xaricilər əməlin imanın bir parçası olduğunu söyləmişlər. Buna görə də əməli tərk edən imanı da tərk etmişdir.

Xarici məzhəbinə aid təfsirlər olduqca azdır. Bir də bu məzhəbin sadəcə İbadiyyə qolu günümüzə qədər gəlib çatmışdır. Ən məşhur İbadiiyyə təfsiri Məhəmməd İbn Yusif İftiyyeşin (vəfatı- 1332/1914) "*Himyənuz-zad ilə dəril-məad*" təfsiridir.

**C. Elmi təfsir**

Bu təfsir cərəyanı Quranda müxtəlif elmlərə, kəşf və icadlara işarə olunduğu fikrindən meydana çıxmışdır. Mənbələrin bildirdiyinə görə elmi təfsir dirayət təfsirinin doğuşu ilə ortaya çıxmışdır ki, bu da daha çox Abbasilər dövrünə təsadüf edir. Elmi təfsiri sistemli olaraq ilk dəfə ələ alan əl-Qəzali (vəfatı-505/1111) olmuşdur. O bu sahədə "*Cəvahirul-Quran*" adlı əsər meydana gətirmşdir.

Bu janrda təfsir yazan və bunu ən yaxşı tətbiq edən isə Fəxrəddin ər-Razidir (vəfatı-606/1209). Ondan sonra isə bu sahədə bayrağı Məhəmməd əl-Mursi (vəfatı-655/1257) və Suyuti (vəfatı- 911/1505) almışdır.

XIX əsrdə Avropanın təsiri ilə İslam aləmində ortaya çıxan intibah hərəkatı ilə yanaşı elmi təfsir hərəkatı da yenidən canlandı. Məhz bu dövrdə Məhəmməd ibn Əhməd əl-İsgəndərani (vəfatı-1306/1888) "*Kəşfül-əsrarin-nuraniyyətul-Quraniyyə*" adlı bir əsər yazdı. Ondan sonra da bəzi alimlər bu janrda əsərlər meydana gətirdi. Ancaq elmi təfsir Tantavi Cövhərinin (vəfatı-1359/1940) yazmış olduğu "*əl-Cəvahir fi təfsiril-Quran*" əsəri ilə öz zirvəsinə çatdı. Onun qələmə aldığı bu əsər iyirmi beş cilddən ibarətdir.

Bu təfsir janrına üstünlük verənlər bəzi dəllilər gətirərək bunu əsaslandırmaq istəmişlər ki, onların bu dəlilləri aşağıdaklardır:

1. Quranda fiqh elm ilə əlaqədar təxminən yüz əlli ayə vardır. Ancaq fizika, kimiya, astronomiya, biologiya, tibb və s. elmlərlə əlaqəli ayələrin sayı isə yeddi yüz əlliyə çatır.

2. Qurandakı "*...Biz kitabda heç nəyi nəzərdən qaçırmamışıq...*"[286], "*...Hər şeyi açıqlasın deyə sənə kitabı Biz nazil etdik...*"[287] kimi ayələr də buna işarə edir.

3. Mütəşabeh ayələr də bu təfsir janrını zəruriliyini göstərir.

4. "Onda əvvəllər yaşayanlar kimi sonra gələcəklər haqqında da xəbərlər vardır. Aranızda ortaya çıxacaq məsələlərin (ixtilafların) hökmü də vardır. Bundan başqa onun bədii mənaları tükənməz, çox təkrar olunmaqla əskiməz" [288] hədisi-şərifi də bu təfsir anlayışını dəstəkləyir.

286 Ənam, 6/38.
287 Nəhl, 16/89.
288 Tirmizi, Fəzailul-Quran, 14.

Bu təfsir növünü məqbul sayanlarla yanaşı ona qarşı çıxanlar da olmuşdur. Böyük fəqih olan Şatibi (vəfatı-790/1388) elmi təfsirə etiraz edən alimlərin başında gəlir. Ondan başqa Məhəmməd Hüseyn əz-Zəhəbi (vəfatı-1399/1978) və Əmin əl-Xuli də təfsirin bu növünü qəbul etməmişlər. Onlara görə Quranı nazil olduğu dövrdə yaşayan insanların bilmədiyi mənalarla təfsir etmək yol verilməzdir. İstər dil və bəlağət, istərsə də müsəmanların etiqadı baxımdan bu mümkün deyildir. Çünki Quran, dini və əxlaqi yönü çox olan bir kitabdır və köklü elmi ənənəyə sahib olmayan bir cəmiyyətə nazil olmuşdur. Allahın məqsədi elmi məsələləri açıqlamaq deyil, əksinə tövhidi və əxlaq prinsiplərini bəşəriyyətə çatdırmaqdır.

Bundan başqa elm daim inkişaf edir və dəyişir. Elmdə bugün doğru olan sabah səhv ola bilər. Ona görə də elmi təfsir qəbul edilməzdir. Məsələn, Razi Bəqərə surəsinin 22-ci ayəsindəki "*O Allah ki, sizin üçün yer üzünü döşədi, göyü isə tavan yaratdı*" cümləsini təfsir edərkən bu ayənin dünyanın öz oxu ətrafında fırlanmadığına dəlalət etdiyini söyləmişdir.[289]

Nəticə olaraq deyə bilərik ki, Qurani-kərim əlbətdə fizika, kimiya, cəbr, həndəsə, astronomiya və s. elmilərin əsaslarını ortaya çıxardan kitab deyildir. Ancaq Quranı sadəcə nazil olduğu dövrlə əlaqələndirmək də doğru deyildir. Çünki Quran hər dövrə xitab edən kitabdır. Buna görə də onu təfsir edən müfəssir yaşadığı əsrin elmi fəaliyyətlərindən də faydalanmalıdır.

### D. İşari (Təsəvvüfi) təfsir

Təsəvvüf, zühd və təqva vasitəsi ilə ruhu iztirablardan, pis xislətlərdən təmizləmə və dünyəvi məşğuliyyətlərdən uzaq tutma yoludur. Təsəvvüf, Quranın sezgi və duyğu yönünü təmsil edir.

289 Razi, *Məfatih*, II/102

Təsəvvüf məfhumu, Quranda mövcud olmasa da, prinsip, məqsəd və həyat tərzi kimi vardır. Quranın əxlaq, təfəkkür, zikr, təsbeh, təhmid, təkbir... və s. məfhumlarını mütəsəvviflər araşdırmış, bu məfhumların keçdiyi ayələri təfsir etmişlər.

Təsəvvüfün kökləri Hz. Peyğəmbərə və səhabələrə qədər gedib çıxır. Tabeun dövründə zühd və təqva hərəkatı daha da genişləndi və bu hərəkat müxtəlif təfsir məktəblərinin ortaya çıxdığı bir dönəmə təsadüf etdiyi üçün mütəsəvvüflər də Quranı təsəvvüfi çərçivədə təfsir etməyə başladılar. Beləliklə "*işari təfsir*" meydana çıxdı.

"İşarə" kəlməsi lüğətdə "b*ir şeyi göstərmək, bir şeyi üstü örtülü ifadə etmək, kinayəli şəkildə anlatmaq*" və s. mənalara gəlir. Təsəvvüf termini kimi isə işarə, "sözdən istifadə etmədən bir məqsədi başqasına bildirmək, ifadə olunması mümkün olmayan, sadəcə ilham və kəşf yolları ilə əldə olunan bilgi və sezgi sayəsində başa düşülən məna" deməkdir. Buna görə də təsəvvüfə eyni zamanda "işarə elmi" də deyilmişdir.

"Sadəcə təsəvvüf ərbabının bildiyi və zahiri mənaya uyğunlaşdırılması mümkün olan bəzi gizli anlamlar və işarələrlə Quranın təfsir edilməsinə isə "*işari təfsir*" deyilir". Alimləri Quranda zahiri məna ilə yanaşı batini mənanın da mövcud olduğunu qəbul etmişlər. Onlara görə Quranda buna dəlalət edən nəsslər vardır. Məsələn,

فَمَا لِهَؤُلاء الْقَوْمِ لاَ يَكَادُون يَفْقَهُونَ حَدِيثًا

"*... Axı bu qövmə nə olub ki, heç söz də anlamırlar*"[290] və

وَأَسْبَغَ عَلَيْكُمْ نِعَمَهُ ظَاهِرَةً وَبَاطِنَةً

290 Nisa, 4/78.

*"... Allah sizə zahir və batin nemətlərini bol-bol ehsan eylədi ..."*[291] ayələri bu ayələrdəndir.

Mütəsəvvüflər Hz. Peyğəmbərdən gələn hədislər içərisində də batini mənaya işarə edən hədislərin var olduğunu söyləmişlər. Məsələn onlar, *"Əgər siz mənim bildiklərimi bilsəydiniz, az gülər çox ağlayardınız"*[292] hədisinin buna dəlalət etdiyini iddia etmişlər.

**İşari təfsirin məqbul olamsı üçün bəzi şərlər vardır ki, onları belə sadalaya bilərik:**

1. Batini məna zahiri mənaya zidd olmamalıdır.

2. Batini mənanın doğru olduğunu göstərən başqa bir nəss və ya dəlil olmalıdır.

3. Batini mənaya müxalif hər hansı bir şəri və əqli dəlil olmamalıdır.

4. Sadəcə batini mənanın doğru olduğu söylənməməlidir.

İşari təfsirin ilk təmsilçiləri Həsən əl-Bəsri, Cəfər Sadiq və Abdullah ibn Mübarək hesab olunur. Təsəvvüfün tam olaraq formalaşmadığı dövrdə yaşayan bu alimlər sadəcə Quranın bəzi ayələrini işari şəkildə təfsir etmişlər. O dövrdə hər ayədən deyil, bəzi ayələrdən batini mənalar çıxarılırdı. Lakin Quranın geniş mənaları əhatə etdiyi fikri yayıldıqca, hər ayədən batini mənaların çıxarıla biləcəyi qənaəti hasil olmağa başladı. Bu fikri mənimsəyənlər belə düşünürdülər: Quran Allahın kəlamıdır. Kəlam da Allahın sifətidir. Allahın sifətlərinin sonu olmadığı kimi, kəlamının da sonu yoxdur. Ancaq Allah vəli qullarının qəlbinə bu kəlamın nə qədərini açmışsa, o qədərini anlaya bilərlər.

291 Loğman, 31/20.
292 Buxari, əl-Küsuf, ən-Nikah, 107.

Beləliklə tabeun və ətbəut-tabeun dövründən sonra işari təfsir sistemli şəkildə formalaşmışdır. İşari təfsirin sistemleşməsində ən böyük rolu Səhl b. Abdullah ət-Tustəri (v. 283/896), Cüneyd Bağdadi (v. 298/910) və Məhəmməd b. Musa əl-Vasiti (v. 331/942) oynamışdır.

İşari təfsir yazan ilk müfəssir İbn Ata (v. 309/922) hesab olunur. Ancaq onun əsəri günümüzə qədər gəlib çıxmamışdır.

İşari təfsirin inkişafına ən böyük təkan isə Əbu Abdurrəhman əs-Süləminin (v. 412/1021) qələmə aldığı "*Həqiqətut-Təfsir*" adlı əsəri olmuşdur. Sülətmi bu əsərdə özündən əvvəlki mütəsəvviflərin təfsir və təvillərini toplamışdır. Buna görə də bəzi alimlər Təbərinin zahiri təfsir sahəsində gördüyü işi, Süləminin batini təfsir sahəsində gördüyünü söyləmişlər.

İşari təfsirin inkişafında önəmli rolu olan alimlərdən biri də əl-Qəzzalidir (vəfatı-505/1111). O, "*Ehyau-Ülumid-Din*" və "*Cəvahirul-Quran*" adlı əsərlərində Quran ayələrinin batini mənasına geniş yer vermişdir.

Bu təfsir janrı Mühyiddin İbn Ərəbinin (vəfatı-638/1240) gətirdiyi "*vəhdətul-vücud*" anlayışı ilə öz zirvəsinə çatmışdır. İbn Ərəbi *"əl-Fütühatul-Məkkiyyə", "Füsusul-Hikəm", "Kitabul-Qurbə", "İşarətul-Quran fi aləmil-İslam", "əl-Məqadisul-əsna", "Fasilun-mufid fi təfsiril-Fatihə"* adlı əsərlərində bir çox işari təfsir nümunələrinə yer vermişdir. İbn Ərəbinin *"əl-Cəm vət-təfsil fi əsraril-məani vət-tənzil"* adlı Kəhf surəsinə qədər təfsir yazdığı söylənsə də, bu təfsir günümüzə qədər gəlib çıxmamışdır.

**E. İctiami (sosial) təfsir**

"İnsanın hidayət yönünü və sosial problemləri ələ alan təfsir metoduna ictimai təfsir deyilir". XIX əsrin axırlarında ortaya

çıxan bu təfsir məktəbinin banisi misirli alim Məhəmməd Abduhdur (vəfat-1323/1905). Abduh əl-Əzhər universitetində müəllim vəzifəsində işləyərkən özünə məxsus bir metodla təfsir dərslərini verirdi. Məhz ictimai təfsir də onun bu metodları sayəsində meydana gəlmişdi.

O hər hansı bir müfəssirin təsirinə düşməsin deyə heç bir təfsirə baxmadan Quranı təfsir etməyə çalışırdı. Ancaq dil yönündən bir problemlə qarşılaşdıqda "*Cəlaleyn*" təfsirindən istifadə edirdi. Belə etməsinin səbəbini isə, Allahın qiyamət günündə insanları başqalarının fikirlərinə görə deyil, əksinə hidayətə və irşada çatdırmaq üçün nazil etdiyi kitabına və bu kitabı izah edən Peyğəmbərin (s.ə.s.) sünnəsinə görə hesaba çəkəcəyi ilə açıqlayırdı. Məhz bu səbəbə görə Quran barəsində keçmişdə söylənilən şeylərin mütləq surətdə müraciət edəcəyimiz qaynaqlar olmadığını iddia edirdi.

Keçmiş müfəssirlərin təqib etdiyi klassik metodun xaricində bir metod izləyən Abduh təfsir metodunun əsas qayəsi bəşəriyyətə dünya və axirət səadəti bəxş edən Quranı doğru anlamaq və onu məramına uyğun şəkildə təfsir etməkdir. Abduh, Quranı sırf qrammatik cəhətdən ələ alıb təfsir etməyi doğru saymırdı. O, əsl təfsirin Quranın sözlərindən nə qəsd edildiyini ortaya qoyan, etiqad və əxlaq kimi mövzularda ruhları cəzb edərək insanları, Quran buyuruqlarına görə əməl etməyə sövq edən təfsir olduğunu söyləyirdi. Əlbəttə, müfəssir Quranı izah edərkən ayələrdəki bəlağətə və qrammatik qaydalara da yer verməlidir. Ancaq bu heç vaxt ehtiyac miqdarını aşmamalıdır. Çünki Quranın məqsədi bu deyildir.

Onun yaşadığı dövrdə elmi və texniki tərəqqi günü-gündən artırdı. Bunun nəticəsində də dinə qarşı hücumlar get-gedə çoxalırdı. Dini müdafiə edən alimlərin bu hücumlara cavab verməları lazım idi. Başda Abduh olmaqla bu təfsir məktəbinə mənsub olan alimlər

İslamın ağıla çox əhəmiyyət verdiyini söyləyərək təfsirdə ağıla çox yer verməyə başladılar. Buna görə də bu təfsir məktəbi "*müasir mötəzili məktəbi*" adlandırılmışdır.

Elm adamları bu təfsir məktəbinin məqbul və qeyri-məqbul yönlərinin olduğunu söyləmişlər:

**1. Məqbul sayılan yönlər**

a. Bu təfsir məktəbinin ən əsas xüsusiyyəti təfsirdə hər hansı bir məzhəbin təsiri altında qalmamaqdır.

b. İsraili rəvayətləri tənqid etmələri, zəif və uydurma hədislərə, bidət və xurafat sayılan məlumatlara təfsirlərində yer verməmələri də bu təfsir məktəbinin məqbul hesab edilən cəhətləridir.

c. Təqlidə qarşı çıxması da bu məktəbin müsbət cəhətlərindən hesab olunur.

d. Bu təfsir məktəbinə mənsub müfəssirlər öz təfsirlərində lüzumsuz məlumatlara yer verməmişlər.

e. Sosial məsələləri ələ almaları, cəmiyyətin hidayət və irşadını əsas məqsəd saymaları bu məktəbin başqa bir müsbət cəhətidir.

**2. Qeyri-məqbul sayılan yönlər**

a. Ağla həddindən çox yer vermələri və onu nəqldən üstün tutmaları.

b. Buxari və Müslimdə keçən hədislərin bir hissəsini zəif hesab edərək rədd etmələri.

c. Ahad xəbərləri xüsusilə əqidə mövzularında dəlil qəbul etməmələri.

d. Aşırı təvillərə yer vermələri. Məsələn, Abduh Fil surəsinin təfsirində Əbrəhənin üstünə göndərilən quş dəstələrini milçək, on-

ların atdıqları palçıqdan hazırlanan daşları da mikrob kimi təvil etmişdir.

İctimai təfsir məktəbinə mənsub olan bazı alimləri və onların əsərlərini aşağıdakı kimi sıralamaq olar:

1. Məhəmməd Abduh (vəfatı-1323-1905), *Təfsiru cüzi- ammə*.

2. Rəşid Rıza (vəfatı-1354/1935), *Təfsirul-Quranil-həkim*. Bu təfsir eyni zamanda "*Təfsirul-mənar*"da adlandırılır. Rəşid Rza bu təfsiri, Nisə surəsinin 145-ci ayəsinə qədər Məhəmməd Abduhn açıqlamaları əsasında yazmış, Abduhun vəfat etməsindən sonra isə təfsiri öz təfsir anlayışına görə davam etdirmişdir. Ancaq bu əsər Rəşid Rza vəfat etdiyi üçün tamamlanmamışdır. Quranın on iki surəsini əhatə edən bu təfsir on iki cilddən ibarətdir.

3. əl-Mərağİ (vəfatı-1364/1945), *Təfsirul-Mərağİ*.

4. Seyyid Qütb (vəfatı-1906/1966), *Fizılalil-Quran*.

### F. Modernist təfsir

"*Moderne*" sözü fransız dilində "yeni və çağdaş" mənalarına gəlir. Bu kəlmədən əmələ gələn "*modernizm*" ifadəsi də intibah dövrü ilə ortaya çıxan ideoligiya və həyat tərzini mənimsəmə mənasını daşıyır. Bu kökdən törəyən "*modernist*" sözü də "yenilik və insan mərkəzli dünya görüşü tərəfdarı" anlamına gəlir.

İslamiyyət insanların istər Yaradıcısı, istərsə də digər insanlarla və təbiətlə olan dünyəvi əlaqələrini nizamlayan ilahi prinsiplər toplusudur. Bu prinsiplər ədalətə və insan haqlarına əsaslanan əxlaqlı bir cəmiyyət qurmağı qarşısına məqsəd qoyan, müsəlmanların və bütün bəşəriyyətin problemlərini həll etməyə qadir olan prinsiplərdir. İslamın ilk dövrlərdən etibarən insan həytına dinamizm gətirərək qısa bir zamanda Ərəbistan yarımadasından üç

qitəyə yayılmasının arxasında məhz bu prinsiplər yatmaqdadır. Çox təəssüflər olsun ki, İslamın bu dinamizmi müsəlmanların zəifliyi və idarəçilikdəki xətaları ucbatından yerini durğunluğa tərk etmişdir. Qərbin Şərqə meydan oxuması və Şərq üzərində qələbələr çalması uzun zamandan bəri durğunluq içərisində yaşayan İslam dünyasında getdikcə canlanan bir oyanış hərəkatına səbəb olmuşdur. Bu oyanış hərəkatının içərisində yer alan alimlər və düşüncə adamları bu vəziyyətdən çıxış yolları axtarmağa başladılar. Əvvəllər klassik mənada ortaya çıxan modernist təfsir get-gedə fərqli bir şəkil alaraq İslam modernizmi (Neo-İslam modernizmi) adlandırıldı. Modernist təfsir cərəyanını iki şəkildə ələ almaq olar:

**1. Klassik modernist təfsir**

Bu təfsir janrı ilk dəfə Hindistan və Misirdə ortaya çıxmışdır. Hindistandakı nümayaəndələri Seyyid Əhməd Xan (vəfatı-1316/1898) və Seyyid Əmir Əlidir (vəfatı-1347/1928). Misirdəki təmsilçilərə gəldikdə bunlar da Cəmaləddin Əfqani (vəfatı-1315/1897), Məhəmməd Abduh (vəfatı-1323/1905) və Məhəmməd Əbu Zeyddir.

Həm Hindistan, həm də Misir modernistləri, pozitivizmin təsiri altında qalaraq peyğəmbərlərin möcüzələrini, mələk və cin kimi təcrübə sahəsinə girməyən gözəgörünməz varlıqları ya təvil etmiş, ya da inkar etmişər. Məsələn, Seyyid Əhməd Xan merac hadisəsinin həqiqət olmadığını söyləmiş, Bəqərə surəsinin 260-cı ayəsində bəhs olunan hissələrə ayrılmış ölü quşalrın Hz. İbrahimin çağırmasıyla dirilmələrini qəbul etməmişdir. Misir modernist təfsir məktəbinə mənsub olan Məhəmməd Əbu Zeyd də *"Davuda dağları ve quşalrı boyun əydirdik, onunla birlikdə təsbeh edirdilər"*[293] ayəsindəki *"təsbeh edirdilər"* ifadəsini, müharibədə istifadə etdiyi silahları dağ-

293 Ənbiya, 21/79.

da yerləşən mədənlərdəki yataqlardan düzəldən Hz. Davuda bu mədənlərin göstərilməsi kimi təvil etmişdir.

Bundan başqa klassik modernistlər Qurandakı siyasət, hüquq, iqtisadiyyat və s. kimi insan həyatı ilə bağlı olan əmr və qadağaları və bu qadağalara əməl etməyənlər barəsində müəyyən edilən cəzaları ya ilahi tövsiyələr kimi, ya da tarixi bir hadisə kimi izah etməyə çalışmışlar.

**2. Çağdaş modernist təfsir**

Bu təfsir növünün ilk nümayəndəsi pakistanlı alim Fazlur Rəhamandır. Onun əsas məqsədi, İslamın əsəs təməlləri olan Quran və onun praktiki izahı olan sünnəni yenidən şərh edərək onu həyatın içərisinə daxil etməkdir. Ona görə Quran tarixi bir mətndir. Tarixi şərtlər dəyişdikdə Qurandakı hökmlərdə fərqli şəkildə təfsir edilə bilər.

O, Quranı anlama mövzusunda yeni bir metod ortaya atmışdır. Bu metoda görə biz Quranı anlamaq üçün öncə onun nazil olduğu dövrə getməli, ayələri o dövrün şərtləri çərçivəsində dəyərləndirməli, sonra isə günümüzə geri dönərək onun şərtləri çərçivəsində Quranı yenidən təfsir etməliyik.

Çağdaş modernizmin bir digər nümayəndəsi də milliyətcə fransız olan Rocer Qarodidir. O da Fazlur Rəhman kimi Quranın tarixi bir mətn olduğunu söyləmişdir. Onlara görə Quranı yaşadığımız əsrdə nazil olduğu kimi deyil, ilahi qanunun məqsədləri çərçivəsində onun prinsiplərini təsbit edərək ona görə şərh etməliyik.

Quran müəyyən bir vaxtda və müəyyən şəraitdə nazil olduğu və bəzi nəsslər də müxtəlif səbəblərə görə endirildiyi üçün onun müəyyən bir dövrün izlərini daşıması labüddür. Ancaq buradan yola çıxaraq Quranın tamamilə tarixi bir mətn olduğunu iddia etmək

doğru deyildir. Çünki Quran nazil olmadan əvvəl Lövhi-Məhfuzda bir bütün kimi vardı. *"Xeyr! Quran onların iddia etdikləri kimi bəşər sözü deyildir. O, Lövhi-Məhfuzda olan çox şərəfli bir Qurandır"*[294] ayəsi də bunu göstərir. Ona bir tarixi mətn kimi baxsaq o zaman onun çox hissəsini təşkil edən beynəlmiləl nəssləri, az miqdarda olan məhəlli nəsslərə fəda etmiş olarıq ki, bu da Qurana haqsızlqdan başqa bir şey deyildir.

**G. Əhkam təfsirləri**

*"İbadət, müamilələr və cəzalarla əlaqəli olan ayələri izah edib onlardan hökm çıxarmağa çalışan təfsir metoduna əhkam təfsiri deyilir"*. Əhkam təfsirinin əsas mövzusu adından da göründüyü kimi əhkam ayələridir. Ancaq bu təfsir sahəsində fikir irəli sürən İslam alimləri Qurandakı əhkam ayələrinin sayı haqqında müxtəlif rəqəmlər söyləmişlər. Qəzzali və Raziyə görə Quranda belə ayələrin sayı 500-dür. Bəzi alimlər isə bu ayələrin sayını 800-ə çıxarmış, bəziləri isə əksinə onları 200-ə qədər azaltmışdır. Bu ayələrin sayı barədə belə müxtəlif rəqəmlərin söylənilməsinin əsas səbəbi, bu ayələrin bir hissəsində hökmlərə açıq şəkildə, bir hissəsində isə -qissə və əmsal kimi – dolaylı olaraq yer verilməsidir. Əhkam ayələri iki yerə bölünür:

1. İçərisində əhkamın olduğu açıq şəkildə ifadə edilən ayələr. (Bəqərə, Nisə, Maidə, Ənam surələrində bu növ ayələr çoxdur).

2. Birbaşa hökm ifadə etməyən, ancaq istinbat (hökm çıxarma) yolu ilə hökm çıxarılan ayələr. Bunlar da öz aralarında, başqa bir ayəyə müraciət etməyə ehtiyac olmadan hökm çıxarıla bilən ayələr və başqa bir və ya bir neçə ayənin köməyi ilə hökm çıxarılanlar olmaqla iki yerə ayrılırlar.

294 Buruc, 85/21-22.

Rəsulullah (s.ə.s.) həyatda ikən müsəlmanlar hər mövzuda olduğu kimi əhkam mövzularında da bilmədikləri şeyi ondan soruşurdular. Ancaq Hz. Peyğəmbərin vəfatından sonra meydana çıxan yeni hadisılər qarşısında səhabilər öz ictihadlarına yer verməyə başladılar. Tabeun dövründə daha da sürətlənən əhkam təfsiri hərəkatı hicri II əsrdə bir təfsir məktəbi kimi formalaşdı. Müqatil b. Süleymanın (vəfatı-150-767) təfsiri ilk əhkam təfsiri hesab olunur. Bu sahədə şöhrət tapmış müfəssirlər və bu müfəssirlərin əsərləri aşağıdakılardır:

1. əş-Şafii (vəfatı-204/819), *Əhkamul-Quran*.
2. ət-Tahavi (vəfatı-321/933), *Əhkamul-Quran*.
3. əl-Cəssas (vəfatı-370/980), *Əhkamul-Quran*.
4. Əbu Bəkr İbn Ərəbi (vəfatı-543/1148), *Əhkamul-Quran*.
5. əl-Qurtubi (vəfatı-671/1272), *əl-Cami li əhkamil-Quran*.

**H. Fəlsəfi təfsir**

Müsəlman filosoflar Qurani-kərimi başdan-sona qədər təfsir etməmişlər. Ancaq onlar Qurandaki bəzi ifadə və kəlmələr haqqında fikir yürütmüşlər. Quranı təfsir edən filosoflara misal olaraq İbn Sina (vəfatı-1037), Fərabi (vəfatı-950) kimi filosofları və "*İxvanus-Səfa*" cərəyanına mənsub alimləri göstərə bilərik.

Filosofların vəhyə və peyğəmbərliyə baxışı fərqli olduğu üçün onlar Quranı təfsir edərkən daha müstəqil hərəkət etmişlər. Məsələn, İbn Sina vəhyi Hz. Peyğəmbərin Cəbrayılla danışması kimi izah etmir. Ona görə vəhy insanlara verilən "*sezgi qüvvəsidir*". O, Quranın rəmzlərdən ibarət olduğunu və bu rəmzləri də ancaq özü kimi xəvass alimlərinin[295] anlayacağını söyləmişdir.

295 Dərin elm sahibləri

İbn Sinaya görə Qurandakı "*ərş*" kəlməsindən məqsəd doqquzuncu fələkdir. Həmçinin o, "cənnət"i və "sirad körpüsü"nü fəlsəfi tərzdə izah etmişdir. Ona görə əqli aləm cənnət, xəyal aləmi isə cəhənnəmdir. Duyğu aləmi isə qəbir həyatıdır. İbn Sina cin ifadəsini gizlənmək, ins kəməsini isə yaxınlaşmaq deyə təvil etmişdir.

Verdiyimiz bu misallardan aydın olur ki, filosoflar ayələri daha çox batini şəkildə təvil etmişlər. Onların bu metodu digər İslam alimlərinin tətbiq etdikləri metodlardan çox fərqlidir.

## V. QURANIN ANLAŞILMASI VƏ TƏFSİR OLUNMASI

### A. Anlama

Anlamaq əslində çox geniş bir məfhumdur. Üz hərəkətlərinin, göz-qaş və əl-qol hərəkətlərinin də anlama ilə əlaqəsi vardır. Mövzumuz Quranın anlaşılması olduğu üçün burada anlama məsələsi dil baxımdan ələ alınacaqdır. Anlamada dörd əsas ünsür vardır:

1. Anladan/Danışan/Yazan
2. Anlayan/Dinləyən/Oxuyan
3. Anladılan/Danışılan/Yazılan
4. Anlama

Yuxarıdakı maddələri Quranı anlamağa tətbiq etdikdə belə bir mənzərə qarşımıza çıxır:

1. Allah (Anladan)
2. İnsan (Anlayan)
3. Quran (Anladılan)
4. Anlama

Buradan belə nəticə çıxara bilərik ki, anlama, hər hansı bir sözlə, yazı ilə, kitabla üz-üzə gələn insanın zehnində meydana gələn bir şeydir. Yəni anlamanın ortaya çıxdığı yer insan zehni və şüurudur. Anlamanın ortaya çıxması üçün yuxarıdakı ünsürlərlə yanaşı digər bəzi ünsürlər də vardır ki, bunlar aşağıdakılardır:

**1. Anlamanın şərtləri**

**a. Müştərək dil**

Bir sözün və ya mətnin anlaçılması üçün o sözün və ya mətnin sahibi ilə onu dinləyən və oxuyanın ortaq dilə sahib olması lazımdır. Müştərək dil deyildikdə ərəb, türk, ingilis, fransız və ya başqa hər hansı bir dil nəzərdə tutulmur. Müştərək dil deyildikdə həm danışılan dilin eyni olması, həm də danışanın dinləyənin marağını, ehtiyaclarını, elmi səviyyəsini və təcrübələrini nəzərə alması qəsd olunur.

Quranı anlamaq üçün də ilk dövrdə yaşayan müsəlmanların danışdığı ərəb dilini, onların mədəniyyətini, adət-ənənələrini, həyat tərzini və s. bilmək lazımdır.

**b. Sözün söyləndiyi mühit**

Bir sözün və ya mətnin anlaşılması üçün sözün söyləndiyi yer, zaman, sözün söyləndiyi insanların psixoloji, zehni, əxlaqi, dini, iqtisadi, siyasi, sosial və digər vəziyyətlərini bilmək vacibdir.

**c. Sözün söylənməsini zəruri edən səbəb və sözün məqsədi**

Danışan bir səbəbə görə danışır. Yəni sözün söylənmə və yazılmasının insanda daxili və xarici səbəbləri vardır. İnsanlar bəzən rahatlamaq üçün bir şey söylər və ya yazar. Bəzən başqalarının ehtiyaclarına cavab olsun deyə danışar. Bəzən isə digər insanları xəbərdar etmək, onlara öyüd-nəsihət vermək, bəzən onlara olan sevgisini dilə gətirmək, hirsini boşaltmaq üçün və yaxud da digərlərini

aldatmaq üçün danışar. Sözün qısası sözlər, insanın içindəki və ya xaricindəki səbəblər nəticəsində ortaya çıxır. Yəni insan danışarkən onun bir məqsədi olur. Məhz səbəblər məqsədi anlamada bizə yardım edir.

Allah-təala ayələri müəyyən məqsədləri həyata keçirmək üçün endirmişdir. Məqsəd insanlara dünya və axirətdə xoşbəxt olmanın yollarını göstərməkdir. Buna görə də Quranı anlayarkən ayələrin enmə səbəbini bilmək və mətnlə tarix və cəmiyyət arasındakı əlaqə çərçivəsində Allahın məqsədlərini bilmək zəruridir.

**2. Anlamanın mərhələləri**

**a. Mətni hərfi/ləfzi mənada anlamaq**

Bir mətn hansı dildədirsə əvvəlcə o dilin xüsusiyyətlərinə və qaydalarına görə başa düşülməlidir. Bu da mətnin dil baxımından təhlil olunmasını lüzumlu edir. Mətn tarixin müəyyən bir dövründə ortaya çıxmışsa, onun başa düşülməsi üçün dilin tarixi inkişafı tədqiq olunmalıdır. Çünki dil, daim dəyişir. Buna görə də Quranı anlamaq üçün onun nazil olduğu dövrdəki Hicaz bölgəsinin ərəbcəsini müxtəlif yönləri ilə araşdırmağa ehtiyac vardır.

**b. Mətn sahibinin məqsədini anlamaq/mətni təfsir etmək**

Səhabilər Quranın məqsədlərini daha rahat anlaya bilirdilər. Onlar vəhyin nüzulunun birbaşa şahidi idilər. Lakin sonrakılar Allahın məqsədini anlayarkən

1) elmi, tarixi araşdırmalar apararaq Quranın nazil olduğu dövrün şəraitini öyrənəcəklər

2) tarixdən günümüzə qədər olan bəşər tarixini və İslam toplumunun tarixi mərhələlərinə nəzər salacaqlar.

3) Yaşadıqları mühitin şərtlərini gözəl şəkildə təhlil edib Quranın onlar üçün olan aktual dəyərini təsbit edəcəklər.

**B. Quranın anlaşılması metodu**

Quranın anlaşılması və təfsir edilməsində metod məsələsi tarixdə və günümüzdə müsəlman alimlərinin böyük əmək sərf etdikləri bir məsələdir. Quranın təfsir olunması üçün metod çalışmaları müxtəlif cərəyanların ortaya çıxmasına səbəb olmuş və olmaqdadır.

İslami elmlər arasında metod məsələsi ən sistemli şəkildə fiqh üsulu tərəfindən ələ alınmışdır. Fiqh üsulu ilə yanaşı digər elmlər də metod ortaya qoymağa çalışmışlar. Məsələn bir mütəkəllim Quranı təfsir edərkən yazılı olmasa belə məsələyə müəyyən bir metod çərçivəsində yanaşmışdır. Müfəssirlər də Quranı təfsir edərkən müəyyən metodlara sadiq qalmışlar. Onların bir çoxu təfsirlərinin müqəddimələrində bağlı olduqları metod haqqında məlumat vermişlər. Aşağıda Quranı təfsir edərkən istifadə oluna biləcək bəzi qaydalara yer verilir.

**1. Quranı anlama və təfsir etmədə üç əsas sahə**

**a. Quran mətninin nazil olduğu tarixi sahə**

Bu sahədəki araşdırmalar üç istiqamətdə aparıla bilər:

**1) Quranın nazil olmasından əvvəlki dövrün tədqiqi**

Quranın bir çox yerində əvvəlki peyğəmbərlərin və toplumların qissələrindən bəhs olunur. Quran keçmiş cəmiyyətlərin başına gələn hadisələrdən bəhs edərkən onların yaşadıqları bölgələrin hələ də gözlər önündə olduğunu bildirir. Keçmiş cəmiyyətlərin mədəniyyət qalıqları sonrakı nəsillərin ibrət almaları üçün böyük əhəmiyyət kəsb edir. Lakin Quran bu mövzuları geniş şəkildə ələ

almır. Buna görə də həmin mövzuların dərin şəkildə araşdırılmasına ehtiyac vardır.

Hicr, Əhqaf, Eykə, Mədyən kimi yer adlarının, Səmud, Ad kimi qövmlərin yurdlarının araşdırılması, onların mədəniyyətləri haqqında məlumat sahibi olmaq, Quranı anlamaq üçün çox mühümdür. Bunları bilmək Allahın yer üzünə müdaxiləsinin səbəblərini daha da yaxşı anlamamıza kömək edər.

Quranın nüzulundan əvvəlki dövrü araşdırarkən diqqət edəcəyimiz əsas şeylərdən biri də onun nüzulu ərəfəsindəki Ərəbistan yarımadası ilə dünyanın digər bölgələrindəki ümumi vəziyyət haqqında məlumat əldə etməkdir.

Təfsirçi eyni zamanda ərəblərin mədəniyyətini, onların sosial, siyasi və iqtisadi nizamını, etiqadlarını, dini həyatlarını, ədəbiyyatını, şerini və s. bilməlidir.

Bunları öyrənən araşdırmacı Quranın necə bir cəmiyyətə nazil olduğunu biləcək və onun nüzul qayəsini, Allahın muradını, məqsədini daha yaxşı anlama imkanına sahib olacaqdır. O, bu yolla Allahın cəmiyyətə necə müdaxilə etdiyini, onu necə istiqamətləndirdiyini qavrayacaq, vəhyin cəmiyyətdə hansı dəyişikliklərə səbəb olduğunu biləcəkdir.

Sadəcə Ərəbistan yarımadası haqqında məlumat sahibi olmaq da kifayət deyildir. Mühüm ticarət mərkəzi olan Məkkə ilə qonşu ölkələr arasındakı ticarət əlaqələrinin meydana çıxardığı nəticələri təhlil etmək üçün həmin ölkələr haqqında da bilgimiz olmalıdır. Bundan başqa Quran nazil olmadan əvvəl dünyanın digər bölgələrindəki mədəniyyətlərin, millətlərin, dini, əxlaqi, sosial, siyasi, iqtisadi vəziyyətlərini bilmək də vacibdir. Bu da bizə Quranın nazil olduğu cəmiyyətlə digər cəmiyyətləri müqayisə etmə və Qu-

ranın nə üçün Ərəbistan yarımadsında nazil olduğunu öyrənməyə imkan verəcəkdir.

**2) Quranın nazil olduğu dövrün tədqiqi**

Quranı təfsir edərkən, nüzul dövründə Ərəbistan yarımadasında baş verən hadisələri, ərəb cəmiyyətindəki prosesləri və o cəmiyyətin ehtiyaclarını, Ərəbistan yarımadasındakı siyasi, iqtisadi, dini və əxlaqi vəziyyəti bilmək son dərəcə vacibdir. Çünki vəhy məhz bu dövrdə gəlmişdir və cəmiyyətdə köklü dəyişikliklər bu dövrdə baş vermişdir. Allah təala ayələri bu cəmiyyətdəki proseslərə paralel olaraq endirmişdir. Bu dövrün dərindən incələnməsi Quranın təfsirində üzümüzə yeni qapılar açacaqdır.

Ayələrin nüzul səbəbini bilmənin Quranın açıqlanmasında böyük rolu olduğunu bilirik. Məsələn, Bəqərə surəsinin 189-cu ayəsində belə buyurulur:

*“(Ya Rəsulum!) Yeni doğan aylar (hilal) barəsində səndən sual edildikdə, söylə ki, bunlar insanların istifadəsi və həcc üçün vaxt ölçüləridir. Evlərinizə (Cahiliyyət dövründə olduğu kimi) arxa tərəfdən girməniz yaxşı iş deyildir. Yaxşı iş (pis əməllərdən) çəkinən kimsənin əməlidir. Evlərə qapılarından daxil olun və Allahdan qorxun ki, nicat tapasınız!”*

Mənbələrdə bildirilir ki, cahiliyyə dövründə və İslamın ilk illərində kim həcc və ya ümrə üçün ehram geyərdisə evinə qapısından girməzdi. Şəhərdə oturanlar isə evlərinin arxasından deşik açar və ordan evlərinə girərdilər. Ehramlarını çıxarana qədər qapıdan girməzdilər. Bəqərə surəsinin 189-cu ayəsində bu davranışın yaxşılıqla, əxlaqlı olmaqla bir əlaqəsinin olmadığı bildirilir və bundan vaz keçilməsi istənilir.

Nəticə olaraq deyə bilərik ki, Quranın nazil olduğu dövr ərəb cəmiyyətini və ondakı dəyişiklikləri bilmənin, Quranın daha doğru anlaşılmasına və təfsir olunmasına böyük faydası olacaqdır.

**3) Quranın nüzulundan sonrakı dövrün tədqiqi**

Bu dövr iki istiqamətdə ələ alınmalıdır. Birincisi, İslam dininin və mədəniyyətinin müxtəlif yönlərini tədqiq etmək, ikincisi isə digər din və mədəniyyətlərin, onların İslam mədəniyyətinə təsirlərinin araşdırmaq.

İslam mədəniyyəti içərisndə meydana gələrək inkişaf edən elmlərin, müxtəlif dini fikirlərin incələnməsi Quranı başa düşmədə böyük əhəmiyyət kəsb edir. Quran elmləri, Quran tarixi, təfsir tarixi, hədis tənqidiçiliyi, kəlam, fəlsəfə, fiqh, məzhəblər tarixi, dinlər tarixi sahələrində günümüzdə də yeni araşdırmalara ehtiyac vardır. Bu dövr nə qədər yaxşı incələnərsə, Quran da bir o qədər doğru təfsir olunar.

Yuxarda bu dövrün iki istiqamətdə ələ alınmasının lazım olduğunu qeyd etdik və birinci istiqaməti qısa şəkildə açıqladıq. İkinci istiqamətə gəlincə, burada görüləcək iş, digər din və mədəniyyətlər və onların İslamla əlaqələrinin tədqiq olunmasıdır. Quranı tədqiq edən hər bir insanın bu mövzularda ümumi də olsu məlumatı olmalıdır.

**b. Aktual sahə (Quran və müasir dövr)**

Quran universal bir kitab olduğu üçün tarixə müdaxilə edə bilir və ona istiqamət verir. Lakin bu müdaxilə və istiqamət onun aktual dəyərinin doğru təsbit edilməsinə və düzgün anlaşılmasına bağlıdır. Cəmiyyətlər dəyişkəndirlər. Günümüzdəki cəmiyyətlər, siyasi, sosial, iqtisadi, elmi, texniki, əxlaqi, fəlsəfi və s. cəhətlərdən keçmiş cəmiyyətlərdən çox fərqlidirlər. Buna görə də beynəlmiləl ki-

tab olan Quranın günümüzdəki cəmiyyətlərlə əlaqəsini sürdürmək üçün, onu günümüzün şərtləri çərçivəsində yenidən ələ açıqlamalıyıq. Ancaq bu əlaqənin doğru və düzgün tənzimlənməsi elmi və zehni səviyyəyə bağlıdır.

Bundan başqa keçmişdə o dövrün elmi və zehni anlayışına görə təfsir olunan ayələr, günümüzün elmi və fikri anlayışlarına görə yenidən izah olunmalıdır. Quranın anlaşılması və açıqlanması üçün müasir elmin, texnikanın, iqtisadi, sosial, dini və s. anlayışların ciddi şəkildə tədqiq olunması lazımdır.

Bütün bu söylənənlərdən başa düşürük ki, Quran üzərində qrammatik təhlillərlə yanaşı, Quranın aid olduğu dövrü və ictiami sahəni araşdırmaq onun anlaşılması üçün son dərəcə əhəmiyyət daşıyır.

**c. Quran mətni üzərində lüğəvi və qrammatik tədiqiqatlar**

Quran ərəb dilində nazil olduğu üçün onun dil cəhətdən araşdırılması mütləq lazımdır. Quranı başa düşməyə, təfsir etməyə çalışan hər kəs onu lüğəvi yöndən incələmişdir.

Qurandakı bəzi kəlmələr Hz. Peyğəmbər tərəfindən açıqlanmışdır. Qeyri-ərəblərin İslam dinini qəbul etmələri ilə Quranın lüğəvi yöndən tədqiqi sahəsindəki araşdırmalar sürətlənmişdir.

**1) Kəlmə və ifadələrin etimoloji və semantik təhlili**

Kəlmələrin də öz dünyası var. Onlar, mədəniyyət içərisində inkişaf edir və dəyişikliklərə uğrayırlar. Quran nazil olduqdan sonra ərəb dünyası çox fərqli mədəniyyətlərlə qarşılaşmış və bunun nəticəsində də ictimai dəyişikliklər çox sürətlənmişdir. Bu da Qurandakı bəzi kəlmələrin məna dəyişikliyinə uğramasına səbəb olmuşdur. Bu məsələ sonralar lüğətlərdə və təfsir kitablarında ələ alınmışdır. Lakin sistemli şəkildə ələ alınmamışdır.

Bu sahədə yazılmış ən yaxşı və sistemli kitab Rağıb əl-İsfəhaninin "*əl-Müfrədat fi Ğəraibil-Quran*" adlı əsəridir. Bu əsərdə kəlmələrin Quranda keçdiyi yerlərə görə gəldiyi mənalarla bağlı məlumatlar verilmişdir.

Kəlmə və ifadələri əvvəlcə cümlə bütünlüyü içərisində anlamaq lazımdır. Bir ayə hər zaman sadəcə bir mövzu ilə bağlı olmasa da, bir mövzunun əhatəsi dairəsindədir. Bəzi kəlmələr Quranın müxtəlif yerlərində fərqli mənalara gələ bilir. Biz bu fərqlilikləri ayənin mövzusu və ya ayələr toplusu çərçivəsində təsbit edə bilirik. Məsələn, "din" kəlməsi belə kəlmələrdən biridir. Bu kəlmə bəzi ayələrdə "din", bəzi ayələrdə isə "cəza" mənalarına gəlir.

Bir kəlmənin ayə çərçivəsndə anlaşılmasına bu misalı verə bilərik: Bəqərə surəsinin 275-ci ayəsinin əvvəlində faiz yeyənlərin, qiyamət günü şeytan vurmuş şəkildə dirildiləcəkləridən bəhs olunur, ancaq ayənin davamında onların bu vəziyyətə düşmələrinin səbəbi üzərində durulur və Allah, ticarəti halal, faizi isə haram etdiyi halda, bu insanların ticarəti faizlə eyni tutduqları, bu ikisi arasında fərq qoymadıqları üçün şeytan vurmuş şəkildə dirildiləcəkləri bildirilir. Əgər biz bu ayənin davamını diqqətə almadan ilk hissəsini anlamağa çalışsaq, fərqli bir nəticə əldə edərdik.

Bir kəlmənin ayələr toplusu çərçivəsində anlaşılmasına misal olaraq isə Şüəra surəsinin 19-cu ayəsində keçən və Fironun Hz. Musaya söylədiyi bu sözləri verə bilərik: "*Axırda elədiyini də elədin (bir qibtini vurub öldürdün). Sən nankorun birisən*!." O, bu sözlərlə Hz. Musanın bir misirlini öldürməsini qəsd edir və " və əntə minəl kafirin" ifadəsi ilə Hz. Musanın nankor olduğunu dilə gətirir. Bu ayədən əvvəlki ayədə Firon, Hz. Musaya uşaqlıqda onu böyütdüyünü və uzun müddət yanında saxladığını deyir. Buna görə də buradakı "kafirin" kəlməsi "nankorluq edənlər" şəklində tərcümə edilmiş-

dir. Əslində bir çox yerdə "k-f-r" kökündən törəyən kəlmələr "inkar" mənasına gəlirlər.

**2) Ərəb dili və ədəbiyyatı cəhətdən Quran ifadələrinin təhlili**

Quran daha çox lüğəvi baxımdan incələnmişdir. Əslində Quranın ərəb ədəbiyytaının şahəsəri olduğunu düşündükdə, onun filoloji və ədəbi yöndən araşdırılmasının önəmi ortaya çıxır. Çünki Quranı başa düşmək üçün əvvəlcə onun mətninin təhlilinə ehtiyac vardır.

**C. Quranı anlamada və təfsir etmədə subyektivlik və onun səbəbləri**

Anlama və təfsir etmə fərdi fəaliyyətlərdir. İnsanlar bir davranışı, bir mətni doğru və ya yanlış anlaya bilərlər; hətta bəzən heç başa düşməyə də bilərlər. Sözün olduğu yerdə anlama və izah etmədə fərqliliklər meydana çıxar. Çünki hər kəs öz təcrübəsi, dünya görüşü və şüuruna görə anlayır və izah edir. Lakin tarix boyu İslam dünyasında Quranın izahında alimlərin həmfikir olduqları məsələlər çoxdur. İxtilaflı məsələlər onlara nisbətlə azdır. Deməli, anlama və izah etmədə obyektivliklə yanaşı bəzən subyektivlik də ortaya çıxır. Quranın izahında da bəzən subyektivliyin şahidi oluruq ki, bunun bəzi səbəbləri vardır:

**1. Quran mətninin subyektiv məna və izahlara səbəb olması**

Hər şeydən əvvəl bilməliyik ki, ədəbi, dini və fəlsəfi mətnlər subyektiv mənaların verilməsinə meyilli mətnlərdir. Quran da dini mətn olduğu üçün onu da fərqli şəkillərdə mənalandırmaq mümkündür. Quran özü bəzi ayələrinin mütəşabeh olduğunu, bu ayələrin başa düşülməyəcəyini və ya çox çətin başa düşüləcəyini bildirir. Bu da Quranın bu cür ayələrinin hər kəs tərəfindən eyni şəkildə başa düşülməyəcəyini göstərir.

Quran mütəşabeh ayələrdə bəşəri və simvolik dildən istifadə edir. Bu üslüb müxtəlif izahlara imkan verir. Bundan başqa Quranda bəzi qeyb hadisələrindən bəhs olunur. İnsanlar bu hadisələrin şahidi olmadıqları üçün onlara fərqli şəkildə məna verə bilərlər.

Quranda nazil olduğu dövrün ərəb cəmiyyətinin fərdi və ictimai məsələlərinə dair cavablar, öyüd-nəsihətlər, əmrlər, qadağalar da oxuyucuların fərqli anlamalarına gətirib çıxardır.

Quran ərəb dilində nazil olsa da, o, bütün insanlara xitab edir. O elmi səviyyəsi ən aşağı olanlardan filosof və digər elm adamlarına qədər hər kəsə səslənir. Bundan başqa insanların xarakterləri, şüurları, ehtiyacları, zövqləri, zehinləri fərqli olduğu üçün Quran bu fərqlilikləri də nəzərə almışdır. Hər kəs öz nöqteyi-nəzəri ilə Quranda bir şey tapa bilər. Quranın bir elm və ya fəlsəfə kitabı kimi müəyyən bir kütləyə xitab etməməsi və bütün insanlara xitab edən, onları maraqlandıran bir kitab olması onun fərqli izah olunmasına aparıb çıxaran başqa bir səbəbdir.

**2. Subyektivliyin oxuyucudan qaynaqlanması**

**a. Məzhəbi fərqliliklər**

Quran təfsirində subyektivliyə yol açan səbəblərdən biri də məzhəb fərqlilikləridir. Tarixdə siyasi, iqtisadi, mədəni və sosial dəyişikliklər İslam cəmiyyətində fərqliliklərin ortaya çıxmasına səbəb olmuşdur. Məzhəblər öz etiqadlarının doğruluğunu göstərmək üçün Qurana müraciət etmişlər. Çünki Quran, müsəlmanların ən güclü qaynağı idi. Ona görə də hər məzhəbin alimi ondan dəstək axtarırdı. Bütün məzhəblər öz görüşlərini Qurana təsdiq etdirmək isəmişlər. Buna görə də deyə bilərik ki, Quranın izahında subyektivliyə yol açan əsas səbəblərdən bir məzhəbçilik olmuşdur.

**b. Elmi səviyyədəki fərqlilik**

İnsanlar hər hansı bir hadisəni, sözü və ya mətni öz elmi səviyyələrinə görə qiymətləndirir və ya izah edirlər. Hər kəsin elmi səviyyəsi eyni deyildir. Hər fərd fəqli mühitdə yetişir.

Quran müəyyən bir dövrdə nazil olduğu üçün sonrakı insanlar onu anlamaq üçün elmi araşdırmalar aparmaq məcburiyyətindədirlər. Tarixdə müfəssirlər, kəlamçılar, filosoflar hər zaman Quranı öz elmi səviyyələrinə görə anlamışlar. Günümüzdə də Quranı anlama və izah etmədə, elmi səviyyədəki fərqliliklər müxtəlif anlayış tərzlərinin doğmasına səbəb olur. Bu məsələdəki subyektivliyi ortadan qaldırmaq üçün elm və fikir adamları elmi və fikri araşdırmalarını daha yüksək səviyyəyə çıxarmalıdırlar.

**c. Dünya görüşü fərqi**

Dünya görüşü fərqi deyildikdə insanların fərqli cəmiyyətlərdə, mühitlərdə, mədəniyyətlərdə və əsrlərdə yaşamaları və yetişmələri nəzərdə tutulur. İnsanların dünya görüşü dəyişdikcə onların əşyaya, hadisələrə baxışları da dəyişir. Bu dəyişiklik iqlim şərtlərindən və coğrafi xüsusiyyətlərdən başlayaraq elmi, fəlsəfi və texniki fəaliyyətlərə qədər bir çox faktorun təsiri ilə baş verir. İnsanlar əkinçiliyin inkişaf etdiyi cəmiyyətlərdə yaşayırlarsa onların dünya görüşü də bu cəmiyyətin şərtlərinə görə formalaşır. Modern dövrdə yaşayan insanların dünya görüşü isə fərqli olur. Qısaca desək dünya görüşümüz fərqliləşdikcə Qurana məna verməmiz də fərqli olacaqdır.

## MÜNDƏRİCAT